**Redaktor:** **German**

**Korrektor:** **Lalə Asəfqızı,**
**Arzu Əliyeva**

**Məsləhətçilər:** **Yusifəli Misirxanov,**
**Valeh Səyyafoğlu**

**Sarıgül Paşaqızı Yağmur «Duyğu kahkəşanı».**
**Bakı, «MBM», 2016, 336 səh.**

*İnsan müəyyən zaman və məkanda dünyaya gəlir. Bu onun qismətidir. Sarıgül Paşaqızı Əliyeva Qubadlı rayonunun Boynəkər kəndində dünyaya göz açıb. N.Tusi adına Azərbaycan Dövlət Pedaqoji İnsttutunu bitirib. O, öz tale və qismət payı ilə razılaşaraq tələbəykən ailə qurduğu Asəf Əliyevin həkim işlədiyi Naftalan şəhərinə təyinat alır.*

*Yeni mühitə və şəraitə uyğunlaşaraq daxili potensialı və mənəvi aləmi nəticəsində həmin şəhərdə 20 il fasiləsiz olaraq təhsil şöbə müdiri işləyib. İşlədiyi illərdə də bədii yaradıcılığı respublikanın mətbuatında dərc olunub. Uzun illər vətəndən uzaqda olsa da doğulduğu torpağa həsrət onun həyatın leytmotivi olub. Odur ki, duyğu və düşüncələrini bədii inikasına bağlanıb. Bu baxımdan Ulu Tanrının ona bəxş etdiyi tale payına sığınaraq çətin, lakin şərəfli həyat yolu keçib.*

*Bu kitab Sarıgül Paşaqızı Yağmurun üçüncü kitabıdır. «Duyğu kahkəşanı» kitabında şairənin Vətənə, torpağa, dəyərli insanlara məhəbbəti öz əksini tapmışdır.*

*Kitabın «Dünya» TV-nin «Bu sabah» verilişində möhtəşəm şəkildə təqdimatı keçirilib (17.11.2016-cı il).*

ISBN 978-9952-29-125-4

## Heydər baba – UIu öndər

Əbədi yaşarsan tariximizdə,
Dərin iz buraxdın sən qəlbimizdə.
Çünki əməyin var hər birimizdə,
Sənsən bu dövlətin babası yenə,
Qarşında baş əyəcəyik biz dönə-dönə.

Dünyada qorudun sən böyük Vətən adını,
Əsil vətəndaş yetirdin sən öz doğma övladını,
Vicdanla yandırdın sən Vətənə eşq odunu.
Daim uca tutdun sən vətənin övladını,
Yerin cənnət olsun deyərik sənə,
Qarşında baş əyəcəyik biz dönə-dönə.

Gəlişinlə düzən tapdı çünki bu doğma vətən,
Sən oldun xalqına daima ümid, güvən,
Vətən darda qalanda sən oldun köməyə yetən,
Ulu bir sərkərdə, Ulu bir öndər,
Sənin xidmətini unutmaz Vətən!

Zatı-aliləri Ulusan öndər,
Adın, soyun müqəddəsdən verir xəbər.
Əli cəngavərdi, izzəti Heydər,
Məhvə gedən xalqa xilasgar oldun,
Sönən ümidlərə sən dayaq oldun.

İndi dünya şöhrətlidir doğma Azərbaycanımız,
Həm də içdən qorunur həm dinimiz, imanımız,
Vətəni qorumağ üçün tökülür şəhid qanımız.
Vətən müqəddəsdir, bax ona qurban canımız,
Səninlə qurur duyur doğma Azərbaycanımız!

## Mir Məhəmmədin əziz xatirəsinə

Miri, sənin müsibətin yandırır məni.
Salır sankı oda-közə alovlandırır məni.

Bir igiddin el içində qoçaqdan qoçaq,
Sən tuturdun xalq adını ucadan-uca.
Sənə qıyan namərd duşsun canından qaçaq,
Nakam oglan müsibətin yandırır məni,
Salır sanki oda-közə alovlandırır məni.

Danışıram, odlanıram, danışmıram, yanıram,
Əzizlərinin kədərin öz kədərim sanıram,
Sənin şöhrətli adını hər dəqiqə anıram.
Elə bil bu xatirə də yandırır məni,
Bu fəlakət, bu müsibət alovlandırır məni.

Sən xalqına çətin yoldan körpü saldırdın,
"Aşıq-yaxşı məhəbbətin göyə qaldırdın,
Şeirlərinlə qəlbimizi işıqlandırdın.
Sönməz odun ürəklərdə yandırar bizi.
Müqəddəs adın yolunda alovlandırar bizi.

Oglanların çöhrəsinə qonubdu kədər,
Bacıların fəqan edib üz-gözün didər,
Cavan həyat yoldaşınsa ah-nalə cəkər.
Heyif loğman müsibətin yandırır məni,
Salıb sankı oda-közə alovlandırır məni.

Əkiz qızlar qəm içində durur göz-gözə,
Göz yasları tuğyan edib tökülər üzə,
Salehə də dözə bilmir əl atır üzə,
Heyif cavan bu mənzərə yandırır məni,
Salır dağa-daşa, inan alovlandırır məni.

Baba, dayı dözə bilmir bu fəlakətə,
Onun odlanmağı məni saldı dəhşətə,
Əmi, bacı balaları düşüb minnətə.
Getmə cavan, getmə bu hal yandırır bizi,
Salıb sönməz alovlara alovlandırır bizi.

Uzaq-yaxın dost-tanışlar səf-səf durubdu,
Qəlblərində qüssə-kədər yuva qurubdu,
Qonaqların qan-yaş tökur məhlə sənsiz durubdu.
Bu sonsuzluq, bu sənsizlik yandırır bizi,
Səsin gəlmir bu sonsuz dərd alovlandırır bizi.

Sən elləri yetim qoydun müqəddəs, Miri!
Bu dərd başda tuğyan edər ürəkdir yeri,
Min-min canlar fəda gedər səndən ötəri.
Xalqının ümid Çıragı, bu dərd yandırır bizi,
Salır sönməz alovlara alovlandırır bizi.

Körpə məktəblilər gəlib verir səs-səsə,
Sən qıymazdın qəlb odlayan o cür nəfəsə,
Baharın gözəl çagında sönən həvəsə,
Ellər də ah-nalə edir yandırır bizi,
Yarımcıq yolların indi alovlandırır bizi.

Bu dərd sevdalı bülbülün qəlbini sökür,
Təbiət də qan ağlayır odlu yaş tökür.
Sənə şehli çiçəklərdən məbədlər tikir,
Həkim Miri, bu sonsuz dərd yandırır bizi.
Salır sönməz oda-kozə alovlandırır bizi.

Ağam sənə "qardaş" dedim, sən mənə "bacı",
İndi bacın fəqan edər yolaraq saçı.
Sarıgüldən ömrü boyu getməz bu acı,
Miri, sənin müsibətin yandırır məni,
Salar sönməz alovlara alovlandırır məni.

## Azərbaycan torpağı

Gəl bölməyək biz bu doğma diyarı,
Sənlə razı bu Qubadlı uşağı,
Hərdən coşar, qızışdırar ocağı,
Qədir bilməz olsa oğul-uşağı,
Tanıdaram duracağı-bucağı.

Bax belədir bu Vətənin torpağı,
İgidlər yetirər daşı, torpağı,
Pozulmasın hec bir zaman növrağı,
Yansın hər bir evdə odu-ocağı.

Çox doğmadı Vətənin hər bucağı,
Uludur, müqəddəsdr Hərtiz dağı,
Çün əzizdir hər külu, hər yarpağı
Daim yansın Suraxanı ocağı,
Bütöv olsun Azərbaycan torpağı.

Çünki doğmadır odu, həm ocağı,
Mehribandır sanki ana qucağı,
Söz dəryasıdır hər oğulu-uşağı,
Müqəddəsdir Azərbaycan torpağı,
Bütöv olsun Azərbaycan torpağı.

## Azərbaycanımız

Sevirik, fəxr edirik necə ki, sağdır canımız,
Çün odur doğma ana, doğma Azərbaycanımız.

Qoynudur cənnət onun doqquz iqlim qurşağı,
Biz onun övladıyıq, öncə Azərbaycanımız.

O bizim doğma məkan, həm canımız, cananımız,
Çün bizim fəxrimiz o, doğma Azərbaycanımız.

Gözəl elm adamları, güclü indmançılar,
Dünyanı valeh edir Azərbaycan oğulları.

Onlar bizə doğmadır, çün bizim insanımız,
Daha da qüclü olaq, vardır buna imkanımız.

Çün bizə doğma qucaq, doğma məkan odur ki, bax,
Dünyanın gözündədir doğma Vətən, doğma diyar.

Sarıgül vəsf eylə gəl, səninkidir, doğma Vətən,
Bu Vətən Azərbaycandır, böləməz yoldan ötən.

## Qubadlım

Könül bağlamışam o doğma elə,
Meylimi salmışam çiçəyə, gülə,
Çevrilmişəm gülə həsrət bülbülə,
Qəfilcə budaqdan uçar, Qubadlım.

Torpağın sinəsi barlı-bəhrəli,
Oğulları səxavətli, hünərli,
Fərq eyləməz - ya kəndli, ya şəhərli,
Hamıya süfrəsi açıq Qubadlım.

Sərinlik gətirir şamı, qovağı,
Hörmətlə qarşılar dostu, qonağı,
Asəflə olduğum çayın qırağı,
Ağlımı başımdan aldı, Qubadlım.

Həsrəti qəlbimdə gəzdirirəm mən,
Deyəsən sizləri bezdirirəm mən,
Küsürəm, bəzən də küsdürərəm mən,
Şübhəni qəlbimdən sildi Qubadlım.

Könlüm o torpağa yenə üz tutar,
Qorxuram ki, sevgimizi göz tutar,
Düşmənlər puç olsun, məni tez apar,
Ürəyimin parasısan, Qubadlım.

## Naftalanımız

Həyatı rəngli edən məsum insandan biriyəm,
Yaradana min şükür, mən yaradan əsəriyəm.
Nə desəm, nə söyləsəm, içdən gəlir, bunu bilin,
Çünki doğma ocağım möcüzəli Naftalandır.

Əsrlərdir şöhrəti heç düşməyir el dilindən,
Yaradana min şükür sehri onun çox dərindən.
İnsanlar çox ümidlə şəhərimizə gəlirlər,
Çünki Naftalanımı bir ana kimi görürlər.

Biz torpaqdan yaranmışıq, torpağa da dönəcəyik,
Zamanla hər bir şeyin sonunu da görəcəyik,
Amma dünya möcüzə, bax, onu da biləcəyik,
Naftalan möcüzəsin bir Allahdan bilirlər.

Yerlilər qonaqpərvər, gözü açılandan qonaqlı,
Hamıya istiqanlı, xoş sədalı, soraqlı,
Belə möcüzə yoxdur, gəzəsən əli çıraqlı.
Naftalan möcüzəsi Tanrıdandı bilirlər,
Odur ki, insanlar da Naftalanıma gəlirlər.

## Goranboy

Torpağı müqəddəs bilənlər gördüm,
Bir qarış uğrunda ölənlər gördüm,
Düşmənin izini silənlər gördüm,
Torpağın qorundu, doğma Goranboy.

Namusa, şərəfə silah tuşlandı,
Analar, bacılar ah çəkdi, yandı,
Bəzi nanəciblər vətəni dandı,
Axır xar oldular amma, Goronboy.

Biz haqqa əl açdıq, haqq dayaq oldu,
Vətən oğulları hey oyaq oldu,
Sənin adın üçün bir mayak oldu,
Yetişdin həmişə kama, Goranboy.

İnşallah, qayıdar əsir torpaqlar,
Yurdum bütövlənər olar gülüzar.
Səndən də nigaran olanlar da var,
Torpağın qorundu, doğma Goranboy,
Başın üstə açıq səma, Goranboy!

**Kəndimiz**

Balaca kənd idi bizim Boynəkər,
Hər məhlə arası qaratikan çəpər,
Qonşu qonşusuna etməzdi xətər,
Hərə öz evinin qayğısını çəkər,
Qonşu qonşusundan etməzdi qeybət,
Hamı bir birinə edərdi hörmət,
Hərə öz evinin ağası, qulu,
Hərənin bir miqdar yetərli pulu,
Gözü tox, könlü tox bizim camaat,
Beləcə illərlə keçərdi həyat.

Nə qumar, nə içki, nə düşkün həyat,
Xəyala gəlməzdi, inanın, heç vaxt,
Xeyir-şər olanda, bir də bayramda
Hamı görüşərdi bir ailə kimi,

Təbəssüm üzlərdə şəlalə kimi,
Axşamüstü sürü çöldən dönəndə,
Hamı evə dönərdi şad-xürrəm,
Beləcə keçərdi illərlə həyat.

Sonra birdən qarışdı dünyası Boynəkərin,
Çarxı döndü tərsinə, dağıldı Boynəkərin,
Erməni köpəkləri, bir də erməni sifət
Yerli, naqis köpəklər bu nizamı pozdular,
Yeni tarix yazdılar,
Məsum el-obamıza yeni qismət yazdılar.
Eşitmədiklərini indi eşitdi onlar,
Xəyala gəlməyəni, ağıla sığmayanı
İndi gördülər onlar.

Gördülər ki, yalan var bu yalançı dünyada,
Gördülər ki, varlı var, yoxsula salam vermir,
Yandan elə keçir ki guya heç onu görmür,
Vaxtı ilə bir çəpər ayırardı onları.
İndi nə olub görən hər biri öz evinin ağası olan elə,
Niyə yada düşməyir qonşusu - harda - deyə.

Heyif sənə kəndimiz, heyif ey kimsənələr.
Heyif sizə, min heyif, ey yaşmaqlı nənələr.
Heyif sizə, Göy düzüm, Heyif, ey Şirin bulaq,
İndi sizi görməkçün yeni xəyallar quraq.
Görən ora qayitsaq, nələri tapacayıq,
Gör nələr itirmişik, sayı yox, hesabı yox,
Onların mindən birin tapmaqçın, yaşamaqçın,
Nələri verməzdim ki, nələri deməzdim ki.
*31.10.2009*

## Boynəkər yolları

Boynəkər yolları cığırın olub,
Səninlə yan-yana qala biləydim.
Aşiqim səninlə keçib, gedəndə,
Uçan qaranquştək yola salaydım.

Sonra da dönəydim təkcə çinara,
Gedən yolculara kölgə salaydım.
Ordan qayıdanda Əyribucaqdan,
Buluda çevrilib kölgə salaydım.

O, çox yorulanda, gəzəndə bəzən,
Həzin duyğularla layla çalaydım.
Gözünü qaldırıb, mənə baxanda
Yaşamaq həvəsin ondan alaydım.

Dönəydim sonra da göy göyərçinə,
Hey onun üstüncə qanad çalaydım.
Harda dara düşsə, çətinə düşsə,
Tez olduğu yerə lələk salaydım.

O lələk yerimi ona gostərib,
Nağıl aləminə tez gətirəydi.
Mənim dualarım, saf duyğularım
Çətinliyi ondan tez götürəydi.

Sən məni həyata bağladığınçün,
Çox şeylər borcluyam, Asəfim sənə.
Dünyanın nağıllı, gözəl olduğun
Təkcə sən yaşatdın, sevgilim, mənə.
Boynəkər yolları, qınama məni,
Bir qərib yolçuyam mən səndə indi.
Yollar bağlı, sənə çata bilmirəm.

Amma könlüm quşu hər səhər-axşam
Orda cövlan edir, insaf et, dindir.

Söylə ki, bir könül yanıq-yaralı,
Anasın itirmiş qəlbi yaralı,
Artıq yuxularda səni axtarır,
Bir qərib görürəm hər səhər-axşam,
Anasın axtarır, əllərində şam.
Deyirəm, ay ana, sən gələydin kaş,
Durardım yollarda, inan, hər axşam.

Boynəkər yolları, yurdun yolları,
Qoy açılsın mənə ana qolları,
Sil-apar könlümdən sazağı-qarı,
Qoy açılsın mənə Vətən yolları,
Silinsin könlümdən həsrət qübarı.

Ay, Vətən yolları, yurdun yolları,
Qoy, açım mən sənə yorğun qolları.
Bəlkə göstərərsən düzgün yolları,
Doğru yolları, Vətənə sarı doğru yolları.
Ay, Vətən yolları, Vətən yolları,
Boynəkər yolları...

## Yadındadırmı

Ay Rəşid, de mənə bizim obaya
Baharın gəldiyi yadındadırmı?
Güllər açılanda, bülbül ötəndə
Çöl-çəmən güldüyü yadındadırmı?

Vardı gözəlliyi o vaxt kövşənin,
Könlü açılardı kəndə gələnin,

Əyribucaqdaki tər bənövşənin,
Boynu büküldüyü yadındadırmı?

Yazın duman-çəni verdikcə ara,
Laləyə-nərgizə bürünür ora,
Yarğanlıdan tutmuş Əyribucağa
Çiyələk tökdüyü yadındadırmı?

Salxım-salxım kollar üstə böyürtkən,
Dağların sinləsi pöhrə, qaratikan,
Qız-gəlin çiynində səhəng, su daşıyan
Yola düzüldüyü yadındadırmı?

At, ulaqnan çöldən otu daşıyardıq,
Kənddən çıxıb göy düzə dırmaşardıq,
Əlimizə düşəni evə daşıyardıq,
Mərövcə yığdığımız yadındadırmı?

Çərşənbədə damdan torba salardıq,
Həyətimizdə yekə tonqal qalardıq,
Qədir tutub, sübhə ayıq qalardıq,
Pay-püş böldüyümüz yadındadırmı?

Sarıgül deyər, kəndə gedərdik, qardaş,
Erməni alşağın yurdu itsin, kaş,
Bu arzumuz yerinə yetsin, a qardaş,
Analı evimiz yadındadırmı?

## Yadıma düşür

Mənim kiçik kəndim, a doğma diyar,
İndi gözü yolda qaldın intizar,
O gözəl qoynuna gələndə bahar,
Dağ-daş yaşıllaşıb, güləndə bahar,

Nə bir gələnim var, hal soranım var,
Beləcə dərdlərim yadıma düşür.

Yenə Novlu bulaq yerində axır,
Süleyman dərəsi, Yarğanlı baxır,
Nərgizlər, Topu dərəsi, Göydüz darıxır,
Əyri bucaq bənövşəsi yan baxır,
İndi səs eşitmir, nə yol, nə cığır,
Ot basan cığırlar yadıma düşür.

Laləli, nərgizli, çiçəkli yurdum,
Səndə uşaq ikən xəyallar qurdum,
Özümü odlara, közlərə vurdum,
Hər verdiyim sözün üstündə durdum,
Sənin bənövşənlə, gülünlə dolu,
Naftalan elində bir yuva qurdum,
Aman, aylar illər nə tez ötüşür,
O doğma torpaqlar yadıma düşür.

Ana laylasıyla uyumuşam mən,
Əlaqə kəsilib, yox gəlib, gedən.
İndi səni, söylə, soruşum kimdən,
Ay Topu dərəsi, Xınalı daşlar,
Yadıma düşdükcə düyülür qaşlar,
Artıq ağarıbdı, başımda saçlar,
Gəzdiyim otlaqlar yadıma düşür.

Kimə qaldı o pöhrəlik, biçənək,
Daha belimizi ağrıtmır səhəng,
Əl-ayaqda yoxdur artıq döyənək,
Bizə qonşu olan erməni köpək,
O viran otaqlar yadıma düşür.

Getsək nə taparıq, biz indən belə,
Müqəddəs torpaqlar dönübdür külə

Gör neçə illəri vermişik yelə,
ATƏT indiyədək tutubdur dilə,
Prezidentimiz verməz torpaq yad ələ,
Qoy mənfur erməni tutmasın dilə,
Biz daha gəlmərik bir daha felə,
Türk oğlu Türk verməz torpağı yad ələ,
Qələbəmiz düşsün qoy dildən-dilə,
Bax belə ovqatlar yadıma düşdür.
*04.10.2009*

## Özündən soruş

İçində uğraşma duyğularınla,
Rahat qoy ruhunu, sıxma qəlbini.
Havadan duyuruq bir-birimizi,
Bədbin notlar üzrə sıxma qəlbini.

Gəl, yaxın oturaq bax gözlərimə,
Şirin duyğu ilə ax gözlərimə,
Gözlərimdən soruş indi hardayam,
Gözlər yalan danışmaz ki, Gözəlim,
Sənsizlikdən üzgün, intizardayam.

Məni heç məndən də soruşma, Laləm,
Mən məndə deyiləm, səndəyəm artıq.
Sən məni özündən soruş, ay gülüm,
Bax, harda itirsəm səndə taparam,
Məni sən ünvanlı yerdə taparsan.

Məni xəyallardan soruşma, Laləm,
Xəyallar da hərdən dəyişkən olur.
Məni nağıllardan soruşma, gülüm,
Nağılın da sonu duman, çən olur,
Nağılın da çox vaxt sonu qəm olur.

Məni bağçalardan soruşma, Laləm,
Bülbülü susdursan, gülü xar olar.
Məni kainatdan soruşma, gülüm,
Göydə ulduzların yeri dar olar,
Mənim kədərimdə göylər qaralar.

Məni dənizlərdən soruşma, Laləm,
Dalğalar geriyə ləpələnərlər,
Məni dağlardan da soruşma, gülüm,
Sənə istəyimdən təpələnərlər.
Məni sən özündən soruş, ay Laləm,
Bax, onda nağılın sonu xoş olar,
Oxuyan oxucu qəlbdən şad olar.
Sarıgül Yağmur da bax yadda qalar.
Mənim çiçəyimsən, gülümsən, Laləm,
Bir ömür çağlayan selimsən, Laləm.

## Məni

Dərdli şeirlərimlə dərd açıram mən.
Qəlbimdi dərdlərin yurdu, məskəni,
Dərdlərin əlindən ha qaçıramsa,
Yenə də izlərlə dərd tapır məni.

Əlvida deyəcəm bu qayğılara,
Başqa bir dərd yükü tapacaq məni.
Naşükür deyiləm, dözərəm yenə
Allah qorxduğumdan qorusun məni.

Yolnan gedirdim bir yaşıl yarpaq
Ağlaya-ağlaya ciynimə düşdü,
Başımı qaldırıb göyə baxanda
Üstündə əsdiyim yadıma düşdü.

Dil deyə bilmədi ürək deyəni
Eşqin, məhəbbətin hökmünə baxın
Mən sevə bilmirəm məni sevəni
Mənim sevdiyimsə sevir özgəni.

Bilmədim mən səndən nə gözləyirdim?
Səndən nə çörəyim, nə duzum gəlmir.
Səni ürəyimə necə salmışdım,
İndi çıxarmağa ürəyim gəlmir.

## Səni

Gah ünvan paylaşdın, gah ünvan aldın,
Sən də qürürunu daşlara çaldın,
Həyatı səhnəylə dəyişik saldın,
Məhv etdi etdiyin o səhvlər səni.

Dumanlı, çənlidi həyat yolları,
Üşüdür yağışlar, boranlar səni.
Niyə ovundurmur, niyə isitmir,
O süni çıxışlar, alqışlar səni.

## Ayrılmayaq

Yollar haçalanır bölünmək üzrə,
Qalmayaq bu yolda çaş, ayrılmayaq.
Bu yolda gözümdən itmə amandır,
Hələ qaralmamış qaş ayrılmayaq.

Bəlkə də xoşbəxtsən başqa diləklə,
Məncə darıxıram kövrək ürəklə.
Sevgi bağımızda solar çiçək də,
Beləcə söylənib kaş ayrılmayaq.

Qaranlıq dünyamda yanan şamımsan,
Bu fani dünyada sən dayağımsan,
Gələcək günlərə sən mayağımsan,
Bərk tut əllərimdən buz ayrılmayaq.

Həsrət bir sınaqdır döz ürəyim döz,
Çoxdandır baxışmamış bu göz ilə göz,
Bütün sevənlərə qismət ola bu söz,
Biz ayrılmayaq kaş biz ayrılmayaq.

Üzdü məni bu naz, bu əda ey yar,
Suallı baxışı eylə nida yar,
Mənə bir doğma tək eylə vida yar.
Nəbadə gözündə yaş ayrılmayaq.

Qəlbimizi yenə bu həsrət deşir,
Bu ürək həsrətdən qovrulur, bişir,

Artıq qəlb evinə yenə qış düşür,
Ataq ayrılığa daş ayrılmayaq.
Sarıgül Yağmura atma daş ayrılmayaq.

**Qarşıma çıxma**

Bir zaman mənimçün gülən gözlərin,
Özgənin yolunu gözləyir indi.
Bir zaman dediyin yalan sözlərin,
İndi ayaq tutub yeriyir indi.

Düşdük bu sevdanın səhra yoluna,
Bir qurtum eşq suyu axtaraq deyə.
Yalan dolanların bax ucbatından,
Bir qurtum su belə qalxdı göylərə.

Saf-təmiz məhəbbət yoluna düşdük,
Bir azcıq eşq tozu axtaraq deyə.
Eşqin tozu nədi özü də qaçıb,
Yalanlar əlindən qaçıb göylərə.

Bu eşqin odunda yanmaq az imiş,
Ancaq tüstüsünə boğulduq artıq.
Dünyanın üzünü yalanlar almış,
Təmiz duyğu yoxdu dağılıb artıq.

Ayrıldıq, bölündük, dağıldıq tamam,
Belə getmək olmaz yığışaq gedək.
Qəlbimdə gizli bir yer saxlamışam,
Bəlkə gəl o yerə sığışaq gedək?

Nə olub gözlərin dörd olub sanki,
Qəti bir qərarı görmürəm daha.
Tərəddüd qoynuna dolubdur sənin,

Daha ümid yoxdur sənli sabaha,
Gəl bir də qarşıma çıxma sən daha.

Saysız cığırları bəzəyən naxış,
Sonuncu ümidin ləpirləridir,
Üstünü toz-torpaq örtən o daşlar,
Ölmüş arzuların qəbirləridir,
Bir daha o yolu axtarma daha.

**Dözdüm**

Gedən gedib artıq inanma dönə,
Qəlbimi dindirmə, o cətin dinə.
Kim ki, ayrılıqdan bəhs etdi mənə,
Köhnə yaralarım qanadı dözdüm.

Dünya ədalətsiz, balaca və dar,
Nə cür sifət desən bu dünyada var.
Taledən soruşdum kimdir günahkar?
O məni haqsızca qınadı dözdüm.

Həyat calaq edib ömrümə dərdi,
Qəlbimdə cücərən ümidi dərdi.
Amma ki, sabaha ümid də verdi,
Qəfil tərk edəndə sınadı dözdüm.

Hər zaman ümüdə söykənər ürək,
Gərək gələcəyə ümid bəsləyək,
Ayrılmaq gərəksə ayrılaq gərək,
O dedi, qəlbimsə sızladı dözdüm.

## Ola bilməz

Yüz peyvənd elə, yüz dəfə calaq,
Cır öz cırlığıyla cır qalacaqdır.
Alcağı ucaldıb dağ eləsən də,
Alcala, alcala düz olacaqdır.

Əsilli heç kəsə ziyan yetirməz,
Bədəsil peymanı başa catırmaz.
Zər qiymətin küllükdə də itirməz,
Zibil xəzinədən atılacaqdır.

Kim ki, sağ olaraq ancaq zarıyar,
Nə özünə, nə özgəyə yarıyar.
Gün dəyəntək buxarlanar, quruyar,
Sısqa bulaq gəlib Kür ola bilməz.

Gündə yüz yol kişmişi versən ulağa,
Yekələr, kökələr nər ola bilməz.
Hər yetən avara, hər ötən gədə,
İgid ola bilməz, ər ola bilməz.

## Sənsiz

Bu dostluğu qorumaqda dirəndim,
Sonu bilməz həsrətinə bələndim,
Zaman oldu dostluqda da ələndim.
Bu hal məni dəli edər ya etməz,
Səni sevməyimə bu təsir etməz.

Nə oldu gülüm, xəbər çıxmadı səndən?
Niyə dolanırsan bu qədər gendən?
Bəlkə də incidin mənim sözümdən
Qəlbim parə-parə olar bil sənsiz.
Mən səni sevirəm bir buna inan,
İçinə dolmasın heç yersiz güman.

## Baxdığın zaman

Saf idi könlümün arzu, niyyəti,
Sən isə duymadın bu səmimiyyəti,
Verdin Sarıgülə qəmi, möhnəti.
Mən səni köksümə sıxdığım zaman,
Arxandan həsrətlə baxdığın zaman.

Xəyalım göylərdə qanad çalırdı,
Sən mənim qarşıma çıxdığın zaman.
Nurlu baxışından nur aldı könlüm,
Həsrətlə gözümə baxdığın zaman.

Sənlə zirvələrə çıxmaq istədim,
Hər şeyə yenidən baxmaq istədim,
Mən sənin əlini sıxmaq istədim,
Sən mənim qəlbimi sıxdığın zaman.

## Ürəyim

Bir bağlı qapını aca bilməsən,
Zülmətlərə işıq caça bilməsən,
Zalimın əlindən qaça bilməsən,
Özündən yüksəyə uçma ürəyim.

Elə yaz sükutu dindirə bilsin,
Elə yaz körpəni güldürə bilsin,
Elə yaz düşməni öldürə bilsin,
Bax belə olmasa, yazma ürəyim.

Elə yaz doğma insanlar sevinsin
Elə yaz dostların qoy üzü gülsün,
Elə yaz ürəklər qoşa döyünsün,
Bax belə olmasa yazma, ürəyim.

Sarıgül xoşbəxtlik hamı üçün olsun,
Qoy istəklilərin sevincli olsun,
Sevincdən doğma tək gözlərim dolsun,
Belə olanda Sarıgül Yağmur tək olsun,
Xoşbəxtlikdən yaz ki, qəlblər şad olsun.

**Eyləmə**

Səni sevdiyim tək sən də sev məni,
Başqa birisini soraq eyləmə.
Qayğını bölməyə daim hazıram,
Sirrini heç məndən uzaq eyləmə,
Könlümü özünə dustaq eyləmə.

Duyan insanlara qurbandı canım,
Mənə dəyərlisən bunu nə danım?
Sənsən bu yaşımda könül mehmanım,
Başqa birisini soraq eyləmə,
Könlümü bu halda zindan eyləmə.

Sarıgüləm doğru yolum, izim var,
Hər zaman deməyə zəngin sözüm var,
Xalqımın içində ağ olan üzüm var.
Nadanlar, heç zaman böhtan eyləmə,
Könlümü böhtana qurban eyləmə.

Ürəyimdə mətinlik var, dözüm var,
Pərvanəyəm şamda yanan közüm var,
Hər kəsi vəsf edən şirin sözüm var.
Məni öz dünyamdan uzaq eyləmə,
Bu odlu qəlbimi sazaq eyləmə,
Özünü də məndən uzaq eyləmə.

## Gözlərin

Ötən günün kədərinə gülmürəm,
Yazı haqdır, taleyimdən silmirəm,
Necə baxıb doğrusunu bilmirəm,
Bəs günahı nəydi axı gözlərin.

O baxışlar qəlbə gələn həmlədir,
Qəlb ovunur, düşünmür ki qəm nədir,
Ayrılıqlar həsrət verir nəmlədir,
Heç günahı yoxdu axı gözlərin.

Bu gözlərin qəmi məni dəmlədi,
Bu qəm- kədər ürəklərə həmlədir,
Söylədim sənə bircə kəlmədir,
Bəs günahı nəydi axı gözlərin?

Gözəlliyə tənnə imiş, ac imiş,
Kələklərdən, yalanlardan qaçırmış?
Yalnışların ilməsini açırmış,
Heç günahı yoxmuş axı gözlərin.

## Bəlkə

Yoruldum yüklücə xatirələrdən,
Könlüm ayrı durmur inan dəftərdən.
Deyirlər yuxular bəzən çin olur,
Sən də yuxu kimi qonaq gəl hərdən.

Payiz düşən kimi ol, xəzəl ətri,
İnan qəribsədim ətirdən ötrü,
Gözüm qəribsəyib yuxudan ötrü,
Yuxular da qaçaq düşüblər məndən.

Ver sehrli xalça bir nağıl qurum,
Sonra uşaq kimi oyuncaq qurum,
Sonra evcik qurum, yığım, uçurum,
Sən də gülə-gülə mənə bax gendən.

Bəlkə də bir səhər heç oyanmayım,
Oyanıb yolunda heç dayanmayım,
Adını hər bir an heç də anmayım,
Sən məni xatırla, yada sal hərdən.

Bir ümid nağılı uyduraq sənlə,
Bir sevda yağışı yağdıraq sənlə,
Bəlkə dolanmayaq bu qədər sənlə?
Həyatın dolaşıq döngələrindən.

## Dərdlər tablosu

Ey rəssam fırçanı atma əlindən,
Sən öz rəsmini çək, mənsə dərdimi.
Ümidlə yaşayıb davam edərək,
Bəlkə də nə vaxtsa duya dərdimi.

Çəkməyi isdəsən ürək rəsmi çək,
Sonra da ürəyə tuşlanmır bir ox.
Həsrətdən alışan ürəyə dəysin,
Bəlkə qan yerinə axacaqdır od.

Sonra da çəkərsən dalğalı dəniz,
Amma çəkdiyimi çəkə bilmərsən.
Sən çəkə bilərsən göz yaşlarımı,
Onları dənizə tökə bilərsən.

Ey rəssam, çəkdiyim bu acıları
Çəkə bilərsənmi sən rəsmlərdə?

Mürəkkəb çatsa da bir ömür çatmaz,
Bu dərdi, acını çəkərkən insan
Bir insan ömrü də yetişməz inan.

## Ayrılmayaq

Gəl səni dünyama qonaq aparım
Gör sənli dünyada sənsizlik nədir.
Əgər gəlməyəssən haray qoparım
Gör sevgi anında mənsizlik nədir.

Sevginlə sevərək çıxaq yarışaq
Bu sevgi yolunda nəğmələr qoşaq
Coşqudan dəniz tək çağlayaq daşaq
Sevgilim, heç zaman biz ayrılmayaq

Aşkarda dost kimi gülək danışaq
Gizlicə sevgidən yanaq, alışaq
Arada şirincə küsək, barışaq
Amma heç bir zaman biz ayrılmayaq

Mənim duyduğumu bir sən bilirsən,
Hələ çox yaralıyam, sənsə sual verirsən
Gözlərimdə kədər var, bunu da sən görürsən
Ona görə deyrəm, kaş ki, biz ayrılmayaq.

## Yaman darıxıram

Bilmirəm oturum, bilmirəm yatım?
Yenə də sənsizəm canım, bu axşam,
Nə qədər boşuna xəyallar qurum?
Yaman darıxıram yenə bu axşam.

Bir qələm, bir dəftər tək dayağımdı,
Qəmli musiqilər dərd ortağımdı.

Bir məni gözləyən boş yatağımdı,
Yaman darıxıram yenə bu axşam.

Mənəvi təklik də ən böyük cəza,
İnsan istəyir ki, öz qəbrin qaza,
Nə qədər kövrələ, nə qədər yaza,
Heç təsir eyləməz ki, insafsıza.

Özüm öz duyğuma ərk edə bilsəm,
Bir anlıq bu ruhu tərk edə bilsəm,
Daş qəlbli canları dərk edə bilsəm,
İnan darıxmaram təklikdən belə.

Sənsiz darıxıram səninlə amma,
Yenə də sevirəm unutdum sanma,
Qanmazlar nə desə çalış inanma.
Yaman darıxıram yenə bu axşam,
Başın üstündəyəm əllərimdə şam,
Sarıgül Yağmurdu sənlə hər axşam,
Amma darıxıram nəysə hər axşam.

## Bu gecə

Söylə, necə duydun sənsizliyimi,
Yuxuma gəlmişdin canım, bu gecə.
Təzəcə dil açan körpələr kimi,
Səssizcə yatırdım gülüm səssizcə.

Qayğı yuva qurdu canımda mənim,
Bax kölgən dolanır yanımda mənim,
Qanın da dolaşır qanımda mənim,
Yuxuma gəlmişdin canım bu gecə.

Oxşasa könlümü şirin avazın,
Mən də həvəslənim şerlər yazım,
Sənlə gözəlləşir baharım yazım.
Həsrətin könlümü yaxdı bu gecə,
Hicran pəncərəmdən baxdı sakitcə.

## Yalançı bahar tək gələn sevgilər

Ömrümə yalançı bahar tək gəldin,
Səni sevdiyimə peşman olmuşam,
O qədər suallar içindəyəm ki,
Özüm öz duyğuma düşman olmuşam.

Mən sənə bağlandım qəmsiz, kədərsiz,
Səni çox istədim hədsiz, qədərsiz.
Sevincli anları saldım itirdim,
Göz yaşım sel olub, axır xəbərsiz.

Sevgi adiləşib indiki vaxtda,
Coxu yalanlarla oturur taxta.
Sevginin o təmiz və pak adını,
İndi bağlayırlar taleyə, baxta.

İlahi ürəyim dözmür bu dərdə,
Sevirəm kəlməsi adiləşibdi.
Ayrılıq gələndə hətta ürəklər,
Bu qorxunc kəlmədən sakitləşibdi.

Nə deyək qəlbləri yaxan sevgiyə,
Sonra pəncərədən baxan sevgiyə,
Yalanlardan göyə çıxan sevgiyə.
Elə bil ki, heç olmayıb ürəkdə,
Artıq dayaq durmur ona ürək də.

## Duyğu seli

Bu eşq qapısının astanasında,
Başımı əyərək dedim Allaha.
Mən əsir düşmüşəm duyğu selinə,
Məni çox dərinə aparma daha.

Mənim duyğularım qoy mənə qalsın,
Od tutsun sinəmdə alışsın, yansın,
Tüstüsü kainat içində qalsın,
Yağış damlası tək yerə enməsin.

Mən o məhəbbəti yaşayım gizli,
Səsi yayılmasın, küyü çıxmasın.
Özümü yandırsın, özümü boğsun,
Elə yandırsın ki, iyi çıxmasın.

Mən ki, onun dəyərini bilirəm,
Zəkasına, ağlına əyilirəm,
O da mənim kimi olsun demirəm,
Sadəcə ruhumu duysun deyirəm,
Sarıgül Yağmur tək düzün deyirəm.

## Sevən kəs

Sevən sevgimi gözlər,
Ürəyində sevgi bəslər,
Gözəl gələcəyə səslər.
Yalan dolanlar olmasa,
Arzusu yarım qalmasa.

Sevən ürək quş tək uçar,
Vüsal bizdən uzaq qaçar,
Bir xoş kəlmə eşqə açar.

Söyləsə sevirəm səni,
Sevindirər inan məni.

Bitsin, getsin bu iztirab,
Sevən kəs çəkməsin əzab,
Sevənin istəyi cavab.
Alsın istədiyi şəxsdən,
Qırılmasın qəlblər qəsdən,
Sevilən sevənə səslən.

## Dəli sevda

Dəli bir sevdaya tuş olsun könlüm,
Eşqin göylərində quş olsun könlüm.
Hey uçsun göylərin dərinliyinə,
Sevda dənizinin sərinliyinə.
Sonra atəş yaxsın çölləri – düzü,
Alovlar bürüsün durğun dənizi.
Qovrulsun dərdlərim içində yansın,
Ağrı-acılarım küllənib sönsün.
Xəstəlik söhbəti keçmişdə qalsın,
Yaddaşa çevrilib söhbətə dönsün.
O söhbət aylara-ilə qarışıb,
Sevda atəşiylə bir külə dönsün.
Sonra da bağçamda açan çiçəyə,
Pəncərəmdə duran küllü dibçəyə.
Suya qarışdırım torpağa verim,
Hər birin bir canlı yarpağa verim.
Çünki həyat dolu canlı varlığam,
Evimə, ailəmə bağlı varlığam,
İlahi qüvvəyə qəlbən inanan.
Ona dua edən, sitayiş edən,
Onun varlığına bağlı varlığam.
Hər gülə-çiçəyə sevdalıyam mən,

Övlada, nəvəyə sevdalıyam mən,
Həm həssas, həm nikbin ruhlu insanam.
Hər şeydən sevinən, duyğuyla dolu,
Hər şeyə barışıq, dosta bağlanan.
Diqqətə, qayğıya çox dəyər verən,
Həyatı, dünyanı sevən insanam.
Tanrı bu sevgini məndən almasın,
Arzu-diləklərim yarım qalmasın.
Bir ona bəllidir mənim istəyim,
Qoy yarım qalmasın arzum-diləyim.
Amin.

## Giley

Mən sənə can dedim, canımı aldın,
Amma ki, könlümü ala bilmədin.
Bütün tanıyanlar sevirəm dedi,
Sən özgələr qədər ola bilmədin.

Qaçıb qurtarmaşa ümid yerim yox,
Dörd yandan həsrətin mənə tuş gəlir.
Nə zaman göndərsəm sənin dalınca,
Hər dəfə xəyalım əli boş gəlir.

Yenə bəhanələr qatar-qatardır,
Əlində əsasın yoxdur, ya vardır.
Nə olsun ki, əldən gedən bahardır,
Ömrümə sazaqla yenə qış gəlir.
Bezdim inan ki, belə yaşamaqdan.

Yenidən nə üzlə hal soruşursan,
Özündən də bəhanələr qoşursan.
Xəyalımla da tez-tez vuruşursan
Bu sevən qəlbimi gəl incitmə sən,
Getdiyin kimi get dönmə yenidən.

## Ürəyim bağışla

Demirəm mənimlə talehini seç,
Sən məni bağışla günahımdan keç.
İnsan sevdiyini incidərmi heç
Kim məni sevər ki, bu davranışla?
Bağışla, ürəyim məni bağışla.

Ölərəm əlinə dəyməsə əlim,
Qəlbini qırmışam lal olsun dilim,
Gəl məni yandırıb yaxma, ay gülüm.
Kədərli gözlərlə, qəmli baxışla,
Bağışla ürəyim, məni bağışla,
Əgər bağışlamasan qəlbdən alqışla.

Xəzan vurmuş bir yarpağam gözündə,
Məni səndən ölüm alsın aparsın.
Yandır məni məhəbbətin közündə,
Bəlkə bu nağıl da burda qurtara.
Sarıgül Yağmur bu acıdan qurtara.

## Beləmi sildin

Mən sənə can dedim, deməzdim gərək,
Nə üçün sən mənə etmirsən dəstək.
Ay mənim könlümü ovlayan mələk,
Sən məni ürəkdən beləmi sildin?

Nə vardır könlümdə aldın apardın,
Məni bu aləmdən çəkdin qopardın.
Ürəyimi dərdə saldın apardın,
Sən məni ürəkdən beləmi sildin?

Könlümün əl çatmaz dağları itdi,
Əridi qəlbimin yağları getdi,
Ömrümün ən şirin çağları getdi.
Sən məni ürəkdən beləmi sildin?

Qəlbimdən keçəni bilib, bilmədən,
Gözümün yaşını silib silmədim,
Sarıgül Yağmur ölübmü bilib bilmədən,
Sən məni ürəkdən beləmi sildin?

## Ürəyim

Qan gəlib ürəyin gözünü tutur,
Belə qan ağlamış gözü ürəyin.
Baş ürək hayında özün unudur,
Qovrulur içində sözü ürəyin.

Quru alovlanır yaşın odunda,
Torpaq çox yumuşaqdı daşın yanında,
Görəsən nədəndir başın yanında,
Çox vaxt unudulur özü ürəyin.

Bir gün düzələcək düzəlməyənlər,
O vaxt göz də gülər, könül sevinər,
Ürəkdən keçəni nadan nə bilər?
Necə yanıqlıdır gözü ürəyin.

Güllərin qoxusun külək qaldırar,
Ümid arzulardan dilək qaldırar,
Hansı söz, yalvarış görək qaldırar?
Düşəndə torpağa özü ürəyin.

Əcəb can evində qalıb avarə,
Evdəki həkim də axtarır çarə,

Çölündə üz gülür, içində yarə,
Yığılsa yüz təbub çaşar ürəyin.

Sarıgül Yağmur deyək-gülək demişdik.
Bir -birimizə olaq dəsdək demişdik,
Mən sənə, sən mənə ürək demişdik,
Vallahi bax dözməz dayanar durar.
Gəl bu bəlalardan qurtar ürəyi,
Hayana istəsən apar ürəyi.

**Sevginin**

Gözlərinə de ki, soyuq baxmasın,
Əllərinə de ki, məni vurmasın,
Ürəyinə de ki, məni unutmasın,
Xeyirdən çox ziyanı var sevginin.

Çox güvənmə məhəbbətin adına,
Qısqanırsan zəhər qatıb dadına,
Heç olmasa Kərəmi sal yadına.
Xeyirdən çox ziyanı var sevginin.

Məni bu yuxudan oyatmasınlar,
Qoy yatım yuxuda mən səni görüm.
Aradakı yaş radarın anlayıb,
Köksümə yığılan qüssəni görüm.

Yadımdan çıxmayır birinci görüş,
O günü daima xatırlaram mən.
Birinci toxunuş, birinci baxış,
Bax belə macərası var sevginin.

## Unutma ürək

Hər zaman ümidə söykənər ürək,
Gərək ki ürəyə verəsən dəsdək,
Ayrılmaq istəyən ayrıla gərək.
Heç ümid də etməz bu işə kömək,
Sevgiyə sədaqət, düzlikdir dəstək,
Bunu da heç zaman unutma, ürək.

Mən həsrət nəğməsi, sənsə küləyim.
Əzizim, doludur mənim ürəyim.
Sənə xoşbəxtlikdir mənim diləyim.
Qoy bir Allah olsun mənim köməyim,
Bunu da heç zaman unutma, ürək.

Əlim çatmayana demərəm əyil,
Məni isdəməyən kəs, mənim deyil.
Çatıb köməyimə gör neçə ay, il,
Həyata bağlıyam, bu yalan deyil.
Bunu da heç zaman unutma ürək,
Bax real həqiqət, bu da ki, gerçək.

## Daha inanma

Məhəbbətin şərbətindən içmişəm,
Neçə ayrılıqdan gəlib keçmişəm,
Təkcə onu qəlbimə yar seçmişəm,
Başqa sevgilərə daha inanma.

Mən həsrətin göz yaşını görmüşəm,
Dərd gələndə ağlamışam, gülmüşəm.
Həqiqəti gec də olsa bilmişəm,
Heç kəs mən tək daxildən ağlayıb üzdən gülməz.

Mən qəm kərvanıyam, sənsə sarvanı,
Bir insan ömrü belə keçərmiş səfasız,
Ömrümü taladın mənim insafsız.
Səni sevdiyimə daha inanma,
Mən yandığım odla çalış sən yanma.

Bu şeri yazıram sevənlər üçün,
Sevgisi uğrunda ölənlər üçün,
Sevginin qədrini bilənlər üçün.
Sarıgül Yağmur boş vədlərə inanma,
Sevgi olduğunu bir daha sanma.

## Necə barışaq?

Deyirdim sevəcəm, sevə bilmədim,
Hər cür çətinliyə dözə bilmədim,
Bu isdəyə qəlbimdə yer vermədim,
İndi bu duyğuyla necə barışım?

Çalış ki, içimdə nifrətə dönmə,
Hər adi şeylərdən alışma, sönmə,
Mən şeir deyəndə çalış ki, dinmə.
Sən yersiz söz atsan necə barışaq?
Mənasız hərəkətə necə alışaq?

Onsuz da istirab vermisən mənə,
Diqqətsiz yanaşdın sən dönə-dönə,
İndi gəl unudaq keçmişi yenə.
Sən üzr istəyərsən bəlkə barışaq,
Əvvəlki istəklə yenə danışaq.

Ürəyin işinə qarışa bilmirəm,
Diqqətsizliklə barışa bilmirəm,
Hörmətsizliyə alışa bilmirəm,
İndi bu duyğuyla necə barışaq?

## Həsrətin nəmi

Bir sevgi can verdi içimdə mənim,
O gündən qəm-kədərin köləsi oldum.
Üzməyi bilməyən bir uşağ kimi,
Sevda dənizinə düşüb boğuldum.

Közərə-közərə yanan şam kimi,
Gözlər görə-görə əriyirəm mən.
Həsrət yorğanına nəmli bürünüb,
Göz yaşları içində çürüyürəm mən.

Yenə də ağlıma gəlir sözlərin,
Deşir ürəyimi yenə sözlərin,
itibdi yollardan ayağ izlərin,
Elə boş- boşuna yeriyirəm mən.

Sən mənim ruhi qidam,
Bir ömür sevəcəyim adam,
Bax demə ki, mən sənə yadam
Səni gözləyirəm ay adam,
Bu qəmli həsrətinə belə şadam
Sevdiyim adam, sevdiyim adam.

## Sənə

Xoş günüm bol olsun, ay mənim canım,
Canımdan canına payım var sənə,
Səni öz canımdan cox sevirəm mən
Xeyli xoş duygular yaşatdın mənə,
Təkcə sənsizliyi çəkdirmə mənə.

Sənə həmlələrim yalnız sevgidir,
Başqa bir niyyətim yoxdur ki, gülüm,

Canımdan canına payım var mənim.
Bir ömür borcluyam, borcluyam sənə,
Təki xoşbəxtliyi bəxş elə mənə.

Sənli istəklərlə yaşayıram mən,
Arzular qovuşar istəklərinə.
Mən özümcün heç nə arzulamırm,
Təkcə sən arzula xoş istək mənə,
Mənim arzularım xoşbəxtlik yenə
Sənə, sənə, sənə, yenə də sənə.

Sevgi yaşa baxmır mənim əzizim,
İstəklə sevgində püxtələşibsən,
Səndən özgəsinə yoxdu marağım
Təmiz duyğularla dəstəklənibsən.

Adını yazmışam qəlb səhifəmə,
Qəlbimdən qopara bilməzlər onu.
Səni unutmaram bircə an belə,
Xəyanət olubdu həmdə yad mənə.

O qədər maraq yaratmısan məndə,
Bütün günü fikrim dolanır sənlə.
İnan ki, yadıma düşəndə sən də,
Dünya gözəl olur, həm rahat mənə.

Sargül ömrün qədrini vaxtında bilmədi,
Qayğıların əlindən heç ürəkdən gülmədi,
Gözucu bir dönüb dala baxmayır,
Sənin bu yaxşılığın əvəzin çıxmayır.

## Sevgi pöhrəsi

Bu qəlbdə gizlənən duyğular sənin.
Sevgimsə yenicə pöhrələnibdir,
İstəklər qarışıb düşüncələrə.
Ruhumsa bahar tək pöhrələnibdir.

Tanıya bilmirəm özüm-özümü,
İnsan da beləcə aciz qalarmış.
Aşkarda deyə bilməsəm sözümü.
Sözlərim budaqda gül tək solarmış.

Gecəm də qarışıb gündüzlərimə,
Ruhumda, fikirim də tək bircə odur
Mən həsrət qalmışam sevdiyim gözə,
Bu istək qəlbimə hakim olaçag.

Hec belə bilməzdim mən bu duygunu,
İnsanı özündən qoparır hər an,
Bilənlər anlayar beləmi olur?
Bax indi kəşf etdim bunu doğrudan.

Fikrim, xəyalım da təkcə gül odur,
Onu sevdiyimə peşman deyiləm.
Mənli bənövşələr qışda da acır,
Hər acan çiçəyə heyran deyiləm.

Günahmı edirəm hələ bilmirəm,
Dərdimi hec kimlə bölə bilmirəm.
Bu istək hər fəsil pöhrələndikcə,
Yazda acanlara gülə bilmirəm,
Bu nə sirdir hələ bilə bilmirəm.

İlahi, sən qoru bu məhəbbəti,
Mənə acıları yaşatma bir də.
Gəl mənə çox görmə bu səadəti,
Sevgim tuşlanıbdı sonsuz bir səddə.

Taleydən bir daha şikayətim yox,
O çıxardı səni qarşıma mənim,
Qəlbimdə tək odur başqa biri yox,
Allahım, sən qoru bu məhəbbəti.

Bəs niyə azalır sevgi pöhrəsi,
Harda səhvim oldu görəsən mənim?
Əvvəllər sevgimi əsirgəməzdin,
İndi xoş sözünə həsrətəm sənin.

**Sevgimiz**

Sevgimi bəzərəm gül ləçəyiylə,
Qoymaram sarala, sola bu sevgi.
Mən səni sevirəm təmiz niyyətlə,
Qoymaram şüphədən qırıla sevgi.

Qoymaram həsrəttən sıxıla qəlbim,
Gecə yuxuna da gələrəm sənin.
Dönüb ətrafımda bir pərvanə tək,
Qəlbinin icində qalaram sənin.

İlahi sən qoru bu məhəbbəti,
Sən mənə cox görmə təmiz duyğuyu.
İlahi sən mənim qəlbimdən çıxar,
Yersiz qısqanclığı və şübhələri,

Mən doya bilmirəm bu məhəbbətdən,
Arzumdur tükənib bitməsin bu eşq,

Mən doya bilmirəm bu səadətdən,
Ömrün sonunadək itməsin bu eşq.

Mən indi bildim ki ilahi eşqi,
Günahı az olur savabı coxdur.
Çünki saf sevginin əvəzi yoxdur,
Deyirlər əlcatmazdır ilahi eşqlər.

Taledən ummuram daha hədiyyə,
O səni bəxş etdi yanan qəlbimə,
Mən indi bildim ki, cətinlik nədir,
Ümid qalmamışdı bil, aya, ilə.

Bax mən ikinci kəs o şansı verdim,
Ünvanı səhv getmiş o bəd niyyəti.
Bax bir də gördüm ki, çətinmiş,
Səni anlayanın, bu səmimiyyəti,
Bax gücü də budur bu ülviyyətin,
Sənsiz yaşamaqsa cətindən cətin.

## Könlüm

Ağrı acılar əlindən yanıb talan olan könlüm,
Haqsız, yersiz həmlələrdən ruhu üryan olan könlüm.
Artıq geriyə yol yoxdu uçub göydə qala bilər,
Doğmalara, əzizlərə ordan söylə salam könlüm.

## Yuxulu xəyallarım

Yuxuma gəlsəydin əgər bir axşam,
Deyərdim qoy yuxum olsun əbədi.
Səni çox gəzmişəm çox axtarmışam,
Barı itirməyim bu səadəti.

Minlərlə ulduzun içindən seçdim,
Bir günəşçin, milyon ulduzdan keçdim.
Səni qorumaqçın, itirməməkçin,
Hətta ulduz karvanından vaz keçdim.

Yuxuma gəlsəydin yenə bir axşam.
Mən cəpər edərdim kirpiklərimi,
Qoymazdım yuxuma daha heç kəsi.
Qıymazdım yuxumdan çıxıb gedəsən.

Yuxu getmir gözümə,
Gözüm baxmır sözümə,
Yatızdıra bilmirəm uşaq kimi özümü,
Necə sənsiz gecəyə necə yumum gözümü.
Küləyin vıyıltısı, pişiklərin səsləri,
Suların şırıltılı, divarın nəfəsləri.
Sıxır məni geriyə qaranlığın pıçıltısı.
Gedib səninlə gülüm gecənin rahatlığı.

Küçələrdə işıqlar arabir sayrışırlar,
Tək keçdiyim günləri arabir danışırlar,
Gecə məndən xəbərsiz minnətə gəlib sənə,
Ulduzların gözüylə bir yol baxarsan mənə.

## Könlüm istəyir

Bu yol məndən bir az zaman istəyir,
Enişi yoxuşu dağ-daşı kənar.
Çünki həyat yolu ömürlük gülüm,
Odur ki, bu yollar naxış istəyir.

Qurub bir yuvanı arzu- istəklə,
Gərək yaşayasan təmiz ürəklə,

Həyat yollarını təmiz niyyətlə,
Qurub yaşlanmağı könül istəyir.

Ey dəli xəyalım, nədir istəyin?
Özündə deyilsən nə olub yenə?
Girmisən yuxumla yenə qol-qola,
Düşmüsən hicranlı təzə bir yola.

Fırlana-firlana haradı yolun?
Yenə də həsrətin boynunda qolun,
Gah göydə gəzirsən qərib baxışla,
Gah dənizdə üzüb nigaran naxışla.

Söylə nə axtarıb kimi gəzirsən?
Axırda yorulub sanki bezirsən.
Durmusan arzu-istəklə yanaşı,
Boylanıb dünyaya kimi gəzirsən?

## Tək səninlədir

Sən mənim sevgimin tək ünvanısan,
Qəlbim sevincim tək səninlədir.
Sən mənim solmayan sevgi çiçəyim,
Ruhumun qidası tək səninlədir.

Mən sevə bilmərəm başqa bir kəsi,
Yalnız səninlədir xoş arzularım.
Xəyalımda daim sənin sürətin,
Arzu, istəklərim tək səninlədir.

Yaşam istəyini səndən alıram,
Sənli xəyallarla yolda qalıram.
Sevgini də ürəyimə salıram,
Ən xoş diləklərim tək səninlədir.

Bu istək ümidə çevrilir daha,
Sənli ümidlərim qalır sabaha,
Sən mənim xəyalım olmusan daha,
Artıq xəyallar da tək səninlədir.

## Gəl

Ömrümün çiçəkli baharı sənsən,
Aldığım nəfəsin nübarı sənsən,
Yaşayan ömrümün havası sənsən.
Ay ömrüm, həyatım, baharım mənim,
Yubanma ömürlük havadarım mənim.

Sənsizəm əzizim yenə bu axşam.
Gözlərim yoluna dikilib qalıb,
İlıq nəfəsinin həsrətindəyəm,
Göz yaşım ovcuma tökülüb qalıb.

Hardasan səsimi eşit dön geri.
Gəl oxu qəlbimi sən varaq-varaq,
Gəl ki xatırlayaq ötən günləri,
Danışaq keçmişi biz xatırlayaq
Həsrətin özəldi, özəlmiş gözəl.
Qərib istəyinlə gəl könlümdə qal.

## Yuxusuz gecəm

Məni gecələrdən qopar, ay Allah,
Yuxumdan gözümə yenə od düşür.
Məni gəncliyimə qaytar, ay Allah,
Yuxu kipriyimdən, gözümdən düşür.

Gözüm görə-görə yanır ürəyim,
Qələmdən od, alov varaqa keçir.

Ürəyim deyəni duyur əllərim,
Gözlərim önündə varağı seçir.

İndiki halıma özüm baxıram,
Mən ki, yazmamışam qədəri, Allah,
Kipriyimdən damla olub axıram,
Sən götür qəlbimdən kədəri, Allah.

Bəzən yerinə düşür yazdığlarım da,
Tumar çəkə-çəkə ruhum dincəlir.
Məni dincliyimə qaytar, ay Allah.
Belə ümidlərlə qəlbim dincəlir,
Sarıgül Yağmura yeni güc gəlir.

**Sən olacaqsan**

Gözümün önündə başqa birisi,
Xəyalımda yalnız sən olacaqsan.
Evimin qonağı başqa birisi,
Könlümün qonağı sən olacaqsan.

Ayları, illəri verərək yelə,
Gözümün yaşları dönəcək selə,
Qəlb odun söndürdün sən bilə-bilə,
Közərən ocağım sən olacaqsan.

Ömrümün yelkəni zənn etdim səni,
Gəlib qurtarasan təklikdən məni,
Saldın gözlərimə dumanı, çəni,
Sonuncu dayağım sən olacaqsan.

Niyə etdin bu günahı əzizim,
Mən sənə ömrümü qurban demişdim.
Axı yer adamı deyildim canım,

Mən sənin yanına göydən gəlmişdim.
Qəlbimin mehmanı sən olacaqsan.

Yenə də qonağım olassan mənim.
Yenə də incidib, üzəcəm səni,
Yenə də əlimi çənəmə qoyub
Təpədən dırnağa süzəcəm səni,
Amma ki, cananım sən olacaqsan,
Sarıgül Yağmura sən qalacaqsan.

## Dəniz eşqi

Allahım, bu nə sevda, bu nə məhəbbət?
Bir gün bütün cahan çaşıb qalacaq,
Ya sahil dənizin altda qalaraq,
Ya dəniz sahildə aşıb daşacaq.

Suyun qum sevdası donub qalacaq,
Qağayı sahilə uçub qonacaq,
Sahildə qayalar donub qalacaq,
Dəniz də sahili qoynuna alacaq.

Bax bu da məhəbbət nağılı kimi.
Dalğalar canlı tək coşur içindən.
İrəli, geriyə ləpələnirlər.
Dəniz dalğasının pıçıltısı tək,
Qumlar da sahilə səpələnirlər.

## Yalanmış

Biz niyə ayrıldıq bilə-bilmirəm,
Mən buna ayrılıq deyə bilmirəm,
Artıq bu istəyi öyə bilmirəm.
Sənin böyük sevgin demək yalanmış.

Səni görməyəndə çox odlanmışam,
Görəndə sevincdən alovlanmışam,
Bu neçə müddətdə mən aldanmışam,
Sənin böyük sevgin demək yalanmış.

Sən oldun bu eşqi dananlar kimi,
Eşqini yarı yolda qoyanlar kimi,
Həyatını saran yalanlar kimi.
Sənin böyük sevgin demə yalanmış.

İndi yenə yadda qaldı zirvələr
Yaranışdan duman, qardı zirvəlik.
Ömrümüzü ucaldardı zirvəlik,
Nahaq endik o dağların başından
Yalanların izi qaldı daşında.

**Bəlkələr**

Mən yaxşiyam yavaş-yavaş,
Öyrəşirəm tənhalığa,
Yavaş-yavaş barışıram qismət ilə,
Kədər ilə həsrət ilə.
Bir az soyuq davranıram axan ılıq göz yaşına,
Axır axır silmirəm heç əlimlə,
Deyirəm bəlkə yumşalam dilimlə.

Bəlkə həqiqətən dəli olmuşam,
Ağlımı başımdan alıb hisslərim,
Mən belə deyildim əzəl günlərdə.
Məni bu günlərə salıb hisslərim.
Ağlımı başımdan alıb hisslərim.

Bəzən də rəsmini cəkirəm onun,
Amma qələmlə göz çəkilmir axı.
O gözəl qaməti, boyu, buxunu,

Əzməyim deyə kağizi bükə bilmirəm,
Qələmlə nazını çəkə bilmirəm.

Zəng etmək istərəm, tərəddüdəyəm,
Ürəyim istəyir, qürur qoymayır,
Başımı şerlə qatıram hər gün
Yazıram, pozuram, kağız doymayır.

## Ay ürəyim

Qisas, kin sən belə fikirlərdən keç,
Kin insan qəlbinə qara iz salar.
Mən heç sənə nifrət də eləmirəm.
Sənə nifrət etmək belə az olur,
Bu duyğu yükü də sənə söz olar.

Bir kərə bağışla desəydin mənə.
Hər bir şey tam fərqli ola bilərdi,
Bir azca düzgünlük görsəydim səndə.
Mənə ürəyim də qərar verərdi.
Səni dünyasına uyğun görərdi.

Bunu mən demirəm ürəyim deyir,
Səndən inciyən də, küsən də odur.
Mən heçnə anlamıram amma nədənsə,
Adın çəkiləndə əsən də odur.
Səni görməyə tələsən də odur.
Sarıgül Yağmuru asan, kəsən də odur.
Ürəyim, ürəyim, ürəyim, ay ürəyim.

## Könlüm

Yenə nə coşursan sevdalı könlüm,
Sevgi alovuyla yaralı könlüm.
Ünvansız mənzilə axıb gedərsən,
Səndən soruşarlar haralı könlüm?

Nə baxırsan yaşa, nə də ki, başa,
Ünvansız oxların tez dəyər daşa,
Eləcə bir zənglə gəlirsən coşa,
Yaşa, ay alovlu, havalı könlüm.

İncələ hər sözdə mənalı hələ.
Tələsmə, qorxduğun başına gələ,
Tutduğun mövqeni heç vermə yelə.
Kətirmə başına bəlanı könlüm.

## Barışaq

Deyirdin sevəcəm sevə bilmədin,
Dərdimdən ölürdün ölə bilmədin,
Bu eşqdən çələnglər hörə bilmədin,
Eşqin qarşılığın verə bilmədin,
İndi söylə görüm necə barışaq?

Alışır qəlbimdə həsrət anbaan,
Donur damarımda artıq axan qan,
Eşqimiz də yavaş-yavaş verir can,
Görək indi daha nə deyir zaman?
Bax bu düşüncəylə necə barışaq?

Bu ayrılıq yaraşmır yaşımıza,
Hələ görək nə gəlir başımıza,
Həsrət yol salacaq divar, daşımıza,
Söylə ayrılıqla necə barışaq?

Bax, mən də yanmışam eşq odunda,
Sevgimiz səsləndi dastan adında,
Yaddaşa iz saldı qohumun da, yadın da.
Amma çəkdiyim əzablar qalsın yadında.
Səni səndən çox sevdiyimi danışaq.
Axırda da anlaşaraq barışaq.

Eşq yolunda çinar olub bitmədin,
Dağlar aşıb zirvələrə getmədin,
Öz bildiyin etdin güzəştə getmədin.
Bundan sonra gəl, bax belə danışaq.
Bir-birmizə çox hörmətlə yanaşaq,
Həyat çox qısadır canım, barışaq.

Aşiqləri hicran qəmi əyəndə,
Qapımızı yersiz həsrət döyəndə,
Sevgisizlik belimizi əyəndə,
Sarıgül Yağmur, gəl, ölürəm deyəndə,
Bəlkə insafa gələsən barışaq.

## Son qərar

Artıq mən bu gün bir qərara gəldim,
Olub keçənləri qarşıma sərdim.
Nəhayəti ki, mən də son qərar verdim,
Artıq bu mövzudan vaz keçdim daha,
Yazıb da batmayım yersiz günaha.

Yenə də yazıram kədərli şer,
Gileydən heç bir kəs tapmayıb xeyir,
Əllərim yazsa da ürəyim deyir,
Bəsdi gəl, qələmi qoy bir kənara,
Yazıb bülənməyim naləyə, aha.

Qədrim bilinmədi, qəlbim qırıldı,
Həsrət boynun bükdü, ürək yoruldu.
Bax hər gün incidi, sındı, vuruldu,
Daha söz verirəm gələn sabaha,
Bax, bədbin şerlər yazmaram daha.

Adi soyuq baxış qəlbi sındırar,
Bir ani hərəkət qanı dondurar.
Namərdlər məqamı tez-tez andırar,
Bax, Tanrım da elələrin yandırar.

Ürək sındıranın sınar ürəyi,
Çörək titirənin olmaz çörəyi.
Ümidsiz kəslərin arzu-diləyi,
Ulu Tanrım olur özü köməyi.

Mən Tanrımın qüdrətinə inannam,
Onun adil qərarına sığınnam,
Bir daha qansızdan mən diqqət ummam.
Ulu Tanrım elələrin qandırar,
Məni incidənin qəlbin yandırar.

## Ömür vərəqləri

Ömür vərəqləri yarpaq kimidir,
Bəzən yaşılkən düşər, həyat belə ötüşər,
Saralıb düşəni torpağa qarışar.
Heç kəs duymadan, hiss etmədən.

İnsan ömrü bir təqvimdir,
Hər günün varağın özü kəsər.
Ömür varağı itməsin deyə,
Hər varağın üstə əsər,
Amma alın yazısıdır ömür tələsər.

Hər kəsin bir işi var,
Hər kəsin bir vərdişi,
Hər kəsin ömür xətti.
Harda görən kəsişir?
Burda kimsənin yox günahı,
Amma bəzən ölür söz günahı.

Çəkilən xətlər ömür xətləri,
İnsan öz əliylə, əməliylə çəkir o xətləri.
Kimisi xətt çəkir ömür yoluna,
Kimisə xətlə çəkilir öz yoluna.
Beləcə ömür keçir, ömür xətləri…
İnsan özü kəsir bu təqvimin vərəqlərin,
Ömür xətləri, ömür vərəqləri…

## Məni

Həsrətim də sənsən, vüsalım da sən,
Qalan ağlım, həm də kamalım da sən,
Xəyalım da sənsən, vüsalım da sən,
Sənsən bu canımın parası, təni,
Göylərə qaldırır bu hikmət məni.

Yanar könüllərin arzu-istəyi,
Gah sevinc gətirər, gah qəm-kədəri,
Dalğaya çevirəm lal ləpələri.
Göylərdən seyr edək qoşa yelkəni,
Göylərə qaldırdı cəsarət məni.

Qalxır bu alovum, közüm göylərə,
Gecələr dikilir gözüm göylərə,
Bir gün köçəcəyəm özüm göylərə.
Göylərdən axtarar gözlərim səni,
Göylərə qaldırdı bu həsrət məni.

Gəl, ayı dolanaq, ulduzda gəzək,
Kahkəşan yoluna incilər düzək.
Nə yerdə yorulaq, nə göydən bezək.
Birlikdə oxuyaq sirli nəğməni,
Göylərə qaldırdı bu ülfət məni.

## Bu gecə tənhayam

Bu gecə ürəyim sıxılır yaman,
Həsrət bir tərəfdən, qəm bir tərəfdən.
Yadıma düşdükcə dərdim, kədərim,
Başım da ağrıyır yenə əsəbdən.

Elə bir üstümə gəlir divarlar,
İçimdə qəhərim dünya boydadı.
Bu qədər acıyla gülüm mən necə?
Bax, ruhən tənhayam, tənha bu gecə.

Hamıdan çox sənə verirəm dəyər,
Bircə anlıq düşün, sən də ver dəyər,
Əzizlərimdən sən söylə xoş xəbər,
Mənim ümidlərim əsir bu gecə,
Oyaqdılar da üzür məni səssizcə.

Ürəyim darıxar səni görməsəm,
Dinc dura bilmirəm yuxum gəlməsə,
Evə gəlib bir izini görməsəm,
Ümidsizlik məni yaxar sadəcə,
İnan mənə ruhum çıxar o gecə.

## Yağ, yağışım

Yağ, yağışım, bulud kimi
Zaman-zaman köçərisən,
Bir dünyaya nəzər yetir, ötəri sən.
Necə susuz, cadar-cadar yerlərin var,
Yazıq torpaq nələr udar.

Yağ, yağışım, bu dağların,
Bu daşların hikkəsini aparınca,
Bir ərköyün çığaddıqla,
Bir hay-həşir qoparınca…

Yağ, yağıhım, sənə dərdimi danışım,
Yağ, yağışım, dərdimlə yanım, alışım,
Yağ, yağışım, yarımdan çox incimişəm,
Yağ, yağışım, bəlkə yarımla barışım?
Yağ ki, çöllərdən yığışım.
Artıq ömürə gəlir qışım,
Yağ, yağ, yağışım, sənə dərdimi danışım.

Yağ, elə yağ ki, yağış,
Qəlblərə vur zərif naxış.
Bir qəlbimə nəzər yetir ötəri sən.
Bu qəlb yazıq nədər udar,
Necə udsun zəqqum kimi dil açsın?
Daşımazdı bu ürəyin neçə karvan fil açsın,
Yağışım yağ, mən onunçün
Saxladığım ünsiyyəti.
İnanmasa söylədiyim həqiqəti, yu, yu getsin.
Acılıq ömürlük itsin.
Yağ, yağışım, könüllərə, qəlblərə yağ,
Qoy qaralar təmizlənsin,
Olsun düm ağ, olsun düm ağ…

Yağış, ürəyim də dolur belə havada,
Qalıram mən tək başına ürəyimlə davada.
Yağ, ey yağış, ürəyimə yağginən,
Yağ elə yağ narın yağış,
Qəlbdən gəlsin sənə alqış.

Qəlbimə məlhəmdi yağış damlası,
Hər ona baxdıqca heyran oluram.

Buludun bizlərlə təması yağış,
Yağdıqca könlümə xoşbəxt oluram.
Yağış yuyur – yavaş-yavaş izlərimi,
Yağış yuyur, yaşla dolu gözlərimi.
Sevgimizə yağış yağır bu gecə,
Qüssə-qəmi yuyur yağış səssizcə.

Bu ilahi nemətidir, Tanrı rəhməti,
Bu yerin göy ilə ürək söhbəti.
Gəlin dəyər verək yağan yağışa,
Çünki torpağa xeyirdir, dəyər alqışa.
Yağış yağır yavaş-yavaş çöllərə,
Ruzi-bərəkət gətirir ellərə.
*18.03.2015*

**Nədi o…**

Məni səndən hər hansı gün sorsalar,
Söyləyərsən, tanımıram kimdi o?
Gözlərimdə yaş damlası görsələr,
Deyərsən ki, külək vurub, nəmdi o…

Xoş anları xatirindən silərsən,
Gözdən uzaqda qəlbində gülərsən.
Nəfəsimi küləklərə verərsən,
Deyərsən ki, dumandı o, çəndi o.

Təki sən xoşbəxt ol, gülüm, mən varam,
Təsadüfən yayda yağan bir qaram.
Amma mən səni heç vaxt unutmaram,
Laqeydlik – saca düşən dəndir o.

## Sirli baxışlar

Xoş niyyətlə mən qarşına çıxmışam,
Təmiz qəlblə əllərini sıxmışam,
Təsadüfən gözlərinə baxmışam,
Bir baxışla ömür yolun cızmışam,
Bu həsrətlə yollarına baxacam.

O baxışın sirri mənə tanışdı,
Gözdən başqa kim nə desə yanlışdı,
Gözlər həsrət göz yaşıyla dolmuşdu,
Əllər sənə bax, uzalı qalmışdı,
Bu həsrətlə yollarına çıxacam.

Heç istəməm quzey qarı məhəbbət,
Gözlədikcə əriyəcək nəhayət,
Taledi bu heç eyləmə şikayət.
Zaman keçər uyğunlaşar bu adət,
Yorulmadan yollarına çıxacam.

Ürəyimə qor salacaq bu həsrət,
Arada da qəhr olacaq məhəbbət,
Son qərarım budur deyim nəhayət,
Bir ömür də yollarına baxacam,
Bu qisası gözlərimdən çıxacam.

## Ümidimi itirdim

İllərin ömürdən apardıqların,
Elə bilirdim ki, gətirəcəksən.
Bahar gözləyirdim fəsli xəzanda,
Bir arzu, bir ümid yetirəcəksən.

Sənə əmək verdim, unutmayaydın,
Mənə bu üzünü tanıtmayaydın,

Ümüdlər bəslədim, yanıltmayaydın,
Demədim ümidi itirəcəksən.

Könlüm gizli-gizli yanacaq indi,
Hər kəs söylədiyin danacaq indi,
Varmı yad olanda qanacaq indi,
Mənə yenə qayğı gətirəcəksən.

Tənə də, giley də artıq əbəsdir,
Mənim çəkdiklərim özümə bəsdir,
Talehdir, qismətdi, qəbuldu, bəsdir,
Artıq söhbətləri bitirəcəksən,
Öz ailə borcunu yerinə yetirəcəksən.

**Bu gecə**

Yaman qəribləşib ürəyim sənsiz,
Həsrətin ruhuma qəfəs bu gecə.
Barı insaf elə səssiz-səmirsiz,
Yuxuma gəlməyə tələs bu gecə.

Sehirli nağıl ol, dastan ol yenə,
Ruhumu oxşayan nəğmə de mənə.
Məndə tez soruşum «nə olub sənə?»
Xəzəri, gilavar ol, gəl, əs bu gecə,
Yuxuma gəlməyə tələs bu gecə.

Bax necə aydındır səmanın üzü,
Ulduzlar yanaşı çağırır bizi.
Çoxdandır görmürük bir-birimizi,
Yuxuma gəlməyə tələs be gecə.

Yuxuda buludlar yorğanım olsun,
Sənə qovuşmağım həyacanlı olsun.
Gecə sevgimizin dastanı olsun,
Yuxuma gəlməyə tələs bu gecə.

## Üşüdür bu dünya arzularımı

Başına dolanım, çəkil yolumdan,
Bu vədə günaha batırma məni.
Qəmli sözlərini düzüb yoluma,
Bu soyuq havada saxlama məni,
Üşüdür bu dünya arzularımı.

Kimsəsiz, zavallı dilənçi kimi,
Kəsib ümidini yollarda qalan.
Arzusu yarımçıq bir elçi kimi,
Hər gün gözlərimdə qalan iz kimi,
Üşüdür bu dünya arzularımı.

Ürəyim gərəksiz ümidlər tapdı,
Yaşada bilmədim ayrılıq qapdı,
Külək də qaldırıb üzümə çırpdı.
Ayaqlar altına atdı duyğumu,
Üşüdür bu dünya arzularımı.

## Necə yol tapım?

Tufanmı qoparım, mehəmi dönüm?
Yağışmı yağdırım, şehəmi dönüm?
Qulamı çevrilim, şahamı dönüm?
Mən sənin qəlbinə necə yol tapım?

Gecələr şam kimi əriyirəm mən,
Gündüzlər yol üstə quruyuram mən,
Səninçün darıxıb çürüyürəm mən,
Mən sənin qəlbinə necə yol tapım?

Sevgini qəlbimə dustaq edərəm,
Qıymaram ələnə qəlblərə güman.
Tanrıdan özümə səbr istəyim,

Etməyim duyğumu ellərə ehsan,
Bəs sənin qəlbinə necə yol tapım?

Ay gülüm, bax indi naləm, ahımsan,
Son nəfəsimədək sən pənahımsan,
Artıq xəyalda da sən günahımsan.
İtirim gözümün selində səni,
Bəs sənin qəlbinə necə yol tapım?

Dağ çayının şəlaləsi, ləpəsiyəm,
Məni anla, izlərini öpəsiyəm,
Məhəbbəti leysan kimi səpəsiyəm.
Sevgi alver alətisə, bu dünyadan köçəsiyəm,
İndi söylə bu halımla qəlbinə necə yol tapım?

Gedək deyim sevgi dolu bir aləmə,
Qıyma düşün bu həsrətə, dərdə, qəmə,
Deyiləsi dərd deyil ki, bu heç kimə.
Laqeydlik zərbə vurur Sarıgülə,
İndi söylə qəlbinə mən necə yol tapım?

## Gəl, gülüm

Sən gedəndən qapımızı döyür qəm,
Gözümə görünmür başqa bir aləm,
Qəlbimi bürüyür inan, kədər, qəm.
Niyə məni sən bu qədər üzürsən?
Artıq dözə bilmirəm mən, gülüm gəl.

Ürəyimə indi artıq izin düşüb,
Alovlanıb, oda dönüb közün düşüb,
Yadıma hər kəlmən, sözün düşüb.
Könlümə də o şirin avazın düşüb,
Gəl doğma məkanda ürəklə dincəl.

Sən gedəli bağrım başı göynədi,
Heç bilmirəm bu yer nədi, göy nədi?
O inciklik keçib gedib köhnədi.
Kimdi sənən giley edən, qayıt, gəl,
Küsməyinə yoxdu nədən qayıt, gəl.

## Son yarpaq

Dəniz qırağından keçirdim dünən,
Qarışdı gözümdə aləm bir anda.
Yarpaqlar dil açıb sordular məndən,
Niyə tək gəzirsən bəs yarın harda?

Cavab tapammadım mən yarpaqlara,
Çünki yarpaqlarda solacaq bir gün.
Onun da son yeri bax torpaqdadır,
Yenə də baş əyib mən keçib getdim.

Yarpaqlar doğmaydı mənə o anda,
Bəlkə yanağına deyiblər sənin?
Bəlkə də yarpaqlar yaşıl olanda,
Bəzəyib gözünü, ruhunu sənin.

İndi yarpaqları əzizləsəm də,
Canımı bu yolda qurban desəm də.
Yenə son yarpaqlar solacaqdılar,
Torpağın üstündə qalacaqdılar.
Əbədi bir məskən salacaqdılar,
Torpağın üstündə qalacaqdılar.

## Tələs

Tənhalın güclü gələr, ürəyimə köç eylər,
Yuxular basar məni xəyalları puç eylər.
Xatirələr yada düşər arzulara güc eylər,
Yenə səni gözləcəyəm qəlbimdə məskən salasan,
Ruhuma olub qonaq ömürlük mənli olasan.

Mən sənin qarşına çıxan təsadüf,
Sən mənə Tanrıdan özəl hədiyyə.
Qəlbimdə iz saldı bax bu təsadüf,
O iz ki, ruhumda məskən sal deyə.

Tənhalıq qapıma döyməmiş tələs,
Sükut pəncərəmdən baxmamış tələs.
Sənsizlik evimi yıxmamış tələs,
Səni gözləyəcəm mənli ol deyə.

Göydən ulduz istə, parlaq ay istə,
Hər nə nemət desən məndən say, istə.
Çiçəkli yaz istə, güllü yay istə,
Bircə kədərimdən pay istəmə sən.
Bu həsrət bitərsə sənlə bitəcək,
Tənhalıq ömrümdən belə itəcək.

**Ürəyimə**

Söyləyə bilmirəm söz ürəyimə,
Qondura bilmirəm toz ürəyimə.
Nadanları, insafsızı görəndə,
Sonra deyirəm döz ürəyimə.

Əsil insan odur yolun azmasın,
Günahsıza heç vaxt quyu qazmasın.
Söz verdisə ilqarını pozmasın,
Bax onda edərəm naz ürəyimə,
Sonra da deyərəm söz ürəyimə.

İnsafsızlıq baş götürüb gedəndə,
Doğmalar da bax, xəyanət edəndə.
İnsaf, mürvət, qeyrət əldən gedəndə,
Yavaşca salıram köz ürəyimə,
Sonra da deyirəm döz ürəyimə.

## Yollar

Yollar çalın-çarpaz? Yollar qarışıq,
Hər gün yol gedirəm qulaqlı səsdə.
Hər yol ayrıcında görünən işıq,
Gözümün nurudur, yolların üstə.

İndi bu yollardan həsrət boylanır,
Hardasan, ürəyim alışıb yanır.
Görən gözlədiyim niyə yubanır?
Daha dayanmaram, o yollar üstə.

Bu yollar çox uzun, çox da qarışıq,
Bəlkə radar da var bu yollar üstə?
Daha səbrim çatmır, dözə bilmirəm,
Yol gözləmək edibdi məni xəstə.

Nəhayət, ümidim, məlhəmim ol, gəl,
Nəfəs ol, ruhumun həmdəmi ol, gəl.
Gəl, axır bu həsrət yetişsin sona,
Ümid çiçəklənsin, əl çatsın sana.

## Sənsiz

Çıxmayırsan bir an belə fikrimdən,
Heç bilmirəm, səni soruşum kimdən.
Yol azmış kimiyəm, gülüm, bil ki, mən
Səni görmədim, anmadığım gün.

Sənsizləşir mənə bil ki, bu həyat,
Sanki boşdur, mənasızdır kainat.
Sənsiz ömrüm olub, gülüm, əmanət,
Səni görmədiyim, anmadığım gün.

Əzizim, uzaqdan əsən yeləm mən,
Həsrətdən alışan ayam, iləm mən.
Eşqinlə ötüşən bir bülbüləm mən,
Səni görmədim, anmadığım gün.

**Duyğularım**

Sən hardasan o yerlərdə var deyiləm,
Düşündüyün başı qarlı dağ deyiləm,
Səmalardan uçub gələn şar deyiləm.
Qanadları qırıq quşdu duyğularım,
Görən indi hara uçdu duyğularım?

Gözlərimi xəyallarla bağlayacaq,
Olanlardan hərdən küsüb ağlayacaq.
Bəzən coşub dəniz kimi çağlayacaq,
Bəzən də heç xatirəsi qalmayacaq duyğularım.

Sən getdiyin bu yollarla baxmaq çətin,
Sən olmadan bu həyatda qalmaq çətin.
Alovlanıb gizli-gizli yanmaq çətin,
Amma ki, sən çox mətin ol, duyğularım,
İstəyim ol, qüvvətim ol, duyğularım.

Öz haqqınla işıq salın ürəyimə,
Darda olsam, tezcə çatın köməyimə.
Doğmalarım dəstək olsa əməyimə,
Mərdliyimlə dayağımdı duyğularım,
Gələcəyə mayaqımdı duyğularım.

Ulu Tanrım sən böhtandan uzaq eylə,
Üzümü də hər iki cahanda ağ eylə,
Ailəmi, əzizlərimi də sağ eylə.
Mən də coşum nəğmə qoşum duyğularım,
Düşmənlərin bağrın deşim, duyğularım.

## Dünya

Dünya bir qumardır: udan, uduzan,
Uduzub xəyala dalana yazıq.
Taledi əlinə düşərsə üç tuz,
Əlində üç altı qalana yazıq.

Çılğın duyğuların oduna düşdüm,
Söz sərraflarının yadına düşdüm.
Yaxşı ki, yaxşılar yadına düşdüm,
Poeziya dünyası özəl dünyalı,
Qanan insanlar üçün gözəl dünyadı.

Gah aşkar, gah gizli görüşləri var,
Taleyə yazılan gərdişləri var.
Həyatın hər cürə vərdişləri var,
Gəlişi gözəldi, gedişləri var.
Süleymanı yola salan dünyadı,
Amma yenə canlı qalan dünyadı.

## İstərəm

Zülm edirsən könlümə mən onu azad istərəm,
Nə istərəm ki, səndən hərdən yada sal, istərəm.

Həbs etmisən ruhumu əllərin altında gülüm,
Nə istəyim ki, səndən ruhumu azad istərəm.

Çıx get həyatımdan getməyə ürəyim gəlmir,
İndisə qırdığın qəlbdi, hərdən et şad istərəm.

Sarıgül, dünya gözəl, sən də gözəllik aşiqi,
Bundan sonra at kədəri, at qüssəni, ruşunu azad istərəm!

## Səbr et

Ey könül, ağlama, can, hələ səbr et,
Səbr ilə səni anlayar qanan hələ səbr et.

Hicran yolunun min bir əzabın çəkəcəksən,
Olsan da əgər könül zimistan hələ səbr et.

Əlbətt yetəcək vəslinə qismətdə o varsa,
Səbr ilə çatar arzuya insan, hələ səbr et.

Aşiqlər üçün səbr eləmək çətindir, çətin,
Amma ki, gərək səbr edəsən olasan mətin.

Əzaba qatlaşanın müjdəsi var, Sarıgül, inan,
Çünki şirinliyi də budur, bax, əziyyətin.

## Xəbərsiz

Xəyalında sevmək çətindən çətin,
Nəticəsi olmaz bu məhəbbətin,
Gərək ki, olasan bu yolda mətin,
Sənə bağlanıram səndən xəbərsiz.

Bu nə duyğu seli tufan eləyir,
Ovsunlu sevdalı bəyan eləyir.
Görən nə söyləyir, dünya nə deyir…
Sənə bağlanıram səndən xəbərsiz.

Kükrəsə bu ümman yuxun qarışar,
Ağatlı şahzadə nağıldan çıxar,
Səni tanıyanlar ağıldan çıxar,
Sənə bağlanıram səndən xəbərsiz.

Sevənlər qovuşar görüş yerində,
Duyğular dillənər hələ dərində,
Sən də bağlanırsan günün birində,
Sənə bağlanıram səndən xəbərsiz.

Ürəyim tək sənə duydu ehtiyac,
Qəlbim təşnə, yanıq, sevgiyə möhtac,
İstəsən qəlbini iç dünyama aç,
Sənə bağlanıram səndən xəbərsiz.

## Zəng elə

Bir gün zəng elə mənə,
İldırımlar çaxanda.
Ürəyin darıxanda,
Qürurunla daşlaşan
Ürəyin olaram mən,
Darıxmağa qoymaram.

Bir zəng elə mənə,
Sevmək qəbahətdisə,
Hətta cinayətdisə,
Qoy zindana atsınlar,
Lap canımı alsınlar.
Ruhumla yaşayacaq,
O yumşaq əllərin,
O dağınıq tellərin,
Sevgi dolu gözlərin,
Küskün, acı sözlərin.

Bir gün zəng elə mənə,
Demə axı gecədir.
Soruş keyfin necədir?
Mən də danışım
Sənə arzumdan, istəyimdən,
Səni istəməyimdən…

Diqqətlə qulaq asım
Füsunkar nəfəsinə,
O çağlayan səsinə,
Dediyin hər bir sözü
İnan, əzbərləyirəm,
Hey səni gözləyirəm.
Nə qədər sevdiyimi
Gizləyərək danıram,
Tək sənə inanıram.
Səni inandırıram,
Səni hər an anıram,
Sənsizlikdən yanıram.

**Sən məni qısqan**

Qoy mən inanmayım bu ayrılığa,
Bir çinar yarpağı budaqsız qalar.
Əgər qısqanmasan bu sevdamızda,
Bir istək, bir arzu yarımçıq qalar.
Əgər sevirsənsə sən məni qısqan,
Qoy mən də sevinim, inanım hər an.

Məni qısqandığın xoşdu mənimçün,
Qısqanmayan ürək daşdı mənimçün,
Bu duyğu gözlərdə yaşdı mənimçün.
Əgər sevirsənsə sən məni qısqan,
Məndə bu duyğuya sevinim hər an.

Hara gedirəmsə zəng elə, danış,
Hər nə edirəmsə işimə qarış,
Hər addım başında hardayam soruş.
Telefon əlimdə izdənsin hər an,
Gördüyün hər kəsə sən məni qısqan.

Ay ömrüm, gəl hirslən, səs sal hər yana,
Gəl, meydan oxuyaq hər bir insana,
O qədər qısqan ki, yığılım cana,
Sev görüm nə qədər sevilər insan,
Gördüyün hər kəsə sən məni qısqan.

Sev məni ürəkdən, aşiq ol mənə,
Bitməyən istəklə layiq ol mənə,
Sadəcə sev məni, sadiq ol mənə.
Mən də sevdiyimi göstərim sənə,
Qüsursuz məhəbbət arzumdu inan,
Gördüyün hər kəsə sən məni qısqan.

## Səni itirməsəydim

Bu sevginin yolunda çox yandım, çox közərdim,
Sığınıb xəyallara, acılara dözərdim.
Keşməkeşli dünyadan inan sənsiz bezərdim,
Leylinin xəyalıyla Məcnun kimi gəzərdim,
Səni itirməsəydim, səni itirməsəydim.

Qəlbinə dəyən olsa, inan başın əzərdim,
Ayağın dəyən yeri addım-addım gəzərdim,
Sən yoxsansa dünyamda, dağlar qədərdi dərdim.
Səninlə bir ağlayıb, səninlə bir gülərdim,
Kaş deyirəm əzizim, səni itirməsəydim.

Əgər mənim olsaydın, məni unutmasaydın,
Bir ömür yollarına hey qızılgül düzərdim,
Tənha, yalnız qalanda həyatımdan bezərdim.
Hər ağrıya, acıya inan, mərdcə dözərdim,
Səni itirməsəydim, səni itirməsəydim.

## Sevgi yağışı

Bir sevgi yağışı istəyir könlüm,
Elə yağa-yağa islada məni,
Elə islada ki, çağlayan ömrüm,
Sızlayan ürəyim, ağrıyan qəlbim,
Seçgi yağışıyla səngiyə bilə.

Bu sevda yağışı, arzu yağışı,
Yuya, təmizləyə toxu-dumanı,
İllərin həsrəti təmizə çıxa,
Arzu, istəklərim lap üzə çıxa.

Bəlkə varağlayaraq yaxın keçmişi,
Xatırlaya bilək yada düşmüşü,
O keçmiş ağrını-acını silə,
Şiş basmış illərim yenidən gülə.
Bir sevgi yağışı istəyir könlüm,
Qaçıb gizlənməyəm ağac altında;
Acılı günlərim silinənədək,
Dumanlı illərim xatırlanana,
Çənli xatirələr aydınlaşana,
Könlümdə, beynimdə işıqlar yana,
Qəlbimdə yaşamda arzu oyana.

Yağışıyla parlaya islanan könlüm,
Sevgi atəşiylə sislənən könlüm.
Sevinə, oynaya, gülə ürəkdən,
Bəlkə o sızıltı keçə ürəkdən.
Hicrana, həsrətə son qoya yağış,
Asəfim, son çarə sevgi yağışı.
Kömək et, yoluna qoyaq bu işi,
Nəzərə almayım qarı, ya qışı.
Tez düşüm yollara yanına gəlim,
Sevincimi sənlə mən yarı bölüm.

Dərman, iynə çarə bir yerə qədər,
Ayırmasın bizi qoy qüssə-kədər.
Sevgi atəşinin, istək, vusalı,
Tanrı çox görməsin ölənə qədər.
Ağrısız yaşayaq ölənə qədər,
O haqq dünyamıza gedənə qədər,
Gedənə qədər.

**Məni unut**

Yaddan çıxım, uzaq düşüm ürəyindən,
Yanır qəlbim, ağlar qalır gileyindən,
İstəmirəm, gileylənmə taleyindən.
Artıq ömrüm sona yetir, məni unut,
Xəyalında məni bitir, məni unut.

Həsrət ilə məndən uzaq çəkmə cəfa,
Heç dönməsin mənsiz anın güclü aha,
Bu dünyanın insanında yoxdu vəfa.
Məsləhətdi səndə artıq gəl insafa,
məni unut.

Pəncərəyə şaxta vuran naxış kimi,
Durub hərdən etdiyin bir yanlış kimi,
Uzaqlardan boylanan bir baxış kimi,
Uzun yollar yoracağam, məni unut.

Mən sevəcəm ikimizə yetən qədər,
Bürüməsin ürəyini qüssə-kədər,
Mən deyirəm sən ömrünü etmə hədər.
Bax, atəşsiz yanacağam, məni unut,
Sənnən ayrı qalacağam, məni unut.
Ölənədək səni, səni anacağım,
məni unut.

## Ömrün hər fəslində bir dayanacaq

Bu qarlı dünyada donan mən idim,
Günəş tək əlini mənə yetirdin.
Susuz səhra kimi yanan mən idim,
Könlümün başında çiçək bitirdin,
O vaxtdan hər günüm keçir bir təhər…

Pərvanə eşqindən yanar çıraq da,
Səndən ümudimi üzə bilmirəm.
Səndən ayrılıqda, səndən uzaqda,
Sənsizliyə bil ki, dözə bilmirəm,
Ömrün hər yaşında bir dayanacaq!

Yaşın bu çağında ömrün qəsdi nə?!
Dərk edə bilməsən bunu hələ sən…
Təsaduf çıxmısan yolun üstünə,
Vədəsiz açılan qönçə kimi sən,
Ömrün hər fəslində bir çiçək ətri…

Eşqimin həvəsi başımdan aşır,
Gəl ki, bölünəsi bir dərdimiz var…
Bəlkə də ətəkdən tökək bu daşı?..
Gör bizim nə qədər yaş fərqimiz var…
Ömür hər fəslində bir dayanacaq…

## Röyam

Xəyaldır ömrümə dönüb gəlməyin,
O qədər yuxuma gələcəksən sən…
Onsuz da oyanıb hər səhər tezdən,
Bax, yuxu olduğun biləcəksən sən.

Nə zaman vədəsiz gəldin yuxuma,
O zaman dağıldı, pozuldu röyam.

Sən könül evimin sarayın yıxdın,
Qəm doldu gözümə pozuldu röyam.

İtirdim illəri vaxtsız qocaldım,
Bədən qocaldıqca ruhum ucaldı,
Könlümün gözünü boran-qış aldı,
Yuxulu gözümdən bac aldı röyam.

Qəflət yuxusundan oyatma məni,
Hicranın qəminə boyatma məni.
Dərdimdən ayırıb, soyutma məni,
Oyanıb gözümdən yol aldı röyam.

**Ağlayaq**

Deyəsən sən məni itirəcəksən,
Səs salma oyanar yuxulu quşlar,
Bir azdan göylərin tufanı başlar,
Qoy, bizi görməsin ürəyi daşlar,
Bağla pəncərəni qoşa ağlayaq.

Bir zərif çiçəyəm dözmərəm qışa,
Ölmək istəyirəm səninlə qoşa.
İstərəm, ay ömrüm, yaşa, yüz yaşa,
Bağla pəncərəni qoşa ağlayaq.

Səni and verirəm əziz Qurana,
Səni and verirəm yazı yazana,
Gəl əl-ələ verək yazı pozana,
Bağla pəncərəni qoşa ağlayaq.

Ay ömrüm, gəl qırma zərif qəlbimi,
Gözüm səndən başqa görmür heç kimi.
Sən oldun bir ömür qəlbin həkimi,
Bağla pəncərəni qoşa ağlayaq.

## Yuxular

Sehirli nağıl tək yuxularına,
Məni unudanda girə biləydim.
Yuxudan duranda səni görməkçün,
Xəyala çevrilib səni görəydim.

Görəydim necədi halın-əhvalın,
Necədi görəsən arzun-xəyalın?
Hansı notla köklənibdi əhvalın,
Həzin musiqi tək çala biləydim.

Yaxşı ki, əzizim, bu yuxular var,
Yayda görürsən ki, həzin yağır qar.
Aman, boş xəyaldan axı nə çıxar!?
Kaş ki, yuxudaca qala biləydim.

Girəydim yuxuda kaş otağına,
Çiçəklər səpəydim mən yatağına,
İlıq öpücüklər sərt yanağına,
Yuxunda əbədi məskən salaydım.

Heç olmasa xəyalında qalvydım,
Şirin arzu kimi, bir istək kimi,
Məndə bu dünyadan ilham alaydım,
Kaş ki, yuxundaca donub qalaydım.
*17.10.2010*

## Bəlkə də…

Bizi görüşdürdü nigaran yollar,
Yollar ürək kimi boşalar, dolar.
Allahın işini nə bilmək olar,
Bəlkkə də bu görüş məhəbbət oldu.

Bəlkə Tanrı payım, könül ruzumsan,
Bəlkə də Tanrıya çatan arzumsan,
Bəlkə də sən mənim alın yazımsan,
Bəlkə də bu görüş məhəbbət oldu.

Yaranan ülfəti sən kəsmə hələ,
Taledən, qismətdən sən küsmə hələ,
Əlvida deməyə tələsmə hələ,
Bəlkə də bu görüş məhəbbət odu.

Ürəyim az qalıb yerindən çıxa,
Həmdərd aramışam ömür boyunca.
Qoy, bir də üzünə baxım doyunca,
Bəlkə bu təsadüf məhəbbət oldu.

## Hicran oduna

Məni möhnətə salan kaş yana hicran oduna,
Necə ki, mən yanıram həsrəti hicran oduna.

Yalana, boş söhbətə uyma, bu cahanda daha,
Görərsən yandı könül bir acı böhtan oduna.

Eşit, ey əhli bəşər, unutma heç vaxt özünü,
Dəyməz heç yanmaginən bir qanmaz insan oduna.

Yetər üzmə özünü yaşa, yarat arzuları,
Həsr elə söhbətini bir gülü xəndan oduna.

Sargül, dünya yarandı ilahi eşq ilə,
Dəyməz heç əzab çəkmək lənətlik insan oduna.

## Sənsiz

Gənckən üşüməzdim şaxtada-qarda,
İndi üşürəm, donuram sənsiz.
Bir tənha quş kimi sorağın ilə,
Hər kola, ağaca qonuram sənsiz.

Mən arzu idim, bir istək idim,
İndisə xəyala dönürəm sənsiz.
Diqqət görməyəndə, sevilməyəndə,
Kövrəlib, üşüyüb, donuram sənsiz.

Gənclik uzaqlaşdı, ağrım-acım çox,
Hərdən zəng edənim, hal soranım yox,
Qızlarımdan başqa heç duyanım yox,
Bulud tək boşalıb, doluram sənsiz.

## İstərəm

Bağ salıb, barından doyunca dərib,
Şərəfli bir yola çıxmaq istərəm.
Həyatda əziyyətlə qazandığımı,
Övladlarımla paylaşmaq istərəm.

Mənə dəyər verən hər bir insana,
Əziz dostum tək qaynaşmaq istərəm.
Qəlbi kinli, xəbis, nankor insandan,
Ayağım tutduqca qaçmaq istərəm.

İstərəm dünyamız firavan ola,
Hər yerdə rahat bir güzəran ola,
Gecə də, gündüz də çırağban ola.
Sonra göyərçin tək mavi səmada,
Hey uçmaq, uçmaq, uçmaq istərəm.

## Sən

Sən baharda təzə açan qönçəsən,
Çox kövrəksən incələrdən incəsən,
Sən ömür bağçamda aşan qönçəsən,
Sən söylə mən onu qurudarmı?

Kol dibində bənövşə tək düzülüb,
Əl vurarsan incəlikdən üzülüb,
Bahar gülləri tək zərif güzülüb,
Səncə o dəstəni heç atarammı?

Sən ürəksən arzuların məskəni,
Sən diləksən arzularam mən səni,
Səndən başqa mən sevmədim kimsəni,
Səni ürəyimdən heç atarammı?

Sən olmadan dünya mənə boş gəlir,
Sənli hər bir duyğu mənə xoş gəlir,
Sən olanda ruhum belə dincəlir,
Ruh dünyama heç haram qatarammı?

Sənsən bu ömrümün şux təranəsi,
Sənsiz bil, ömrümün olmaz nəşəsi,
Ürəyimdəsən qəlbimin guşəsi,
Mən ora kimsəni heç qoyarammı?

## Əlvida

Deyəsən səfası bitdi ömrümün,
İndi dağ çıxaram düzə əlvida.
Gözə duman çökür, başa qar yağır,
Bahara əlvida, yaza əlvida.

Duyğuma hər zaman müqəddəs dedim,
Çoxu istəmədim, aza bəs dedim,
Övladın üstündə azca əs dedim,
Dedim nə varsa var, aza əlvida.

İndi öz kökündən üzülən mənəm,
Yağış damlası tək süzülən mənəm,
İndi nə sən sənsən, nə də mən mənəm,
Biz ki, biz deyilik bizə əlvida.

Ay canım, dərdlərdən sızlayır yaram,
Məni əzablara çox saldı zaman.
Zülmət ürəkləri işıqlandıran,
Yanıb da köz olan gözə əlvida.

## Nidalar

Pıçıltılar var ki, qulaqbatıran,
Haykırtılar olur bəzən boğunuq.
Baxışlar var sanki tufan yatıran,
Tellərin də fikrin kimi dağınıq.

Leysanlar var sanki səhra doyuran,
Hərarət var ondan dərya quruyar.
Görüşlər var keçib gedən, ayrılan,
Xatirə var bəzən özün unudan.

Salamlar var, iç üzündə əlvida,
Görüşlər var, soyuqqanlı, xəyanət,
Sanki nizədir qoyulan hər nida.
Bunun da sonunda gəlir əlvida,
Nidalardan yaralıdır məhəbbət.

## Görüb

Bu gecə dilbərimi sevgiyə amadə görüb,
Eşqimi açdım ona könlü təmannadə görüb.

Dedim, ay gül, mənə eşqin verib aləmdə qanad,
Zövqü dünyanı bəşər daima mənada görüb.

Oyananda yuxudan barışdım xəyalın ilə,
Sevgili yarını aşiq yenə röyada görüb.

Bəzi məqamlarda həsrət odunu sübhə qədər,
Çəkir sinəyə dağı qəhri bu xanədə görüb.

Aman Allahım, yenə idraka varınca könül,
Məni odlara salan nadanı fitvada görüb.

Sarıgül, qıyma cana, at başdan qayğıları,
Təsəlli tap cananı, sən yenə röyada görüb.

## Qayıtma

Gecikmisən qatar gedib bayaqdan,
Aramızda nağıl bitib soyuqdan.
Artıq xəbər də yox tənha qayıqdan,
Sadəcə duyğuyla barış, unutma,
Cəzalısan, daha gecdi, qayıtma.

Artıq boylan sadəcə sən qıraqdan,
Yaxın gəlmə daha boylan uzaqdan.
Sonu ölüm olsa keç yaşamaqdan,
Hislərinlə yaşa artıq ovutma,
Cəzalısan, daha gecdi, qayıtma.

Bu cəzanı ömür boyu çəkəssən,
Hətta gəlib qarşımda diz çökəssən.

Mənə baxıb göz yaşını tökəssən,
Cəzalısan, daha gecdi, qayıtma.

Qayıtsan da bütün çaban əbəsdir,
Artıq duyğu ölüb qalan həvəsdir,
O odlu qəlb indi quru qəfəsdir.
Çəkdirdiyin əzabları unutma,
Daha yol bağlıdır, geri qayıtma.

## Aman

Baxışın ovçu təki qəlbimi ovladı yaman,
Alıb ruhumu məndən gör necə tovladı aman.

Verdim o an qərarı könlüm alovlandı yaman,
Qohum eviydi ora başıma fırlandı tavan.

Qolunda ki, saatın işığı düşdü gözümə,
Vallahi könlüm quşu alova tuşlandı haman.

Sarıgül inanmadı bu ani tutquya ki,
Amma bu könül işi başımı fırlatdı yaman.

## Gəl

Mən səni yazmışam duyğularıma,
Gəl, çıx son qoyulsun intizarıma.
Gəl ki, qırılmasın son ümidlərim,
Gəl ki, unudulsun bütün dərdlərim,
Gəl ki, biz uçuraq bütün sədləri.

Çıx gəl, ürəyimi vurmasın sazaq,
Çıx gəl, bəxtimizi birlikdə yazaq.
Gəl ki, pəncərəmi döyməsin sükut,
Gəl ki, səmamızı tutmasın bulud,
Unut acıları, sən də gəl, unut.

Elə gəl, bax olsun qış da yay bizə,
Elə gəl, xoşbəxtlik olsun toy bizə.
Gəl ki, sevinclə açaq səhərimizi,
Gəl birgə seyr edək şəhərimizi,
Gəl ki, dünənləri yada salmayaq,
Gəl ki, bundan sonra tənha qalmayaq.

## Sevirəm səni

Darıxıram bir an səni görməsən,
Yaşam maraqsızdı səni sevməsəm.
Ölərəm yanında ola bilməsəm,
Mən dünyalar qədər sevirəm səni.

Artıq bir ömürdü sən yanımdasan,
Hər an, hər dəqiqə sən ağlımdasan.
Gözümü yumuram zəyalımdasan,
Mən dünyalar qədər sevirəm səni.

İnşallah, bir ömür olarıq,
Bala, nəvələrdən xoşbəxt olarıq,
Bircə qocalarıq yaşa dolarıq,
Mən dünyalar qədər sevirəm səni.

## Qış yuxusu

Açdım ürəyimi sənə yuxuda,
Yuxudakı kimi ola kəş həyat.
Hamısın deyərdim üzünə bir-bir,
Amma qəribədir, çox qəribədir,
Bax yuxu fərqlidir real həyatdan.

Toxun kipriyimə kiprikdərinə,
Açım gözlərimi gözünlə sənin.
Azsam yuxu donlu çənli yollarda,

Tapım izlərimi izində sənin,
Açım gözlərimi gözündə sənin.

Ayın beşiyində yatım, oyanım,
Yuxumda göy qurşağına boyanım.
Pənbə buludlarda qoy xumarlanım,
Qalım qucağında əngin göylərim,
Açım gözlərimi gözündə sənin.

Sevgim, həqiqətin, bir də istəyim,
Beləcə yuxuda sıralanıbdı.
Real dünyadakı acı həqiqət,
Yuxulu dünyamdan qidalanıbdı.

Bax gəldin yuxuma gözümü yumdum,
Kipriyim geriyə yolu bağlayıb.
Yuxumda qalmağı ürəkdən umdum,
Acı həqiqətlər könlüm dağlayıb,
Bir misra gör necə yolu bağlayıb.

Qurma o saatın zəngin bu gecə,
Oyatma, qoy yatım qalım sakitcə.
Titrək kipriyindən not götürmüşəm,
Həzin bir musiqi çalım bu gecə,
Elə yuxundaca qalım be gecə.

Arzuyla köklənən yuxularımdır,
Eşqə dəstək olan yuxularımdır,
Qəlbi kövrək olan yuxularımdır.
Ay mənim yuxulu lal xəyallarım,
Yuxuda olsa bal xəyallarım.

Birdən həqiqətə çevrilər yuxun,
Nədir belə olsa qorxudan səni?
Durum başın üstə… necə səhnədir?

Bir səhər yuxudan oyatsam səni,
Yenə qış yuxusu deyərsən yəqin.

Oyan, ey sevdalı gözüm, yuxudan,
Aşkar görəcəyin gərəkdir sənə.
Ayıl ki, görəsən real dünyanı,
Eybi yox, deyərsən yuxuymuş yenə,
Qış yuxusu şirin gələrmiş demə.

Səni bənzətmirəm daha yuxuya,
Real həqiqətə daha yaxınsan.
Belə istəmirəm bir çoxu kimi,
Yaşayaq bu sayaq, ölək bu sayaq.
Bu qış yuxusundan daha oyanaq,
Duraq bir-birimizə bir ömür dayaq.

## Sevgi ağlayır

Nədəndir titrəyiş, nədir bu göynək?
Könlümdə həzin bir sevgi ağlayır.
Dayanıb yol üstə boyun bükərək,
Könlümdə həzin bir sevgi ağlayır.

Damır asta-asta qəm ürəyimə,
Yağmurlar çiləyir nəm ürəyimə,
Sevgisi yazılıb kəm ürəyimə,
Könlümdə həzin bir sevgi ağlayır.

Gülüşü üzündən gen düşən könlüm,
Həsrətdən telinə dən düşən könlüm,
İndi ağlar qalıb mənim şən könlüm,
Könlümdə həzin bir sevgi ağlayır.

Açا da bilmirəm sirri heç kimə,
Elə gizlicə də vur sarı simə,
Bəlkə də bir doğru sevgi eşqinə,
Könlümdə həzin bir sevgi ağlayır.

## Ummuram

Gözümdə bahar tək yaşıldı sevgi,
Məni zirvələrə daşırdı sevgi.
Sinəmdə sel kimi coşurdu sevgi,
Mən daha kimsədən sevgi ummuram.

Qaynar bulaqlarım içilməz oldu,
Yandım, tüstüm çəndən seçilməz oldu.
Bu necə bəladı keçilməz oldu,
Mən daha kimsədən sevgi ummuram.

Həsrətin qəlbimi eylədi viran,
Ayrılıq sözündən olmuşam peşman.
Sənli xəyallarla gəzirəm hər an,
Mən daha heç kəsdən sevgi ummuram.

## Səni tapmışam

Sən bu həyatımın işıqlı üzü,
Gecə həsrətimin vüsal gündüzü.
İnan ki, yığıla əllisi, yüzü,
Məni itirmişəm səni tapmışam.

Artıq bu sevdada biixtiyaram,
Ruhum çox rahatdır səninlə varam.
Artıq səni bil ki, heç unutmaram,
Nə də bu istəyi ucuz tutmaram.

Artıq başqa duyğu gərəyim deyil,
Səndən başqa heç kəs diləyim deyil,
Səninçün döyünməyən ürəyim deyil.
Özümü itirib səni tapmışam,
Sənin xəyalınla uçan bir quşam,
Artıq sənə, sənə aid olmuşam.

## Qısqanmışam

Sevgi nə olduğun bilmədiyim vaxt,
Sənin həsrətinlə alovlanmışam.
Məhəbbət odunu duymadan belə,
Səni sətirlərlə yada salmışam,
Səni sətirlərə də qısqanmışam.

Onda nə manitor vardı, nə kələk,
Hərə insan donlu sanki bir mələk.
Oynayırdıq uşaq tək, oyuncaq tək,
Saçında oynasa bir dəli külək,
Səni küləyə də qısqanmışam mən.

Tək ürək istərdik bir-birimizdən,
Onu təmənnnasız verərdik həmən.
Amma təmiz duyğu dağ zirvəsində,
Ona çatmaq üçün çox dırmanmışam,
Səni zirvəyə də çox qısqanmışam.

## Əmanət ürək

Qırılıb töküldü ümid də, mən də,
Bir dünya xatirə gizlədim səndə.
Elə ağlatdın ki, səssiz-səmirsiz,
Gözlərimdə qaldı o, gizlin nəm də.
Atəşim tükənib özüm sönmüşəm,
Mən sənli yaşayan həsrət görmüşəm.

Gəl indi ürəyi sən ver əmanət,
Bu həm məsuliyyət, həm də cəsarət.
Mənim duyğularım sənə tanışdı,
Gəl, əl-ələ verək, duyaq dəyanət.
Sən mənim dünyamsan bunu bilirsən,
Sevgimiz də olsun buna zəmanət.

Mənim sənə ürək sözüm sıra-sıra,
Kimsə yana, kim qınaya, kim ayıra.
Amma bizi ayırmasın nadan əli,
Onda olar ikimizdən biri dəli.
Çünki ürək əmanətdi, get axıra,
Qıyma, qoyma kimsə bizdə ara vura.

## Sənsən

Bir dəli ürəyin dənizi oldun,
Hara yön saldınsa ürəyə doldun.
Sanma ki, həsrətdən saraldın, soldun,
Mənim sevincim də, qəmim də sənsən,
O dənizdə gəzən gəmim də sənsən.

Elə bağlıyıq ki, ürək ürəyə,
Gərək daim duraq kürək-kürəyə.
Biz qonaq gəlmişik vuran ürəyə,
Mənim sevincim də, qəmim də sənsən,
Sahilsiz dənizəm, gəmim də sənsən.

Gülüm, ilk baharın yağmurusan sən,
Qəlbimə yağalı heç qurumursan.
Sən bir ilk bahar çiçəyisən ki,
Ətrini duyalı unudulmursan.
Sarıgül Yağmurun çiçəyi sənsən,
Heç vaxt unudulmayan göyçəyi sənsən.

## Gecələrim

Sənli ömür, bil, ömrümə dayaqdır,
Yolum üstə əbədi bir mayakdır.
Sənli ömür məhəbbətlə oyaqdır,
Ona görə yatmıram ki, gecələr.

Amma keçir gecələrim lal kimi,
Yuxularım şirinləşir bal kimi.
Həm də ki, sənlə xəyallar bal kimi,
Balı dadıb yatmıram ki, gecələr.

Sən ömrümə varlığınla bəzəksən,
Həyatımda köhnəlməmiş çiçəksən.
Hər gecəmə, gündüzümə bəzəksən,
Nə olsun ki, yatmayıram gecələr.

Aman Allah, nə uzundur gecəələr,
Adam yatar, rahatlaşar, dincələr.
Uzandıqca ağla gəlir gör nələr,
İlə dönür bitməyir ki, gecələr.

## Həsrət

Sevda olub ürəyində qalalı,
Dönüb getmir gözlərimdən xəyalı.
Uzandıqca ömür, tale, bəxt yolu,
Sonu bitmir, uzanırmış bu həsrət.

Bir kədər var min cəhənnəm dadında,
Saxlamışam xatirəni yadımda.
Odlandıqca bu sevdanın odunda,
Atəşiylə qızınırmış bu həsrət.

Gözlərimə yarpaq-yarpaq tökülüb,
Gözlərimdir yollarına dikilib.
Hansımızın əllərinə bükülüb,
Alnımıza yazılıbmış bu həsrət.

Bir çiçəyəm kipriyindən qopmuşam,
Çox kövrəyəm ürəyinə hopmuşam.
Sarıgül Yağmur, yoğurmuşam yapmışam,
Qazandığın qazanıbdı bu həsrət.

## Sənsizlik

Səninçün Tanrıdan ömür dilədim,
Ömrümdən kəsərək ömrünə versin.
Səni görmək üçün uzaq yol gəldim,
Sənsiz keçirdiyim zamana  heyif.

İndi verərsənmi illəri mənə?
Sənsiz keçirdiyim günləri mənə.
Payıma sənsizlik düşəcək yenə,
Gecələr yuxuma gəlmədin yenə.

Tələsir əllərim sənə yazmağa,
Yadıma səninlə söhbət düşəndə.
Döyünür sinəmdə yatan bu ürək,
Qismətsə, deməli, qismət görüşək.

## Qayıdacaqsan

Bilirəm sən mənə qayıdacaqsan,
Unutmaq istəsən unutma məni.
Üst-üstə yığılar mənsiz günlərin,
Mənli çağlarını xatırlayarsan.

Bilirəm sən mənə qayıdacaqsan,
Bir dəfə yolumu küçəndən salsam,
Hər gün eyvanından boylanacaqsan,
Bilirəm sən mənə qayvdacaqsan.

Mənsiz pəncərəndə güllər solacaq,
Mənsiz gözlərinə yaşlar dolacaq.
Gülü göz yaşınla sulayacaqsan,
Bilirəm sən mənə qayıdacaqsan.

## Özəldi

Hər yazdığım şeirlərim özəldi,
Öz fitri istedadımdandı, gözəldir.

Şeir aləminin taxtı, tacı sultanı var,
Gəl, inkar etməyək ki, şeriyətdə qəzəldir.

Aşiqlərin əvvəldən olub düşməni həsrət,
Biganə qalmaz buna heç kəs çünki özəldir.

Gözlərində aləm olur nurlu işıq zülmətdə belə,
Çün ilahidəndir bu qismət, eşq gözəldir.

Təbdir verilib ilahi müjdəsidir aqillər üçün,
Sarıgül Yağmur yazdı, bədahətən şeiri qəzəldir.

## Bu gecə

Yenə röyada gördüm sevgili yarı bu gecə,
Dərdimə çarə qılan ruhu baharı bu gecə.

Ürəyim oda düşdü bir baxışından o yarın,
Unutdum qüssə-qəmi, dərdi-qubarı bu gecə.

Deyirlər sevgi qumardı, qismətdi belə,
Kim udar, kim uduzar, necə ola halı bu gecə.

Yuxumda da çəkindim, əl vurmadım ipək telə,
Nə deyim, nə söyləyim pərişandı halım bu gecə.

Sən gəl ürəyimdə qal, canımı al, canımda qal,
Sıxılıb candan çıxma, damarımda qal bu gecə.

Dolaş sən qanım ilə, canım ilə illa ki,
Çox uzaqlaşma, gülüm, məhz canıımda qal bu gecə.

Sanma Sarıgül səni həbs edir bu halı ilə,
Canımı yaxsan belə sən yanımda qal bu gecə.

## Bezəcək

Nə biləydik sevgi adlı bu qonaq,
Həsrət çəkib yavaş-yavaş öləcək.
Nə biləydik bu həsrətin sonu yox,
Bir qonaq tək dözməyib bezəcək.

Kədər qalıb qonaq olacaq bizə,
Bu sevgi də gülməyəcək üzümüzə.
Biz heç bir vaxt gəlməyəcəyik üz-üzə,
O həsrətdən sevgi küsüb bezəcək.

Bu sevgi özünü qonaq hiss edəcək,
Diqqət verilməsə küsüb gedəcək.
Özün xatirə dənizinə qərq edəcək,
Bax, o sevgi yavaş-yavaş bezəcək.

Deyəcək son dəfə üzünə baxım,
Yalandan da olsa bir üzük taxım.
Hasardan boylanım, uzaqdan baxım,
Amma ki, hicrandan üzülüb qalxıb,
Bax, o sevgi yavaş-yavaş bezəcək.

Divara kiçik bir nişanə taxıb,
Yorulmadan kənardan ona baxıb.
Əlqərəz o sevgi bivəfa çıxıb,
Həmişəlik bizi də tərk edəcək,
Bizi gözləməyib küsüb gedəcək.

## Özgənin olma

Səni zirvələrin tacı bilmişəm,
Gəl, mənim eşqimlə özgənin olma.
Ağlayıb gözümü gizli silmişəm,
Sən mənim gözümlə özgənin olma.

Ayrılıq ömürlük qəmimdir mənim,
Gözlərin zülmətdə şamımdır mənim.
Qəlbimin fərəhli sənindir sənin,
Sən mənim sevgimlə özgənin olma.

Səni bu dünyamda günəşim sandım,
Gah gizli saxladım, gah da ki, dandım.
Eşqimlə alışdım, odumla yandım,
Sən mənim odumla özgənin olma,
Sarıgül Yağmura biganə olma.

**Çinar**

Sən getdiyin yerdən keçirdim dünən,
Çaxdılar başıma sanki dünyanı.
Çinarlar dil açıb soruşdu məndən,
Niyə tək gəzirsən sən bu məkanı?

Bəlkə də bu sual isidər məni,
Qışın baxışından bahar üşüyür.
Gəlmə bu yerlərə donar bu yerlər,
Soyuq ürəklərdən çinar üşüyür.

Nə cavab verəydim mən o çinara?
Yeriyib yarpağın birini üzdüm.
Bir anlıq qayıdıb ötən çağlara,
O qoca çinarı bir daha süzdüm.

O ağacdan, yarpaqlar dəymiş üzünə,
Öpmüş saçlarından, yanaqlarından.
Onun üçün əzizdir bu qədər mənə,
Başqa ağacların yarpaqlarından.

## Yoxdusa

Göz yaşını axıtmağa dəyərmi,
Sonunda bir xoş gələcək yoxdusa.
Həm görüşə sevgi deyə bilməzsən,
Əgər onun xoş sonluğu yoxdusa.

Hər kül altda közərənə köz demə,
Hər xatirə qırığına iz demə.
Gəlişi xoş olan sözə söz demə,
Könül alan, qədir bilən yoxdusa.

Gecələr röyamsan bunu bilirsən,
Sabahlar ruhumu çalıb gedirsən,
Sonunda qəlbimi alıb gedirsən,
Etmə, gülüm, qəlbini qan edirsən,
Əgər bir xoş gələcəyin yoxdusa.

## Olmasın

Mənə bəxş etdiyin lal baxışların,
Onları bəzəyən bu naxışların.
Gözümdən süzülən qəm yağışların,
Tənha sildiyimə şübhən olmasın.

Sən gedəni qəm-kədər daşıyıram,
Qaysaqlı yaranı hey qaşıyıram.
Baxma ki, canlıyam mən yaşayıram,
Ruhən öldüyümə şübhən olmasın.

Eşqini könlüm də dustaq eyləyib,
Hər səsin gələndə «ay can» söyləyib.
Allahdan özümə səbir diləyib,
Süni güldüyümə şübhən olmasın.

Ürəyimdə qəm-kədərlə barışıb,
Dərdlərimi öz-özümə danışıb,
Hər səni gördükcə içdən alışıb,
Sənsiz yandığıma şübhən olmasın.

Gör harda qırıldı, harda incəldi?
Gedərəm bəlkə də könlüm dincəldi.
Bax artıq həsrətin özü də gəldi,
Daha getdiyimə şübhən olmasın.

## Qəlbimi

Sənlə keçir günüm ilk bahar kimi,
Gəldin həyatıma ilk nübar kimi.
Sən hələ təmizsən dağda qar kimi,
Səni qoruyacam şirin bar kimi,
Sən də hərdən-hərdən yoxla qəlbimi.

Öpüb qoy gözünə bu bir ürəkdir,
Suçsuz, günahsızdır, o bir mələkdir,
Gəl, dəymə xətrinə yaman kövrəkdir,
Bir körpə uşaqtək saxla qəlbimi,
Hərdən bir zərifcə yoxla qəlbimi.

Dərd demirəm, canım, dərd olar sənə,
Qoy səni qorusun böyük kimsənə.
Azacıq ürəyin yanırsa mənə,
Dərddən yük eləmə özünə, canım.
Mənə dəyərlisən düzü, nə danım?
Səni görməyəndə qaralır qanım,
Sənsiz yaşayamam, Asəf, nə danım?

Keçmişə baxıram çoxdu gedənim,
Sabah da bu günüm olar, dünənim.
Ömür sənin olsun, qayğısı mənim,

Gəl birgə düşünək sabahımızı.
Balalar duymasın bu ahımızı,
Hərdən bir sakitcə yoxla qəlbimi,
Çox da inildətmə bu sarı simi.
*01.05.2015*

**Könül**

Qəhr ilə güllər diyarında olsan da,
Dərddən, fikirdən tarimar olsan da.
Haqsız hücumlara məruz qalsan da,
Səni ayaqlara atmaram, könül,
Heç vaxt qanmazlara satmaram, könül.

Tək qalıb qəmlərə məkan olsan da,
Əziz bildiyindən təkan alsan da,
Sirri pünhan kimi kənar qalsan da.
Ayrılıq önündə səssiz dayannam,
Sən yandığın odda ürəklə yannam,
Xəyalının ətrafında dolannam,
Qədirbilməz önünə sərmərəm, könül.

Duyğun bir dənizdir qəlbim tək ada,
O ada verilməz heç bir vaxt yada.
Hətta tənha qalsam mən bu dünyada,
Sənin qürurunu əymərəm, könül.
Səni yad əllərə qıymaram, könül.

Payızda yarpaq tək saralsam, solsam,
Hər gün bulud kimi boşalsam, dolsam.
Hətta yazda çaxan bir şimşək olsam.
Səni yad əllərə qımaram, könül,
Mən səni kimsəsiz qoymaram, könül.

## Gül-bülbül eşqi

*(Qəzəl)*

Bülbül ah-nalə edib, gül arzu etdi,
Uçdu-uçdu yolu bir güllüyə düşdü.

Bir qönçə dərmək müşkül olub indi çəməndən,
Çünki manitor əsridir, eşq müşkülə düşdü.

Bülbül də dəyişib halını qonur gündə bir gülə,
Gülsə həsrətlə baxır gözəl bülbülə.

Çəmənzar böyük, çox iş düşür indi bülbülə,
Necə bağlansın axı, hansı bir gülə?

Bir qönçə tapmaq işi bülbülə çətin,
Gərək gül seçmək üçün olasan mətin.

Sarıgül, bax bu hal ilə bitməyəcək gülün özləmi,
Bülbülə çəmənzar seçmək də olub indi çox çətin.

Keçmişdə qalan xatirədi gül-bülbül eşqi,
İndi internet əsridir iş düşüb müşkülə.

## Gecəmiz

Dara tellərini, qara gecənin,
Uzandıqca qoy uzansın gecəmiz.
Pıçılda nəfəsin oyadsın məni,
Heç gör bitəcəkmi belə gecəmiz,
Yaddaşdansa itəcəkmi gecəmiz?

Niyə kövrəldin sən yenə bu gecə,
Səsin də titrəyir əllərin kimi.
Ürəyin çırpınar, çıxar yerindən,
Bizə düşmən olar belə gecəmiz,
Sonra peşman olar yenə gecəmiz.

Gecəyə bürünüb yanına gəlim,
Sevincimi sənlə mən yarı bölüm.
Tellərinə tumar çəksin qoy əlim,
Görək belə bitəcəkmi gecəmiz?
Yaddaşdan da itəcəkmi gecəmiz?

## Küsmüşəm

Bir arzu var arzulardan doğulan,
Bir ümid var tənha qalıb boğulan.
Bir ocaq var alt-üst olub dağılan,
Xoş günlərdən əllərimi üzmüşəm,
Bu qismətdən gör nə vaxtdı küsmüşəm.

Getdim doğma qapı açılmaz oldu,
Səhrada su tapdım içilməz oldu.
Bu bir tale yükü qaçılmaz oldu,
Bu acıya gör nə vaxtı dözmüşəm,
Bu gərdişdən gör nə vaxtdır küsmüşəm.

Hara getdi yaxşılığın savabı?
Yeyəmmədik doğma əldən kababı.
Bir şübhəm var tapılmayıb cavabı,
Bəlkə hamı yaxşıdı, bir mən pisəm?
Bu həyatdan gör nə vaxtı küsmüşəm?

## Səndən inciyib

Qayğını həmişə yarı bölərdik,
Hər cür çətinliyə qalib gələrdik.
Bir gün danışmasaq, sanki ölərdik,
Sən sevən qəlbim səndən inciyib.

Düzdür, bu dünya da fanidir, fani,
Dünyada duyğular anidir, ani.

Bax bir gün gələcək dünyanın sonu,
Duyacaqsan ruhum səndən inciyib.

Deyəcəksən axı doymadım səndən,
Heç gəl daha dolanma bu qədər gendən.
Axı nə istədin, ay quzum, səndən,
İncitdiyin qəlbdi, səndən inciyib.

Yollara baxmaqdan gözüm yorulub,
Özüm yox, ürəyim sənə vurulub.
Bir də görəcəksən ürək yorulub,
Sonra dayanacaq səndən inciyib.

**Sevirəm səni**

Darıxıram bir an səni görməsəm,
Yaşam maraqsızdı səni sevməsəm.
Ölərəm yanında ola bilməsəm,
Mən dünyalar qədər sevirəm səni.

Artıq bir ömürdür həyatımdasan,
Hər an, hər dəqiqə sən ağlımdasan.
Gözümü yuman tək xəyalımdasan,
Mən dünyalar qədər sevirəm səni.

İnşallah bu ömürü birgə qalarıq,
Birgə nəvələrdən xoşbəxt olarıq.
Birlikdə qocalıb, yaşa dolarıq,
Mən dünyalar qədər sevirəm səni.

**Bəlkə**

Söylədim yazışaq, o gün yazışdıq.
Qanadı qırılmış quşdan başlayaq.
Dalaşdıq, incidik, küsdük, barışdıq.
Bəlkə biz səninlə başdan başlıyaq.

Biz xoşbəxt olmadıq olanlar kimi,
Əməli yaddaşda qalanlar kimi,
Bəlkə səhv düşübdü tale yazımız,
Qanadı qırılmış quşdan başlayaq,
Bəlkə bu taleni təzdən başlayaq.

Həyat çox gözəldi yaşayan üçün,
Hər şeyi vaxtında başlayan üçün,
Şəri, böhtanı yerində daşlayan üçün,
Gəl bu doğmalığı təzdən başlayaq.
Şeytanı, şarlatanı yerində daşlıyaq.

Çünki bu həyatdı, imtahandı bu,
Biz bu imtahandan üzü ağ çıxaq.
Axı biz doğmayıq ay əziz balam.
Şeytanı yerində daşlayaq çıxaq.
Sarıgül Yağmuru alqışlayaq çıxaq.

**İnana bilmirəm**

İnana bilmirəm illərin belə,
Sürətlə keçdiyi çevrilib yelə.
İnana bilmirəm həsrət göz yaşı.
Toplanıb çevrilib coşqun bir selə.

İnana bilmirəm unutdunmu sən?
Boğulan payızı, donduran qışı.
Unuda bilmərəm ağlayırsanmış
Gözlərindən yağan qəmli yağışı
Gətirdin ömrümə yenə də qışı.

Sən məni tək qoyub getdiyin gündən
Olubdu həmdəmim soyuq otağım
Keçsədə üstündən bax neçə illər

Yenə isitməyir məni otağım
Səsin gəlməyəndə donur otağım.

Yoruldun deyəsən suallarımdan
Əlimdə deyildir inan ki susmaq.
Yenə də sənsən bax məni yaşadan
Bircə səsin gəlsin bəsimdir inan.
Səni sevdiyimə etmə sən güman.

Çəkirəm rəsmini mən misralarla
Qələmim soruşur, bezmədinmi sən?
Deyir ki, ruhuna çox vurur yara
Səni laqeyidliklə çox çəkir dala?
Mənsə qələmimə sakitcə baxıb,
Deyirəm ürəyim, dəymə o yara,
Axı odu yenə dərdimə çara,
Məni qoruyur ki, getməyim gora.

Hə, əziz yoldaşım, sən baxma belə
Susma bir söz söylə sevindir məni.
Ruhum narahatdır, nigaranlıqdan,
Söylə ki, Sarıgül, sevirəm səni
Mən də aşkım deyim tez öpüm sən
İndi anladınmı əzizim məni?

## De niyə qıydın

Yaxından tanımaq istədim səni
Oğurluq eyləyib qəlbimi çaldın.
Sənin heç xəbərin olmadan belə
Məni sən çıxılmaz bir yola saldın.

Oyuncaq duyğuyla oynadın mənlə
Harda rastlaşdıqca sözümü kəsdin.

Hətta oyuncaq da məhəbbət istər
Bax indi necəsən arzuna çatdın?
Bizim münasibəti sən çölə atdın.

Mən axı bunlara layiq deyildim,
Ey məndən uzaqda kef çəkən adam.
Düşündün ki, mənsiz rahat olarsan?
Bax indi qalmısan məndən uzaqda.

Sənlə bağlı olan xəyallarımı,
Yerlə yeksan edib sən çölə atdın.
Birgə keçən o gözəl çağları,
Oduna döndərib təndirə atdın.

Ürəyim əlimə məcbur söyləyir,
Deyir ki, yaz ona mənim sözümü.
O ki, mənə layiq dəyər verməyir.
Daha bağlamaram mən də gözümü.
Sarıgül Yağmur tək deyim sözümü,
Bir daha sınaqa çəkməm dözümü,
Yığışdırram yollardan gözümü.

## Çıx yadımdan nə olar

Çıx mənim yadımdan çıx nə olar, çıx,
Mən sənin yadından çıxdığım kimi.
Daha ardınca da baxa bilmirəm,
Hər gecə şəklinə baxdığım kimi.
Çıx mənim yadımdan çıx nə olar, çıx,
Qapı da açıqdı, pəncərələr də.
Öz adım yadımdan çıxmasın deyə
Adımı yazıram pəncərələrdə.

Çıx mənim yadımdan çıx nə olar, çıx,
Axı sən fikrimi qarışdırırsan.
Görənlər dəlidir deyərlər mənə,
Məni öz özümlə danışdırırsan.

Sən xəyanət etdin yalan danışdın,
Çıx get qəlb evimdən izin qalmasın.
Səni sevdiyimçün utanıram mən,
Elə çıx qəlbimdən bilən olmasın.
Mənim yandığıma gülən olmasın.

## Mən bacarmıram

Bu duyğu qəlbimi yandırıb yaxır,
Nə məni tərk edir sözumə baxır,
Nə də ki, bir anlıq başımdan çıxır.
Onu unutmağı mən bacarmıram,
Qəlbimdən atmağı mən bacarmıram.

Onlu xəyalları ata bilmirəm,
Gecələr sakitcə yata bilmirəm,
Onlu arzulara çata bilmirəm.
Onu unutmağı mən bacarmiram,
Nədə ucuz tutmağı bacarmıram.

Gecələr də yuxum çəkilir ərşə,
Bütün istəklərim çevrilib tərsə,
Öyrənə bilmirəm təkliyə nəysə.
Unutmaq çətindi mən bacarmıram,
Rahatca yatmağı mən bacarmıram.

Unutmaq ölümmü, yoxsa işgəncə,
Yalnız təsəllidir son ümid məncə.
Söylə belə unutmaq olarmı səncə?

Unutmaq çətindi mən bacarmaram,
Nə də ki istəyi ucuz tutmuram.

Baş başa qaldım mən dərdlə, kədərlə,
Hey dolur gözlərim yaşla qəhərlə,
Artıq yaşayıram xatirələrlə.
Unutmaq çətindi mən bacarmıram,
Onu unutmağı mən bacarmıram,
Sarıgül Yağmuram atmağı,
Unutmağı mən bacarmıram.

**Sənin acığına**

Qəfəsdən qanad aç göyə,
Azadlıq gözəldi sən deyə-deyə.
Sevənin ürəkdi ürəkdi deyə,
Bax bircə ürəyi verməyəcəyəm.

Get hara istəsən yaxşı yol sənə,
Onu bil, arxanca gəlməyəcəyəm.
Həsrət qılınc kimi kəssə də məni,
Sənin ayağına enməyəcəyəm.

Bəhanə axtarib hər nə söyləsən,
Susacam qarşinda dinməyəcəyəm.
Bilirəm getməyə çox qərarlısan,
Getmə qal yanımda deməyəcəyəm.

Son dəfə baxacam sənlə göz-gözə,
Artıq gəlməsəm də sənlə üz-üzə.
Sənə dərd ortağım da desəm belə,
Dərdimi səninlə bölməyəcəyəm,
Sarıgül Yağmuram sönməyəcəyəm.

## Xatirə vərəqlənir

Sən elə bilmə ki, sakitləşmişəm,
Səndən danışmaqdan artıq bezmişəm,
Yada kı, həsrətə sənsiz dözmüşəm.
Sənli düşüncələr tərk etmir məni,
Gətirir gözümə dumanı, çəni.

Xatırlamaq üçün mən olanları,
Gərəkdir qayıdam əvvələ bundan.
Yazdığım şerdə nəinki misralar,
Hətta hərflər də bəhs edir ondan.

İllər də tez keçsə səndən xatirə,
Yazdığım şerlər qalacaq mənə.
Laqeyidliyin məni şair eylədi,
Gərəkdir təşəkkür eyləyim sənə.

Şer yazmayanda sənə həsrətim,
Sanki dayanmadan dərd atın çapır.
Hər sənli günlərin xatirələri,
Varaqlar üstündə rahatlıq tapır.
Sarıgül Yağmur havadan nəm qapır,
Qapdığı nəmdən də hey dava qopur.

## Vaz keçəməm

Sən demə təzədən sevmək olarmış.
Tale də təzədən üzə gülərmiş,
Küsüb doğmalardan üz döndərən kəs,
Peşmanlıq hiss edib geri dönərmiş.

Könül qapısını incitməmiş dur,
Salamsız, vidasız belə getmə, dur,

Bilinməz taledir, yan keçmə sən dur.
Sənin də xoşbəxtlik limanındı dur.

Ayrılıq qapını döyəndə açma,
Bir az dərin düşün, zamanımız var.
Nələri yaşadıq biz varaq-varaq
Sənlə yaşanmış zamanımız var.

O payız axşamı qərib axşam da,
Necə doğmalaşdıq, necə bilmirəm?
O isti baxışın, doğma diqqətin,
İncə davranışdan keçə bilmirəm,
Artıq mən səndən vaz keçə bilmirəm,
Sarıgül Yağmuram qəm şərbətin içə bilmirəm.

**Nə yaxşı**

Nə yaxşı ki, görüşdük ömür yollarında biz,
Nə yaxşı qoşa vurdu döyünən ürəklərimiz.
Nə yaxşı başımızı bürüdü sevgi çəni
Durub dala baxmasam inan görməzdim səni.

Xəyal məni apardı illərin həsrətinə,
Sənli gözəl günlərərim çox ilişdi çətinə,
Çətinliklər rast gəldi, bizim kimi mətinə,
Bax bu çətin yollarda tək qoymadım mən səni.

Bir günü sevinçli bir günü qəmli,
Ötdü gənçliyim keçdi dəmbədəm.
Özümüz duymadan, heç hiss etmədən,
Beləcə tərk etdi bizi gəncliyim.
İnan ağrılardan yoxdu dincliyim.

Xəyallar baş alır gedir uzağa,
Artıq bənzəyirəm qəmli qonağa.
Tanrım sındırmasın övladdan bizi,
Bizə əl edərək gedən gənçliyimiz
Nəmli gözlərində itdi gənçliyim,
Şirin nağıl kimi bitdi gənçliyim.

Amma ruhum itirməyib,
Kədər, həsrət gənç ruhumu bitirməyib
Təzyiqlər də inan cana gətirməyib.
Nə olsun ki uzaqlaşdsı gəncliyim,
Şükür hələ də yaşayır xoş izimiz,
Gözəlliyə dəyər verir gözümüz,
Bu dünyadn köçəndə də yaşayacaq izlərimiz,
Sarıgül Yağmur imzasiyla yaşayacaq sözlərimiz.

## Sevgi həsrəti

Beləcə yanacam telinə sənin,
İsladıb süzüləm belinə qədər.
Bir udum su kimi hopub canına,
Axam iç dünyana bulaqlar təki.

Elə coşdurmusan eşqi içimdə,
Bağlar çiçəkləyib, güllər açıbdır.
Sənə sevgi dolu yağışla gəldim,
Önümdə çay donub, sellər qaçıbdır.

Sənə çatmaq üçün, yetişmək üçün,
Yağışlarla dolub axaram gülüm.
Sənə yetişməkçün, qovuşmaq üçün,
Göydən şimşək olub çaxaram gülüm.

Ulduzları içib, ayı doyarsa,
Göyün kəhkəşanın rəngin silərəm.
Günəşin istisin soyuğa tutub,
Sevgimi yağışla sənə çilərəm.

Nəfəsindən çəkib içimə sevgi,
Çevrilib buluda dolaram necə.
Dolaram sözündən, gözündən sənin,
Hey sənə yağaram gündüz və gecə,
Kənardan baxaram yenə sakitcə.

**Gözündə qalım**

Başına dolanım çəkil yolumdan,
Vədəsiz günaha batırma məni.
Qəmli sözlərini düzüb yoluma,
Bu soyuq havada saxlama məni,
Üşüdür bu dünya arzularımı.

Tükədib ömrünü xəyal et məni,
Xatirə anı tək sözündə qalım.
Elə bax, baxışın məhv etsin qəmi,
Ümid bir dəryadır, xəyalsa gəmi,
Ömürlük yazı tək gözündə qalım.

Verdiyi zülmə bax, həsrət dağının,
Qərib xəyalıyam gənclik çağının,
Fikirlər toplaşan ümid bağının.
Səhraya çevrilmiş düzündə qalım,
Bizi yada salan sözündə qalım.

Çox çılğınam hərdən səhvlər elədim,
Səhvlər bağışlandı əhvlər elədin,
Sən mənim könlümü məskən elədin.

Təki sən arzula özündə qalım,
Ömürlük yazı tək gözündə qalım.

Zülmün də şirindi, zülüm deyil ki,
Sevdiyim adamsan ölüm deyil ki,
Sənsən ürəyimdə bəslədiyim gül,
Özgələr qoxlamış gülüm deyil ki,
Tək səni arzula özündə qalım,
Ömürlük yazı tək gözündə qalım.

## Qala bilmirəm

Məndən inciyənim, məndən küsənim,
Mən sənsiz heç zaman qala bilmərəm.
Həyat yollarımda bircəmsən mənim,
Mən sənsiz həyatda qala bilmərəm.

Sən mənim qəlbimin yadigarısan,
Ömrümün ən şirin gözəl baharısan.
Həm övlad payımsan, həm nübarımsan,
Mən sənsiz həyatda qala bilmərəm.

Ömür baxçasından səni dərmişəm,
Sənə uzun illərimi vermişəm.
Sən olmasan, bil ki, ölüb getmişəm,
Sənsiz bu dünyada qala bilmərəm.

## Ömür-gün yoldaşım oldun

Elə sanma ki, uzaq getdi baxışlarım,
Elə sanma ki, sənsiz itdi baxışlarım,
Elə baxdın, elə yaxdı baxışların,
Bax ruhum məhkum etdi baxışların,
O baxışlar yaddaşımda məskən saldı.

Atəş aldı baxışlarım gözlərindən,
Qərib düşdü sanma qaçdı sözlərimdən.
Elə baxma, ay günahsız günahlarım,
Məni dəli aşiq edən səbəbkarım,
O baxışla bir ömürlük sirdaş oldum.

Elə baxma, o baxışda ünvanım var,
Harda olsam, hara getsəm, gəzər tapar.
Bax Bakıdan Ankaraya gedən qatar,
Aparsa da təkcə səndin yoldaşım,
Elə baxma, bu yaşda da gəlim çaşım,
O baxışla ay ömürlük yol yoldaşım,
Baxdım, baxdım bir ömürlük sirdaş oldum.

## Həsrətindəyəm

Nə deyim, ay gülüm, bu tale, qismət,
Bir sirli sevdanın həsrətindəyəm.
Hərdən gəlməyəndə, ya gec gələndə,
Yuxulu dünyanın möhnətindəyəm.

Ömrü ovutmayır bu sirli dünyam,
Əvvəldən də bağlı, möhürlü dünyam.
Nə bir hekayədi, nə də ki, nağıl,
Bir şirin röyanın həsrətindəyəm.

Deyən möcüzədi bu sirli eşqim,
Məni anlamayır inan heccə kim,
Gülüm, gəl, bir anlıq sən də ol həkim,
Bir tatlı bəlanın möhnətindəyəm.

## Ad günü mübarək, ay Nicat bala

Aşaram kəndimin dağ-dərəsidən
Xatırlaram Nicat doğulan anı
Qardaş balasının şirinliyindən
Nur olar, bəzənər şer varağım.

11avqust sənin doğum günündür,
Nicatım qoy səni mən alqışlayım.
Övliyalar, kimsənələr duasın,
Bir hədiyyə kimi sənə bağışlayım.

Bibin sənə qurban ay Nicat balam,
Bütün nəslə kökə diqqət edənsən,
Sən ata yurdumun şam yandıranı,
Bir nəslə, bir kökə hörmət edənsən.

Gözəl Fatiməndən sən sevinəsən,
İgidYusifinlə hey öyünəsən,
Gözəl Təranənlə xoş ömür sürəsən,
Çünki qəlbi təmiz, gözəl insansan.

Sarıgül Yağmur deyər yüz yaşa Nicat,
Sevimli ailənlə dol yaşa Nicat.
Həyatdan doyunca kam al ürəkdən,
Xoşbəxtlik mələyiylə ol qoşa Nicat.

## Ana

Tənhalıq qəlbimi boğan zamanda,
Gözümə görünür şəklin bir anda,
Hərdən balalar narahat olanda,
Gəlirsən gözümün önünə ana,
İndi baxıb bu halıma yansana.

Vəsiyyət edəcəm qohuma, yada,
Məni qəriblikdə salmasın oda,
Artıq təsəlli də yetməyir dada,
Əlimi üzmüşəm hər şeydən, ana,
İndi baxıb bu halıma yansana.

Qardaşdan eşitdim bir çətin yara,
Söylə, necə dözüm bu ahu-zara?
Vallah gileylərdən gəlmişəm zara,
Get-gedə balaların düşür azara.
Mən bu qəriblikdə nə edim, ana?
İndi ki, halıma baxıb yansana,
İndi mən yetim nə edim, ay ana?

**Xoş dilək**

Asəfim, Tanrının qismətidir, bil,
Həm bizə verdiyi neymətidir, bil.
Gəl həm sevin ömrüm, həm ürəkdən gül,
Tanrım, bu qisməti sən ömürlük yaz.

Qoy, Sarıgül dualarla ucalsın,
Asəfiylə birgə sağlam qocalsın.
Nəvə-bala ətrini daim alsın,
Tanrım, bu qisməti sən ömürlük yaz.

**Ağlama, qızım**

Sil gözünün yaşın, qəmli dayanma,
Qurban olum gözlərinə ağlama,
Belə qəmli, belə müşkül dollanma,
Qurban olum gözlərinə, ağlama.

Sən ağladın könlüm evi talandı,
Müşkül durdun canım oda qalandı.

Dünya malı bu dünyada qalandı,
Qurban olum gözlərinə, ağlama.

Sənsiz dünya malı vallah yalandı,
Dünyam uçdu, könlüm gözü talandı.
Sənin hər bir acın canım alandı,
Qurban olum gözlərinə, ağlama.

Ağlıyırsan ürəyimə qəm düşür,
Qəlbim yanır, saçlarıma dən düşür.
Hər damladan ürəyimə od düşür,
Qurban olum gözlərinə, ağlama.

**Kölgə salanım**

Ömrümün baharı, yazı olmusan,
Qaranlıq dünyama işıq salmısan.
Ay ömrüm, mən sənsiz çox tənha idim,
Sən səhra gülünə kölgə salmısan.

Ömrümün baharı, yazı olmusan,
Alnıma yazılan yazı olmusan.
Necə yaşayardım axı mən sənsiz?
Sən səhra gülünə kölgə salmısan.

Mən sənin yanında yetkinləşmişəm,
Hər bir çətinliyi sənlə keçmişəm.
Hərdən çətinliyə, dara düşmüşəm,
Sən oldun daima dayaq duranım.

Ay səhra gülünə kölgə salanım,
Asəfim, başına dönüm dollanım.
Bu bir həqiqətdir bunu nə danım?
Ay mənim dayağım, arxa duranım.

## Məsud Fyuzat Ərdəbilli

İlk baxışdan onu sevgi sanırsan,
Düşünmədən bu atəşlə yanırsan,
Bir gün gəlir tənhalıqdan donursan,
Şaxtası var, boranı var sevginin.

Şərəfli bir ömür yolu seçmisən,
Əməlinlə, əməyinlə düzgün həyat yolu seçmisən,
Zəhmətinlə, səviyyənlə mənəvi zirvəyə keçmisən.
Sən şərəfli bir yol seçmisən Məsud,
Şirin bulaq suyun içmisən Məsud.

Sən Savalan zirvəsini keçmisən Məsud,
Odur ki, Sarıgül xanım üçün əzizsən.
Çünki əməli düz qəlbi təmizsən,
Səid qardaşın da, sən də məniçün əvəzsizsən.

Xeyirxahlıq olub sənin vərdişin,
Hər bir evin bəzəyidir hər işin,
Qoy xoşbəxtlik olsun sənin gərdişin.
Qeyrətli övladısan Vətənin ay Məsud,
Allahdan səadət olsun sənə pay Məsud.

## Vəfa

Vəfa xasiyyəti vardır adında,
Qızınarsan ürəyimin odunda,
Ümid yeri qohumun da, yadın da.
Vardır el içində onun hörməti,
Nabatıyla itməsin heç zəhməti,
Bir ömür davam etsin bu məhəbbəti
Pozulmasın bu birliyin vəhdəti.

Vətənin qeyrətli oğlusan sən də,
Sənə hörmətim var qonşu tək mən də,
Ailəcanlılıq milli dəyərlər səndə.

Artıq atəşkəsə qərar verildiyi an,
50 yaşın tamam olur, ay oğlan.
Biz qalib gələcəyik buna inan,
100 yaşa çat təbrik eşit o zaman.

**Aynurə Nadir qızı**
*(7 noyabr ad gününə)*

Zaman adımlayır, idrak çalışır,
İnsan anlayana tezcə alışır.
Mənəviyyatı təmiz olan insanlar,
Həyatda əqidəli olmağa çalışır,
Haqq ədalət üçün yanır alışır.

Ağıl hər döyüşdə qələbə çalar,
Aqıl qarşısında nadan alçalar.
Getdiyin o düzgün həyat yolunda,
İnsanlığın daim gözdə ucalar,
Sadə təbəssümün qəlbdə iz salar.

Düzlük örtüyüylə bürünüb yaşa,
Dövran hərəkətdə baxmayır yaşa,
Mənəvi yüksəkliklə ucal, dol yaşa.
Əziz Raufunla bir ömür qoşa,
Yaşa, ay Ayunurəm, səni yüz yaşa,
Arzu istəklərin getməsin boşa.

Mənim qəlb bağımda açan çiçəksən,
Mən elə sanmışdım səni bir mələksən,
Aynurə yaxşı ki, real gerçəksən.

İstər zahirində, istər daxildə,
Sarıgül Yağmurcün solmaz çiçəksən,
Rafcun hamıdan gözəl göyçəksən.

**Esmira qızıma**

Əməli ləkəsiz, vicdanı təmiz,
Esmira qəlbimdə qoymusan pak iz,
Gözəl bir nəsilin övladısan sən,
Bilik, bacarığına gülüm, güvənsən.
Xalqımın bəzəyi olarsan qızım,
Eldən xeyir-dua alarsan qızım.

Gah ağladır, gah güldürür bu həyat,
Qanunları, gah təzədir, gah bayat,
Ay Esmiram, sən də muradına çat.
Səninçün uğurlu olsun kainat.

Boş narahatlıqları başından at,
Bir ömür gər sevənlərinə qanad,
Çünki çox ləyaqətlisən, ay övlad.
Arzum budur səadət bəxş etsin sənə həyat,
Bu dünyada sən də muradına çat.
Sarıgül Yağmurdandır sənə bu sovqat.

**Ay Mehdi**
*(Ərdəbilli Mehdi Əzizpura)*

Yarpaq pıçıldasa bil ki, səsimdir,
Qulağına dəyən külək nəfəsimdir,
Sənin var olmağın mənim bəsindir,
Həyatımı bəzəyirsən ay Mehdi,
Sən Mehranın dəstəyisən ay Mehdi.

Səni alqışlaram, var ol əzizim,
Elə varlığınçün sağ ol əzizim.
Əfsanənin oğul payısan Mehdi,
Məryəmin qardaş payısan əzizim.
Elvinçün gözəl dayısan ay Mehdi,
Qoy səni Allah qorusun ay Mehdi.

**Seymur usta**

Ay Seymur çox zəhmətkeş oğlansan,
Əqidəli, sözü bütöv cavansan,
Əməyinlə həyatda iz qoyansan,
Səliqə -səhmanla hörmət qazan sən.

Halal zəhmətinlə cox xoşbəxt yaşa,
Arzu istəklərin getməsin boşa,
Yaşa ay Seymur can səni cox yaşa,
Ailə xoşbəxtliyinlə daim ol qoşa.

**Bacıqızı Sevinc, ad günün mübarək!**

Mehriban qəlbinlə səsimi dinlə,
Fəxr edəcəm Sevinc inan səninlə,
Çətin günləri keçirtdin mətincə.
Mənəvi dünyanda dözüm qazandın,
Bu günkü qüruru özün qazandın.
Gözəl balalar böyütdün əziyyətlə,
Bu gün keşiyində durdun qeyrətlə,
El içində ad qazandın hörmətlə.
Bax indi sənin üzün ağ olsun Sevinc,
Elvin Vaqif balan sağ olsun Sevinc.

Yolunda əssə də vədəsiz tufan,
Sən güçü-qüdrəti aldın Tanrıdan,
İndi ad günündür mükafat Tanridan.

Qoy ALLAH qorusun balalarını,
Onlar xoşhbəxt gorsun analarını,

Dünya ejdahadı, coxdu divanı,
Yoxuşlu, enişli, sərt imtahanı,
İtirmə Tanrıya ümüd gümanı,
Cətin anları yadından çıxar sən.
Həyat sınaxından üzü ax cıxarsan,
Sarıgül xalan üçün ömrü baharsan.

**Banu balama**

Bu gün sənin ad günün,
Daim olsun şad günün,
Dərd-qəmdən azad günün,
Gülər üzlü Banum.

Emilə, Ramilə deyir dayı,
Allahım gözəl payı,
Huri-Mələklər tayı,
Gülər üzlü Banum.

Xoşbəxt böyü dol yaşa,
Səadətlə ol qoşa,
Valideyinli dol yaşa,
Gülər üzlü Banum.

**Ay şair**
*(Şair Bisavad Teymur oğlu Pirkaza)*

Pirkaz Teymur yaddaşa iz salmısan,
İllər keçər, sanma ki qocalmısan,
Qeyrətli oğul tək vətəndaş olmusan.
Sağlam yaşa hər arzuna çat şair,
Narahatlıqları başdan at şair.

Ömrün hər fəslinin gözəlliyini görmüsən,
Doğma məkanında qeyrətlə ömür sürmüsən,
Qabiliyyətli balalara böyük əmək vermisən.
İndi isə əməyinin bəhrəsini ye şair,
Sinəndə də telli saz gözəl sözlər de şair.

Məhşur söz ustadı Bisavad Teymur oğlusan sən də,
Onun hər bir kəlamı əzbər olub Vətəndə,
Gözəl istedad sahibisiz qardaşların da, sən də.
Sizin tək oğullarla qürur duyuram mən də,
Darıxan kimi qardaş, mən də gələcəm kəndə.
Bax əvvəldən deyim ki, hazırlıqlı ol şair,
Bu həyatdan, Pünhandan gözəl duyğu al şair.

İnşallah sülh olar dəyişər həyat,
Yenə gözəlliklə çaglar kainat,
Nəvə-nəticəndən görəsən toy-büsat.
Pünhanınla qoşa ömür sür şair,
Balalarının xeyrini gör şair.

Gözəllikdən daima zövq almısan,
Ona görə ruhu gözəl qalmısan,
Sevdiyin Pünhandan ilham almısan,
Hər an onun qayğısına qalmısan.
Diqqətinlə bax beləcə qal şair,
Doya-doya həyatdan zövq al şair.

Sarıgül Yağmur sizə meyil salıbdı,
Pünhandan, səndən doğma duyğu alıbdı,
İki evin arasında qalıbdı.
Əksik olma el-obadan sən şair,
Olsun həyat yolun bir gülşən şair

## Mənim əzizlərim

*(Nəvələrim Abdüləziz və Ömərə həsr olunur)*

Əziz balalarım, qəlbi təmiz balalarım,
Sizli anları, sizlə keçən zamanları,
Kitablarımda sizə poetik dillə,
Sağ ikən sizə təqdim etdim.
Əbədiləşdi, tarixləşdi, çox şükür.

Sizli, bizli zamanları,
İndi tarixləşən anları xatırlayıram,
Bəzən acılı anılardan ağlayıram,
O anıları qəlbimin gizli
Varaqlarında saxlayıram.
Qoy yaddaşa düşməsin,
Nə də böyüyüb şişməsin.

Bu acılı anları unudub,
Gələcəyə ümidlər bağlayıram.
Bu gözəl gələcəyi düşünəndə,
Dağ çayı tək coşub çağlayıram.
Çünki Ulu Tanrıma hər şey əyandı,
Arzu, istəklərim ona bəyandı.
Onun böyüklüyünə sığınıb,
Tanrıma ümid bağlayıram.

Sizsiz darıxsam da, daima qəlbimdəsiz,
Ona görə də hər sətrimdə, cümləmdəsiz.
Tanrıya şükr edərək kitablarımı qucaqlayıram
Sizli anları əbədiləşdirdiyim üçün
Könlümü çağ saxlayıram,
Sizlərə bir ömür xoş gələcək arzulayıram.

İlk kitabımda Abdüləziz və Ömərin.
Barmaq izlərini, əlləri ilə yazdığları ürək sözlərini,

Nənəyə aid xoş sözlərinin fotoşəklini də kitaba saldım.
Sarıgül Yağmur kimi, nənə kimi,
Bu işimdən də razı qaldım çox şükür xudaya sənə,
Xoş niyyətimi, diləklərimi görürsən.
Minlərcə kəs şükür sənə dönə-dönə.

## Mirsədi ağama

Həyat gedir, çəkmir qəlb minnətini,
Duyur ürəklərin saf niyyətini,
Mizan-tərəzidə hesab çəkəndə,
Uca tutur insan sədaqətini,
Mənəvi saflığı, ləyaqətini,
Bir də seçilmişlər tək mənəvi sərvətini.

Düzdür tutduğun yol, haqdır diləyin,
Vicdan tərəzisindədir arzun, istəyin.
Ehtiyac duyana etdin köməyi,
Ulu Tanrım olsun dəstəyin sənin.
Sən dəyərli oğlusan doğma Vətənin.

Tanrıdan seçilmiş bir ailənin oğlusan,
Əməlinlə, vicdanınla el içində doğrusan,
Əziz insan, sevimlisən, əzizsən,
Ona görə ay Mirsədi ağa əqidəsi təmizsən!

Bəxdəvər o kəsdir ki, qəlbi doludur,
Hikmətli sözlərlə, xoş kəlam ilə,
Daim el içində nifuz qazandın.
Gözəl və dəyərli kəlamlarınla,
Şəcərəndən gələn ehtiramınıla.

Əziz insan, şükür qəlbi təmizsən,
Bilik, bacarıqla coşqun dənizsən,

Dağ şəlaləsi tək bərraq, təmizsən.
Gözəl ailənlə xoşbəxt yaşa sən,
Xoşbəxtliklə daima ol qoşa sən.

Gözümdə ucasan, zirvədə qarsan,
Vətənin əziz oğlusan, vüqarsan.
İllərə imza atsan da könlü baharsan
Əziz Mir Məhəmməddən,
Akifədən xoş yadigarsan,
Bu gözəl dünyamızda yaxşı ki, varsan.

Məntiq var, məna var hər bir sözündə,
Odur ki, ucasan elin gözündə,
Mənəvi bəzəksən yerin üzündə,
Elimə, günümə, sən bir örnəksən,
Həm örnəksən, həm mənəvi dəstəksən,
Odur ki, sən bizə daim gərəksən,
Sarıgül bibinçün bir ömür gərəksən.

## Əsgər və Çinarə toyunuz mübarək

Arzum budur Əsgər və Çinarə xanım tək butalar,
Xeyirli, uğurlu, şən yol tutalar,
Can deyib, can eşitsinlər qudalar.
Əsgər, görüm toyun mübarək olsun,
Çinarənin gözü sevinclə dolsun.

Mehriban olmaqçün hər iki ailə,
Hər ikisi şəkər səpsinlər dilə,
Evə girib, evdən çıxsınlar gülə-gülə.
Əsgər-Çinarə toyunuz mübarək olsun,
Gözləriniz daim sevgiylə dolsun.

Övlad ətri ləzzət verər insana,
Bu şad xəbəri gözlər hər ata-ana,
Əsgər ata olsun, Çinarə ana.
Gözləri dolsun baxsınlar cahana,
Deyək bəy- gəlin toyunuz mübarək!
Qismət olsun balanızın ad gününə gələk,
Sarıgül Yağmur desin ay mübarək,
Nənə-babalara da göz aydınlığı verək.

## Bir xoş təsadüf

*(Rüstəm bala üçün)*

Təsadüflər zərurəti yetirir,
Zərurətləri də qismət gətirir,
Xoş əhvalı bir-birinə ötürür.
Belə təsadüfdə Rüstəmi gördüm,
Sanki həyat bağçasından tər çiçək dərdim.

Bax bu təsadüfdən sevin ey həyat,
Sevin və bu anda sən dadıma çat.
Qənifə bibisinin tapşırığıyla.
Bizə iş dalınca gəlmişdi Rüstəm.
Onun tərbiyəsinə, etikasına valeh oldum mən.

Hələ on dörd yaşı vardır Rüstəmin,
Gözəl ailə tərbiyəsinə, zəkasına mən oldum əmin.
Murad ata, Yeganə ana, olmasın qəmin,
Gözəl gələcəyi olacaqdır Rüstəmin.
Bunu həyat göstərəcək əminəm, əmin.

Ey Rüstəmi yetişdirən Murad ata,
Çatasan sən hər arzuya, hər murada.
Bir qeyrətli oğul tək Vətəni qoruyursan,
Şərəfli həyat yolunla Rüstəm üçün qurursan!

Həyat yolunu hərbi xidmətə həsr edib,
Bu çətin zamanda Vətəni qoruyursan.

Xidmət edirsən ki, Vətəndə balalar rahat yata.
Səndən də uzaq olsun, hər bir bəla və xəta.
Rüstəmlə Aysel balaların çatsın arzu, murada.
Sən də Yeganə xanımınla yetiş murada.
Balaların xoşbəxt olsun Murad ata.

Bəxtin qismətinə yenə şükr edib
Qənifə bibisinə minnətdaram mən.
Rüstəm bala ilə bu tanişlıqdan ruhlanıram mən.
Vətənimin gözəl gələcəyi üçün,
Belə balalara inanıram mən.

Rüstəm bu Vətənin gözəl gələcəyidir,
Bunu həm duyuram, həm də görürəm,
Aysel bacısıyla Rüstəm balama,
Sarıgül Yağmur tək alqış deyirəm.
Kitabımda tarixləşəcək bu şeiri,
Rüstəm balama və ailəsinə halal edirəm.

## Ay Tahirim

*(Bacımın həyat yoldaşı)*

Bu həyatda çətinliklər görmüsən,
Gəncliyini qayğılarla bölmüsən,
Bir xəstə ataya qulluq etmisən.
Halal olsun onun sənə əməyi,
Əskik olmasın nə duzun çörəyin.

Bacım Fəzilənin eşqi, yarısan,
Balalarından doyunca yarı sən.
Böyük bir nəslin kökün dövlət, varısan,

Səninlə qürur duyuram ay Tahir,
Xoşbəxtlik qonağı olsun qardaşın Mahirin,
Çünki o da doğmadı, qardaşıdı tək Tahirin.

Çox doğmasan, həm də sadə, ağıllı.
Təmiz ürəyin var, iç dünyası naşıllı.
Elimin oğlusan buda kı, qismət,
Bütün ailəmizə edirsən hörmət.
Bir xoş payız günü oldun qonağım,
Əziz və doğma tək yadımda qaldın.

Odur ki, deyirəm sağlam və gözəl yaşa,
Arzu-istəklərin getməsin boşa.
Çünki əziz bacım Fəziləni tapmısan.
Yüz yaşa Tahirim Fəziləmlə yaşa,
Bir ömrü xoşbəxtliklə ol qoşa.
Sarıgül Yağmur da layiqdi alqışa.

## Sevimli Mərifət xanım

Sənə Hörmətim böyükdü
Bunu nə danım
Bu kitabda əbədiləşib
Mənim duyğulu anım.
Bunu unutma ay canım
Sən də çox mərifətlisən
Həyatda cürətlisən
Kişi tək qeyrətlisən
Yerində ismətlisən
El içində hörmətlisən
Çünki ləyaqətlisən
Həyata dəyanətlisən.

Gözəl gözlü Mərifətim,
Həyatda daim ol mətin,
Xoşbəxtlik olsun qismətin,
Arzum budur həyatdan kam alasan,
Ömrün boyu belə gözəl qalasan,
Çünki sevilməyə layiq balasan,
Sarıgül müəlliməni də hərdən yada salasan.

Yoxdu tayın-bərabərin səxavətdə sənin
Çox layiqli övladısan qoruduğun bu Vətənin
Günü-gündən qoy artsın şöhrətin sənin
Çünki ləyaqətli, həm çox hörmətlisən,
İnsanlara qarşı çox diqqətlisən,
Çünki, bacarıqlı mərifətlisən,
Şəxsi həyatında çox qeyrətlisən,
Mərifətim, sən çox mərifətlisən.

**Nurlanəm**

Nurlanəm Etibarçün xoş arzu, xoş diləksən,
Ruhu gözəllikdə sanki mələksən,
Tazə, koklanmamış körpə çiçəksən,
Qaynanan Qənifəyə daim gərəksən,
Razi balan üçün bir ömür gərəksən.

Çox gözəl yaradıb Yaradan səni,
İlahi qorusun xatadan səni,
Sevdiyin Etibardı yaşadan səni,
Çünki Razi üçün ana tək sənsən.

Nurlanəm, həyatın döngələrində,
Heç vaxt büdrəmə sən, daim ol mətin.
Qərib səltənətdə ata Nazirçün.
Bir də kövrək anan Xanım anayçün,

Sənin ağrı-acın çox olar çətin.
Həyat yollarında daim ol mətin,
Daim göz üstə tut ailə qeyrətin.
Həm də saxla böyüklərin hörmətin.
Unutma sən Sarıgül Yağmur nəsihətin.

## Ay Şahin

*(Tərtərli sənət adamı Əskipara kəndi*
*Kazımov Şahinə həsr olunur)*

Zaman addımlayır, idrak çalışır,
İnsan anlayana tezcə alışır.
Mənəvi qüdrətə malik olanlar,
Həyatda adil olmağa çalışır.
Mən səni beləcə tanıdım, Şahin.

Ağıl hər döyüşdə qələbə çalar,
Aqil qarşısında nadan alcalır.
Ay Şahin, bu həyat yolunda,
Ağlın, düşüncən qəlblərdə yer alar.
İstedadın daim gözdə ucalır.

Sənin insanlığına heyran qaldım,
Tanışlıq üçün az müddət olsa da,
Pozitiv enerjindən tam zövq aldım.
Sən bu qabiliyyət, mərifətinlə,
Şairə qəlbində bir məskən saldın.

Həm sadə insansan, həm də ağıllı,
Gözəl söhbətlisən, iç dünyası naşıllı,
Qürurlansın Tərtərlilər bax belə bir oğullu,
Mənim yaddaşımda belə qaldın sən.

Poetik dünyada özəl yerin var
Dilinin əzbəridir, həyatıda Lalə var.
Sənin həyat yoldaşını da qorusun Pərvərdigar.
Ondan söhbət salanda gözündə işıq gördüm.
Xallardan da söz açdım, gözəl yaraşıq gördüm.

Tərtərli xas oğlu gördüm mən səni.
Doğma duyğularla isitdin məni.
Tanrım qorusun xata-bəladan səni,
Daima başında ol sən ailənin.

İnsanın qəlbində niskil olanda,
Kiçicik diqqətə duyur ehtiyac.
Ay Şahin, mənə həsr etdiyin şerlə
Sanki etdin küskün qəlbimə əlac.

Son kitablarımı çox insanlar alır.
Duyğulu, dəyərli insanlar oxuduqca zövq alır.
Bəzi evlərdəsə elə pəncərədə qalır,
Belə adamlara yazığım gəlir,
Belə insanlar ağacdan nəylə fərqlənir?
Çünki qavram sözü onlara tərs gəlir.

Sən onlardan fərqlisən, çünki gözəl zövqün var.
Sevdiyin ailənlə yaşayırsan bəxtiyar.
Çünki sən tək insanların ömründə daim bahar,
Yaşamın rəngli olmasını onlar daim arzular.

Şahin, belə xoş duyğu səndə var.
Səni də qorusun o Pərvərdigar,
Səninlə qürur duysun sevdiyin Lalə yar.
Bala, nəvələrdən ye doyunca bar
Yaxşı ki, dünyada sən tək oğullar var.

Sevimli Lalənlə qonağım oldun
Gözəl duyğularla yadımda qaldın.
Lalə qızım, sənsə mənəvi oğlum oldun.
Bundan sonra necə unudum səni?
Gözəl xasiyyətinlə mat qoydun məni.
Həmin gün unutdum qəmi-qüssəni.

Yazdığın şerlər sərvətdir sənə
Qoy səni qorusun Ulu kimsənə
Axı nə deyəsən belə düzənə?
Yəqin taledi, bu da gərdişdi,
Şahin istedad da gözəl işdi.

Sən Lalənə aşiq ey gözəl insan
Sevgidə Şahinsən, nifrətdə yoxsan
Laqeyd, nadan insanların gözünə oxsan
Səni tanıdıqca çox şad oldum mən
Odur ki, ürəklə vəsf etdim mən.

O şerini kitabaıma salacam,
Hər oxuduqca ondan zövq alacam,
Bu jestinlə səndən razı qalacam.
Ay Şahin bax xeyir-dua aldın məndən,
Sarıgül Yağmur razı qaldı səndən.

**Qənifə xanıma**

Düzlük örtüyünə bürünüb yaşa,
Dövran hərəkətli, baxmayır yaşa,
Mənəvi dəyərlisən ucal, dol yaşa,
Əziz Ehtiramınla daim ol qoşa,
Yaşa, ay Qənifəm, səni yüz yaşa,
Arzu, istəklərin getməsin boşa.

Ay Qənifəm, sən sanki bir mələksən,
Ehtirama bax bir ömür gərəksən,
Ağlınla cəmiyyətə bəzəksən,
İnsanlıqçün bir mənəvi dəstəksən,
Ehtiramınçün hamıdan göyçəksən,
Balalarınçün bir ömür gərəksən.

Sarıgül Yağmur deyər sözün düzünü,
Tutdun işlərinin ən təmizini,
Qoydun yazılarımda zəhmət izini,
Mən də vəsf elədim hətta körpə Razini.
Kitabımda əzizlərinin adı olacaq,
Bu da sizə məndən yadigar qalacaq.

**Ay ana**

Kimlə bölüm sevincimi, dərdimi,
Xəyal adlı nağıllara inandım.
Səndən sonra çox sənsizlik çəkmişəm,
Ayrılığın faciyəmiş, ay ana.

Bax beləcə gileylidi sözüm, ana,
Səndən sonra heç kəsdə yox dözüm, ana.
Yazıq canım dəhşətə necə dözüm?
İnan tapa bilməyirəm çözüm, ana.

Əziyyətlə yeddi övlad böyütdün sən,
Amma ana, heç vaxt qəddar olmadın sən.
İndi onun acısını çəkirəm mən,
Çünki birlik pozulursa, buna necə dözüm, ana?

Gileylərdən taleyimə yağdı töhmət,
Demək mələk bir anadan doğulanlar deyil mələk.
Arzuladım aramızda ola ülfət,
Cənnətlik ol, gözəl ana, belə imiş demə qismət.
Tanrı bizə imdad etsin, özü etsin çözüm, ana,
Sən yoxsansa indən belə yoxluğuna dözüm, ana.

## Mələklər payı
*(Sabitoğlu Cavada)*

Göydənmi göndərdi mələklər səni?
Götürdün gözümdən kədəri, qəmi,
Apardın başımdan dumanı, çəni.
Gözümdə göylərə ucaldın, Cavad,
Səni dünya durduqca olasan şad.

Səhər günəşitək nurludur gözün,
İnan mələklər tək gözəldir üzün,
Qəlbimi coşdurdu tək bircə sözün.
Bizdə kitabın var deyəndə sən də,
İnan ki, ürəkdən sevindim mən də.

Bu on iki yaşdakı cəsarəti,
Böyüklərə qarşı o cür diqqəti,
Həm də içdən gələn o səmimiyyəti.
Hamıda görməyi arzu edərdim,
Bax onda dünyadan rahat gedərdim.

Təsadüfü görüşü qonşularla paylaşan zaman,
Maraqlı bir fakt söylədi sənətdən qanan adam.
Dedi Cavadın gözəl şeir demək istedadı var,
Bədii gecələrdə onun da öz yeri var.
Sevindim və şükr etdim, ey Pərvərdigar,
Yaxşı ki, dünyada təsadüflər var…

Bu gözəllik həvəs yaratdı məndə,
Ürəyimə söylədim ki, Cavaddan yazacam mən də,
Dəyərli nəslin, kökün, şəcərənin davamısan sən də.
Doğma bir ülfətə bağlandım sənə,
Səni vəsf edəcəm mən dönə-dönə,
Çünki sən tək oğullar lazımdır Vətənə.

Atan Sabit, əziz anan sənlə öyünsün,
Bacın Nurayın da qəlbi qoy sevinclə döyünsün.

Həyatında çox gözəl mövqe qazan,
Əmi, dayı, xala, bibilər sənlə fəxr etsin hər zaman.
Qoy səni qorusun Ulu Yaradan,
Çünki sənə duaçıdı bu şeiri yazan.

Arzum budur səni xoşbəxt olasan,
Əzizlərinin arzuladığı zirvə olasan.
Həyatından daima zövq alasan,
Çünki düşüncəli, zəki balasan,
Sarıgül Yağmuru da hərdən yada salasan.
Bu şeiri kitabıma salacam, Cavad,
Bu işdən də rahat olacam, Cavad.

**Nəbi qardaş**

Nəbi qardaş dəyərli bir insansan,
Çoxlarıyçün oxunmamış dastansan,
El- obançün qardaş, candan yanansan.
Güllərindən daim ilham al, qardaş,
Qeyrətli oğul tək yadda qal, qardaş.
Dünyanın bir çox yerini gəzmisən,
Gül çiçəyin ən pakını dərmisən.
Onunla mənalı ömür sürmüsən.
Güllərindən sevinəsən a, qardaş,
Ailənlə öyünəsən a qardaş.

Milli dəyərlərin toplusu səndə,
Əxlaqınla öyünür səni tanıyan hər bəndə.
Odur ki, ürək sözümü qələmə aldım mən də.
Xeyirdə, şərdə daim bizlə olmusan.
Ailəmizin doğması sayılmısan.

Qanına qopubdur qeyrət simvolu,
Odur ki, seçmisən doğruluq yolun,
Namərdlik görəndə boşalır qolun.

Allahdan xoşbəxtlik payı al, Nəbi,
Daim belə təmiz adla qal, Nəbi!

Belə məqamlarda utancaqsan sən də,
Gənclərə örnək ol, doğma Vətəndə,
Nimunəvi ailə tək tarixləş sən də,
Tarix oğulların yetirmiş qardaş,
Nəsildən -nəsilə ötürmüş qardaş.

Azəri oğlu tək yandırıb çırağ,
Bir ömür yolunda daim üzün ağ.
Gülərin bir elə parlaq çilçiraq,
Bax bir ömür sən beləcə qal, Nəbi,
Sən xeyir-duanı Haqdan al, Nəbi.

Üç yanvar günün daim şən olsun!
Doğmaların ətrafında cəm olsun,
Sarıgül bacın da qonağın olsun,
Xeyir-dualarım səninlə olsun.
Səni və ailəni Allah qorusun!
Bu şerim də sənə hədiyyəm olsun.

## Ay Sultan qardaş

Mənlikli, qürurlu Sultan qardaşım,
Elqızım Pərinin yarı, canısan.
Duyğulu, qayğılı böyük ailənin,
Gözünü dikdiyi tək Sultanısan.

Tarixin dolanbac dolaylarından,
Tarixi keçmişi vərəqləyirsən.
Gözəl anılarda üzdə təbəssüm,
Kədərli anlardasa ağlayırsan.

Deyirlər acıdır şamın taleyi,
Yandıqca içindən artır gileyi.
Onun çəkdiyini pərvanə duyur,
Çünki şam eşqinin odur mələyi.

Sərdar həsrətindən yanan Qiymətin,
Çəkdiyi fəqanı duyursan Sultan.
Odur ki, canından bir parça kimi,
Qiymətə də dəyər qoyursan Sultan.

Tanrım səni bəlalardan qorusun,
Ailənin başından əksik olma sən.
Qeyrətli oğul tək yaşa, yüz yaşa,
Arzu-istəklərin getməsin boşa.

Sevimli balaların barın yeyəsən,
İstəkli Pərinlə şükür deyəsən.
Hərdən Sarıgül Yağmurgilə gələsən,
Yaşamaq həvəsin heç vaxt itməsin,
Sultanlıq ədası səni tərk etməsin.

## Ərkinazıma

Neçə cür ünvan var qərib könlündə,
Sənin yerin çox özəldir Ərkinaz.
Qohumlar içində mənə əzizsən,
Sənli keçmişim gözəldir Ərkinaz.

İstəyin hopubdur qərib sinəmə,
Əzəldən bir bacı olmusan mənə.
Nə desəm, yazsam halal olsun sənə,
Sənli keçmişim gözəldir Ərkinaz.

İndi könlüm xatirələr dənizi,
Orda yaşar eşqimizin son izi.
Həyat mürəkkəbdir gördüm hər üzün,
Sənli o günlər gözəldi Ərkinaz.

Tazə-tər qız idin hər işin gözəl,
Taleydi yaşadıq gərdişin özəl.
Qoy olsun balaların vərdiş gözəl,
Əlimizdən gələn dualardır Ərkinaz.

İndi qayğılara möhtacıq bacı,
Duyğuya, diqqətə möhtacıq bacı,
Səni görməyəsən doğmadan acı,
Dualarım səninlədir Ərkinaz.

Rahiləni dayaq bildim qəlbimə,
Anlayan odur, həmdərdir dərdimə.
Onla paylaşdım, vurduq sarı simə,
Paylaş sən də onunla bax, Ərkinaz.

Rüfətindən, Humayından sevinəsən,
Əmirindən diqqət, qayğını görəsən.
Vüqardan, Güneldən xoş sifət görəsən,
Nəvələrin də barın yeyəsən bacı.
Doğmalardan heç bir vaxt görmə acı.
Səni çox sevirəm, Ərkinaz bacı.

Sarıgül Yağmur sözün deyər ürəkdən,
Sənli xatirələr qorunur ürəkdə,
Sənə xoş duyğular arzu-diləkdə.
Bundan sonra xoşbəxt yaşa, Ərkinaz,
Əməyin getməsin boşa, Ərkinaz,
Yaşa, yaşa sən yüz yaşa, Ərkinaz!

## **Fazil həkim**

*(07 iyul ad günü münasibətilə)*

Yaddaşda iz saldın ay, Fazil həkim!
İnsanlığına tay olmaz heççə kim.
Hikmətli sözlərlə, gözəl kəlamla,
Gözəl rəftarınla fəxr etdim həkim.

Mənimlə ünsiyyət yaratmaqla sən,
Qiymətli vaxtını həsr etməklə sən,
Mənəvi dəstəklə əl verməklə sən,
İnsanlıq taxtında yüksəldin həkim.

Sənə bildirirəm təşəkkürümü,
Qəbul etsən İçdən razı qalardım.
Ömür kərvanının ömrün uzadıb,
Diabet sözündən qisas alardım.

Fazil həkim, alicənab insansan,
İnsanlarin yaddaşında qalansan.
Dəyərli ailənin yoluyla gedib,
Xalqın tarixinə imza atansan.

İlahi qorusun gözəl ailəni,
Onlar daim edir üzü ağ səni.
Gözəl Fəxriyyənlə bir ömür yaşa!
Zəkalı oğulların Nicat, Sənanda,
Mənəvi sərvətidir doğma Vətənin.
Bir ömür fərəhlə dolasan yaşa,
Arzu istəklərin getməsin boşa.

Maddi varlılıq fanidir inan,
Mənəvi sərvətisən doğma Vətənin
Varlığın sərvətidir vətəndə olan,

Yüksək etikadır sənin dəyərin,
Hər yerdə ucalsın şöhrət heykəlin,
İlahi qorusun xətadan səni.

Tibb elmində seçilənsən, kamilsən,
Təmiz niyyətli, mövqecə adilsən.
Azəri xalqıycün mənəvi sərvət,
Sarıgül Yağmurcün böyük alimsən,
Fazil həkim səni çox xoşbəxt yaşa,
Arzu-istəklərin getməsin boşa.

## Sevimli Aytən

*(30 yaşı münasibətilə)*

26 may sənin doğum günündür
Ürəkdən mən səni alqışlayıram.
Tərifə, Rahilə yanımda ikən,
Bu şerimi sənə bağışlayıram.

Dinlə ürəyimi, danışdır bir az,
Məhəbbət oduyla alışdır bir az,
Duyğuma sevgini qarışdır bir az.
Ağ günün şad günün olsun, ay qızım,
Qoy xoşbəxtlik olsun sənə pay qızım.

Gözəl Aytənim, xatirin var məndə,
Sən zəkalı bir övladsan Vətəndə,
Rauf, Əli qardaşlara böyük istək var səndə,
Səninlə tanışlığıma inan sevindim mən də.

Bu gün arzular bulaq tək qaynasın.
Şad günündə hamı qalsın, oynasın.
Tərifə anan gözəl xonça bağlasın.
Ad günün daima şad günün olsun
Səni bədnəzərdən Allah qorusun.

Xəqani ürəkdən, qəlbdən sevinsin
Mənalı gözləri daima gülsün.
Əsma balan daima sizlə öyünsün,
Ad günün şad günün olsun Aytənim
Sarıgül Yağmur da vəsf etsin səni.

## Zəngi Litseyi

*(Abduləzizin buraılışı münasibətilə)*

Həyat yollarıyçın düzgün yerişin,
Çətin sınaqlardan mətin yürüşün,
Elmdə, savadda qalib gəlişin,
El sənə borcludu, Zəngi litseyi.

Ata anamız tək mehribanlığı,
Pak-təmiz insantək istiqanlıgı,
Bizə həsr etdilər bax cavanlığı,
Zəngi litseyinin müəllimləri,
Bizə həsr etdilər uzun illəri.

Kövrək addımlarla yollar getmişəm,
Abdulәziz, Ömәri sizә e"tibar etmişәm,
Daim sizi vәsf etmәk olub peşәm,
Bunu şe"rlәrimlә isbat etmişәm,
Rəfiyyə müəllimәm, Meyram müəllim.
Sizi vəsf etmişəm buna inanın.

Bayram müəllim, milli dəyərlərin toplusu səndə,
Şərəfli bir yoldasan doğma Vətəndə,
Dövlətə sədaqət, dinə itaət.
İnsanlığa ləyaqət də var səndə,
Litsey rəhbəri kimi gözəl iz qoydun məndə.

Abdulәziz qәbul imtahanı versin,
Hamımızın qoy bu il üzü gülsün,

Litsey kollektivi xeyirli üz görsün.
Müəllimlərimiz xeyir-dua versin.
Valideyinlər uğurlu həyəcan görsün,
Litsey kollektivi sağlam can görsün.

Sarıgül Yağmur deyir əməyiniz itməsin,
Xoşbəxtlik mələkləri heç sizi tərk etməsin,
Şagirdlərdən sevinəsiz, güləsiz,
Azad, gözəl Vətəndə xoşbəxt ömür sürəsiz,
Zəngi litseyini daim zirvədə görəsiz.

**Rəhim Ərdəbilli**
*(Hüquqşünas)*

Qərib bir küçədə səndən uzaqda,
Küləklər həsrətli nəfəs kimidir.
Səndən çox uzaqda qəlbim darıxır,
Hər yan Rəhim mənə qəfəs kimidir.

Mən var olum, sən də mənim varlığım,
Bu istəklə var yaradaq həyatda.
Eyni gəlir səninlə oxşarlığım,
Sevgini təkrar yaşayaq həyatda.

Səninlə arzuya, xəyala dalaq,
Dünyanın ləzzətin birlikdə alaq,
Sən mənə, mən sənə gəl olaq qonaq.
İstəyi təkrar yaşayaq həyatda.

Oxşaya-oxşaya telini sənin,
Qoxlaya-qoxlaya gülünü sənin,
Sevim şirin-şirin dilini sənin,
Gözəl bir duyğu yaşayaq həyatda.

Qəlbdə vəhdət olsun sevinclə, qəm də,
Mənə dəyərlisən qəbul et sən də,
Nə vaxt ki söz düşür qonaq gəl, sən də.
Sarıgül Yağmura dəstək olaq hətta,
Bu arzu, istəyi görək həyatda.

**Ömər bala**

*(Sultanın 2 yaşılı nəvəsinin ad günü münasibətilə)*

Adın da şirindi, özün də şirin,
Əziz Sultan qardaşın nəvəsisən sən.
Pərinin gərəkli ay körpə oğlu,
Bir əziz ailənin müjdəsisən sən.

Necə də şirinmiş baladan nəvə,
Bunu öz nəvəm Ömərdən görmüşəm.
Onunçün də bu balaca Ömərin,
Baba-nənələrinə gözaydınlığı vermişəm.

Sıxdıqca qəlbinə körpə Öməri,
Rasim ata üçün səadət gəlir.
Sevda dünyasının xeyirli barı,
Aynur ananın da bax, üzü gülür.

Əlindən öpürlər əli bal dadır,
Tək-tək sözlər deyir dili bal dadır.
Bu iki yaşında körpə balanın,
Xoşbəxt təbəssümü adam aldadır.

Onla unuduruq dərd-sərimizi,
Xatırlayırıq gözəl günlərimizi,
Sarıgül Yagmur təbrik edir sizi,
Rasimli, Aynurlu Ömərimizi.

## Nadir dayım oğlu, ad günün mübarək
*(14 iyun)*

İllər keçir ay qardaş, əl çatmayan yar kimi,
Arzu istək çaşqın axan sel kimi,
Könlüm sizə uçur inan yel kimi.
Qapınızı döysün daim xoş dilək,
Ay Nadirim, ad günün mübarək.

Nəsibin olmasın heç sərt yoxuşlar,
Ömrümüzə qəm salmasın naxışlar,
Səni süzsün Rahiləli baxışlar.
Balalardan eşidəsən xoş dilək,
Ay dayıoğlu ad günün mübarək.

Hər bir kəsin acı, şirin dəmi var,
Hər taleyin xoş günü var, qəmi var,
Hətta gözdə sevinc, qüssə nəmi var.
Arzum budur üzün gülsün körpə tək,
Ay Nadirim, ad günün də mübarək.

Elnarən, Aynurən şərəf payındı,
Anar, Rauf təmiz oğul tayındı,
Nəvələr də sənin şirin payındır.
Rahilənlə bir xoş ömür sür görək,
Ay dayıoğlu ad günün də mübarək.

Sarıgül Yağmur deyər sözün düzünü,
Qarşıla sən 90-nını, yüzünü,
Daim görək Arif, Ərkinaz, Leylanın gülər üzünü.
Yüz il yaşa müdrik, sağlam xoş dilək,
Ay Nadirim, ad günün də mübarək.

# Qiymət

Sevgin, məhəbbətin pak sədaqətim,
Yaralı könlündə yol salıb Qiymət.
Alışıb qalxırsan əngin səmaya,
Haq çatsın dadına əl atıb Qiymət.

Əziz xatirənlə oxşa könlünü,
Salma dərəyə, yoxuşa könlünü,
3 əziz balanla yaşat könlünü.
Könlümdə həzin bir iz saldın Qiymət,
Ömürlük yaddaşımda qaldın Qiymət.

Mən belə yanğını canlı görəndə,
O məsum baxışdan çələng hörəndə,
Səni Rahiləylə birgə görəndə,
O kövrək duyğudan dondum, a Qiymət.

Ömrünün növrəstə, gözəl çağında,
Yatırsan yüklücə qəm yatağında,
İstərəm bir şam olam otağında.
Sənə təsəlli laylası çalam, a Qiymət,
Ömürlük bir doğman olam, a Qiymət.

Sən bir lətafətli, solmaz çiçəksən,
Sərdar itkisindən yanan ürəksən,
Həm çox zərifsən, həm kövrəksən.
Oxşar bu sevgini göydə mələklər,
Sənə heyran qalar sevən ürəklər.

Bu dərin sevginin valehi oldum,
Xəfifcə titrəyən saf mehi oldum,
Sarıgül Yağmuram göz şehim oldun.
Ömürlük yadımda qaldın, a Qiymət,
Canımı odlara saldın, a Qiymət.

Nilufər, Bəyim, Rüfət səndən güc alsın,
Səbrli ol bu məhəbbət ucalsın.
Bu özəl istək ətrafa səs salsın,
Sultan qardaş kimi bundan güc alsın.
Səs saldın tarixə gözəl iz Qiymət,
Olsun həyat yolun daim düz, Qiymət.

**Zülfü dayı, Fatma xala**

Cavankən ömürlərin el obaycün üzdülər,
Doğma insanlarıyıcün xoş günlərin düzdülər,
Qonaq-qara görəndə daim gülər üzdülər.
Bu halıylə Zülfü dayı, Fatma xala ucaldı,
Amma nə etmək olar həyatdı bu,
Onlar da tez qocaldı.

El obaycın çox üzdülər özlərin,
Hamı üçün tox etdilər gözlərin,
Hər bir məclisdə bildilər sözlərin,
Zülfü dayı tutdu daim zirvəsi,
Fatmasıyla sevindirdi hər kəsi.

Fatma xala bir mələk xislətliydi,
Həm abırlı, həm də nəzakətliydi,
Odur ki, el içində hörmətliydi.
Gözündə bir körpə təbəssümü yaşardı.
Ruhundasa daim bir bahar vardı.

Giley, qiybət nədi heç bilməzdilər,
Nə yersiz danışıb, şit gülməzdilər.
Mən elə bilirdim onlar ölməzdilər.
Amma bu həyatdı nə etmək olar
Zülfü dayı, Fatma xala tarixdə qalar.
Adları tarixləşər, bax onda ölməz olar.

Gözəl şəcərəli onlar hər ikisi,
Nəsli, kökü çox yandırdı itkisi
Amma qoyduqları övladlar elin güzgüsü
Bir-birinə daim dayaq oldular
Ata-ana ruhu onlardan şad oldular
Bir-biriyin dərdinə ortaq oldular.

Daim yüksək mövqedə Zülfü dayı
Süfrəsində daim var qonaq payı.
Fatma xala sanki mələklər tayı
Ruzisini hamıyla paylaşardı.
Zülfü dayının sevinci aşıb daşırdı.

Torpaq sərvətlərlə doludur, dolu
Yolun azmaz hamı getsə düz yolu.
Zülfü dayı, Fatma xala behişdədir öz yolu.
Bunu hamı bilsin, Allah adildir
Belə insanların adı aqildir.

Ömrün son pilləsi fəsli payızdır,
Gecəsi uzundur, gündüzü azdır,
Zülfü dayının, Fatma xalanın yadigarıdı
Kamil, Rafayıl, Elmira, Rahilə payıdı,
Çox şükür onların əqidəsi düzdür,
Əməlləri kimi qəlbi təmizdir,
Ata-anaya da rəhmət oxudur onlar.
Onların əməliylə ruhu rahatdır onlar.

Vətən yağılar əlində qaldı,
Zülfü dayının balaları vətəndə qaçqın olanda,
Rahilənin başına qohumlar yığılanda.
Yenə özün itirmədi o aqil Zülfü dayı,
Çünki özü saldığı süfrədən vardı bir qismət payı.

O süfrədə var idi Zülfü dayının insanlıq payı,
Əsrlər, qərinələr beləcə ötüşəcək,
Zülfü dayı, Fatma xala daim yada düşəcək,
Sarıgül Yağmurun bu şeri kitablara düşəcək.
Hamı qəlbdən deyəcək rəhmət sizə ərənlər,
Bir də Zülfü dayını, Fatma xalanı görənlər,
Rəhmət sizə, min rəhmət haqqa qiymət verənlər!

## Unudarmı heç

*(Ərdəbilli Səid Fyuzata)*

Dilimin ən şirin kəlməsindəsən,
Düşün ki, bir ağac kölgəsindəsən,
İstəyin əlçatmaz zirvəsindəsən,
Bu ürək Səidi unudarmı heç?

Bu ürək ömrümü versə də yelə,
Gözlərimin yaşı dönsədə selə,
Cahan bu şairi unutsa belə,
Bu ürək Səidi unudarmı heç?

Mənə xoş söz deyən dilinə qurban,
Bülbülünə qurban, gülünə qurban,
Gözəl şer deyən dilinə qurban,
Bu ürək Səidi unudarmı heç?

Bal dadan dilində söz nə gözəldi
Günəş tək parlayan üz nə gözəldi
Qamət nə gözəldi göz nə gözəldi
Bu ürək Səidi unudarmı heç?

Mən sənsiz neyləyim de necə dözüm?
Hər yerdə hey səni axtarır gözüm,
Bu qədər hicrana mən necə dözüm?

Ay Səid bu işə gəl, tap bir çözüm,
Sarıgül Yağmurda qalmadı dözüm,
Bu ürək Səidi unudarmı heç?

## Feruz qardaşım

Ruhumdan alışan odum, közüm var,
Həyata bağlanan könlüm, gözüm var,
Hələ yazılası çoxlu sözüm var.
Bu dəfə könlümə qonaq sən oldun,
Qardaşım Rəşidə qonaq sən oldun,
Sənin xoş sözünü eşidən mən oldum.

Ovqatım köklənib xoş əhval üstə,
Ürəyim istəyir doğma bir səs də.
Rəşid qardaşımdan bir soraq istə.
Qoy o da söyləsin sözünü sənə
Səni vəsf edəcəm mən dönə-dönə.

Sevda yolçuları yanımdan keçir,
Bir kəlmə xoş dilək qanımdan keçir,
Sənə xoş diləklər canımdan keçir.
Sevimli Günayla sən xoşbəxt yaşa,
Arzu, istəklərin getməsin boşa.

Ananın özləmi gözündə yaşar,
Atanın özləmi sözündə yaşar,
Sarıgül Yağmur sənə nəğmələr qoşar,
Mahirə bacın səndən sevinsin Feruz,
Hamlet qardaş sənlə öyünsün Feruz,
Rəşidimin də üzü gülsün Feruz.

## Ay Pəri

Məftun edir baxışların qəlbimi,
Ürəyimə sığmayır bu əndişə.
Alqışlaram qəlbdən gələn istəyi,
Çünki şeir yazmaqdı mənim peşəm.

Hər baxışın sehrinə düşmərəm,
Hər tökülən şirin dilə bişmərəm,
Hər sevginin qədəhindən içmərəm,
Bir Pərinin sehrinə düşmüşəm.

Bir paklıq var baxışında, gözündə,
Bir düzlük var kəlməsində, sözündə,
O qədər məsumluq var ki, üzündə,
Bir mələk qız haləsinə düşmüşəm.

Bir elliyik xətrin məndə əzizdi,
Sultanın yanında Pərim səssizdi,
O mələk xislətli, su tək təmizdi,
Bir doğma baxışın sehrinə düşmüşəm.

Sarıgül Yağmur sözün deyər düz üzə,
Oturaydım gözəl Pərilə diz-dizə,
O mələk Qiymətlə gələrsən bizə,
Bu ailənin mehrinə düşmüşəm.
Sultanın ailəsin doğma seçmişəm.

## İlhaməm

İlhaməm, qəlbimdə gözəl yerin var?
Mələk xislətlisən, qorusun səni Pərvərdigar.
İnsanlığa məxsus səndə vardır duyğular?
Elşadın sevimlisisən İlhamə,
Təmiz adla dür, incisən İlhamə.

Əməyinin bəhrəsini görürük,
Hər sizə gələndə doğma bilirik.
Ana-bala kimi deyib-gülürük,
O birgə anların dəyərini bilirik,
Qapınıza doğma evtək gəlirik.

Əlinin zəhmətiylə xeyir-dua alansan,
Yüksək mənəvi dəyərinlə yaddaşa iz salansan,
Ağıllısan, gözəlsən, həm də ki, xoş cavansan.
Allahdan xeyir duanı al, ay İlhamə!
Elşadınla, balalar, xoş tale, olsun sənə pay İlhamə!

Bu istəklə bitən güllər solmasın,
Gözəl qəlbin qəm, kədərdən dolmasın,
Səni məndən Uca Tanrım almasın,
Sənsizliyə dözə bilməm İlhamə.

Sarıgül Yağmur deyər ana kimi anasan,
Üç balanla, Elşadınla ömürdən kam alasan.
Gözəl daxili dünyanla sağlamca qocalasan,
Balalarından sevin sən, İlhamə.
Çox sevilməli gəlinsən, İlhamə.

## İstərəm

*(Bacım Fəziləyə)*

Sən mənim körpəcəm, ürək tacımsan,
Ana yadigarı Fəzilə bacımsan,
Bacılar içində şirin bacımsan,
Ətrini duyunca udmaq istərəm.

Qardaş-bacı istəyi hopub sinənə.
Əzəldən bax belə doğmasan mənə.
Rəşidə dayaqsan sən dönə-dönə.
Əskik olmayasan bacım istərəm.

Tahirinlə xoşbəxt yaşa Fəziləm,
Qəriblikdə sənsiz qala bilmirəm.
Qalsam da heç rahat ola bilmirəm,
Sarıgül Yağmur tək yağmaq istərəm.
Sizli xoşbəxtliyə batmaq istərəm.

**Ay xalam oğlu**

Xasiyyəti xoşdur, əsli insandır,
Həm qəlbi kövrəkdir, çox mehribandır.
Təmiz əqidəli həm də qanandır,
Nəslimin gözüsən ay xalamoğlu.

Vicdan tərəzisi daim önündə,
Bacarıqla seçər çürüyü, safı.
Milli dəyərləri qoruyar özü də,
Hər yerdə etikalı, gözlər insafı.

Qanan üçün qanuni istiqamətçi,
Həm ailədə, həm kollektivdə nəzarətçi,
Qoy qəbul etsin şəhərli, həm kəndçi.
Təvəkkümün inan niyyəti düzdür,
İnsan kimi insan əxlaqı təmizdir.

İçki içməz, siqaretdən kənardır,
Əsil ailə babası əyarı namusdu, ardı,
Onun fəxr etməli ailəsi vardır,
Sənlə fəxr edirəm ay xalamoğlu.

Cəlal, Aliyə gözəl balalarındı,
Onların cəmiyyətdəki yüksək adı,
Dövlətindi, varındı.
Bu çətin dövrdə belə ailə başçısı olmaq,
Bax, sənin vüqarındı
Nəslimizin fəxrisən xalamoğlu.

Səviyyəli, dəyərli bacıların var,
Şəhla kimi adlı-sanlı şöhrətli yarın var,
Sənə dəyər verən qohumların var.
Nəvələrdən də sevinəsən xalaoğlu,
Asiminlə, Aygün ilə öyünəsən xalaoğlu.

Sarıgül Yağmur deyər sözün düzünü,
Yaşa doğmalarınla yaşın yüzünü,
Nəsil-kökümüz həmişə uca tutacaq sözünü.
Çünki sən buna layiqsən xalaoğlum,
Həm də nəslimə dayaqsan xalamoğlu,
Gələcəyə də mayaqsan xalamoğlu.

## Gözəl insan

*(Mərifət xanıma həsr olunur)*

Sən duyğusu gözəl, şəxsiyyəti özəlsən,
Səni vəsf edəcəm zaman zaman,
Buna vardır əsas buna inan.
Qəlblərə dolmasın yersiz güman,
İnan buna gözəl insan inan.

Nə gözəl qəlbin var sənin, ay gülüm
Allah çox görməsin bu səadəti,
Səni tanıyandan belə görmüşəm,
Məni məndən alan qəlb səltənəti,
Sənsən bu dünyanın əsas ziynəti,
Allah çox görməsin bu səadəti.

Tək səni sevmişəm tənha çağımda
Dəyişməz ünvanı mənim sevgimin.
Xoş sözlərin qəlbimin məlhəmi olub,
Sarıgül Yağmurun ilham pərisi,
Könlümün şahzadəsi bu Mərifət xanım.

## Gözəl insanlar

*( Təbrizli Eldar və Dilarəyə həsr edilir)*

Taledən bir daha şikayətim yox,
O çıxardı sizi qarşıma mənim.
Qəlbim bir diqqətə təşnədir dostlar,
Bundan gözəl görən dünyada nə var, ay Eldar?

İlahi qüdrəti vardır səsində,
Bülbül şaqraqlığı gur nəfəsində,
Xoşbəxtlik duyğusu Dilarə çöhrəsində.
İlahi qorusun bu səadəti,
Hər ikimizdəki o sədaqəti.

Dilarəm, sən mələk xislətlisən,
Abırlısan, həm də cox ismətlisən,
Cəmiyyət içində nəzakətlisən,
Onunçün el içində hörmətlisən.

Xəyalım qarışdı arzularıma,
Mən sadiq qalacam bu ilqarıma.
Sizi vəsf edəcəm təmiz ürəklə,
Eldarım, Dilarəm sizli diləklə.

Bir cüt oğul balan səndən güc alsın,
Aydının Abdinin daim ucalsın,
Gözəl Dilarən də onlarla fəxr etsin,
Oğul barın yesin xoşbəxt qocalsın.

O səs qulağımdan inan getməyir,
O məsum Dilarəm cox gözəl insan,
O həm kövrəkdi həm də mehriban.
Sizə xoşbəxtlikdir diləyim inan,
Sarigul Yagmur gəlib sizə mehman,
Sizi unutmaram bilin heç zaman,
Qoy sizi qorusun Ulu Yaradan.

## Aynurum

*(Təbriz səfirliyinin əməkdaşı )*

Tanriya borcluyam, təkcə Tanriya.
O çıxardı səni mənim qarşıma,
Allah ayırmasın sevən qəlbləri,
Sənə bənzər yoxdu ay gözəl Aynurum.

Mən indi bildim ki, təmiz eşq nədir,
Sevgi heç bir sərhəd, nə də səd tanımaz.
Bax indi bildim ki, bu arzu böyük,
Tanrım heç vaxt sevənləri ayırmaz.

Bax indi görürəm duyğum dənizdir,
Sənə bu isdəyim su tək təmizdi.
Sənə qovuşmaqçün düşdüm bir yola,
Bu gözəl isdəyimsə çox özəl bir izdir.

Mən belə görürəm qala bilmərəm,
Sənsizlik ən böyük əzabım olar,
Mən indi bildim ki, yanan qəlbimə,
Bir damlacıq sevgin təmiz su olar.

## Unutmaram

*(Ərdəbilli Mehran Əzizpura)*

Sən mənim gülümsən səni bəslərəm,
Hər bahar səhəri səni səslərəm.
Durub yol üstə yolunu gözlərəm.
Səni unutmaram inan bicə an.
Sən mənə əzizsən gəl buna inan.

Qızılgüldü derlər güllərin şahı,
Mənim sevgimsə o şahın pənahı,

Təki bu istəyim görməsin acı.
Səni unutmarm inan bircə an,
Sən mənə əzizsən bil bunu Mehran.

Gül ləcəyin səpsən ayağlarına,
Qönçəsini sürtərəm yanağlarına,
Gülabın çəkərəm dodaqlarına.
Sən mənim gülümsən ucuz tutmaram,
İnan səni Mehran mən unutmaram.

Mənim şirin balam mənim canımsan,
Sən mənim qəlbimdə bir mehmanımsan,
Həm də səviyyəli mehribanımsan.
Doğma tək sevimli Mehranımsan,
İnan səni heç vaxt mən unutmaram.
Sarıgül Yagmur tək neçə ki varam,
Mehran səni heç vaxt mən unutmaram.

## Səfirlikdəki Aynur xanıma

*(Təbrizdə Azərbaycan səfirliyinin əməkdaşı Aynur xanıma)*

Səni gördüyüm, səsini eşitdiyim gün,
Bu qərib vətəndə könlüm açıldı.
Səsinin o xoş doğmalığından.
Aynurum könlümə şəfəq saçıldı.

Gün-gündən qoy artsın şöhrətin sənin,
Çünki təmsil edirsən doğma Vətəni.
İndən belə gülsün üzünə tale,
Yaşayasan doya-doya gülşəni.

İnsanlara qarşı çox diqqətli ol,
Özün çox gözəlsən, mələk xislətli ol.
Həm şərəfli, həm də ləyaqətli ol,

Tutduğun vəzifədə cəsarətli ol,
Gözəl olduğun tək mərifətli ol.

Aynurum çox kövrək nota toxundun.
Ana-atasızlıq nədir bilirəm,
İçimdə kövrəklik üzdən gülürəm.
Səni də öz doğma qızım bilirəm.
İndi Sarıgül Yagmur anadır sənə.
Qoy səni qorusun böyük kimsənə.
Bu sözü deyəcəm mən dönə-dönə
Bu şerimdə hədiyyə olsun sənə.

**Ağa Səid Fyüzat cənabına**
*(Ərdəbilli)*

Marağlı bir həyat yolun var sənin.
Dəyərli övladısan Səid bəy doğma vətənin,
Çox hörmətli, nəzakətli anan var sənin.
Sənin tək oğlu çox olsun vətənin.
Çünki çox lazımlıdır sənin əməlin.

Ay Səid gözəllik var içində sənin,
Həm də fərasətli, qabiliyyətlisən,
Elin hər bir dəyərli ovladıyçün,
Dəyər verməkdə düz niyyətlisən.
Çünki vətən övladı tək çox qeyrətlisən,
İnsanlıq adında çox qüvvətlisən.

Gözəl bir niyyətçün rastlaşdıq sənlə,
Sən mənə qanad ol, mən sənə dayaq.
Sənə bu xoş məqamları anlatmaqçün,
Gecəni yatmadım qalmışam oyaq,
Bu yolda Allah olsun qoy bizə dayaq.

Səyidim mənimçün çox dəyərlisən,
Sənsiz qalsam üzüm gülməz ki mənim.
Bu cür istedadla qoşa yaşlanaq,
Ana-bala kimi doğma adlanaq,
Poetik aləmdə qoşa odlanaq.

Çünki allah vergisi könüldədir,
Xoş əməl, sözümüz daim dildədir,
Sarıgül Yagmur da sizin eldədir,
Sizdən bəhs etməsi daim dildədir.

## Bayramınız mübarək

Zaur sizdən uzaq olsun xata, yoxuşlar,
Ömrünüzə qəm salmasın naxışlar,
Bəxdimizə çıraq tutsun alqışlar.
Fəridəm, Zaurum sizi qorusun xoş dilək,
Bahar bayramınız olsun mübarək,
Xoşbəxt taleyinizdən daim sevinək.

Əziz Armidam, övladınız belə igid, mərd olsun,
Onları xatadan Allah qorusun.
Qapınızı tanımayan dərd olsun,
Yüz il ömür sürün sağlam, saf ürək.
Bahar bayramınız olsun mübarək.
Balalarım, daim xoşbəxt, gününüzü görək.

## Həyat yolları

*(Nəvəm Ramoşa)*

Kövrək arzuların qanadlarıyla,
Uçan xəyallarım ləçək-ləçəkdir.
Bir gün xəyallarım gerçəyə dönüb,
Sənin gözlərinə görünəcəkdir.

Dayanıb önündə gülümsəyəcəm,
Səni xoşbəxtliklə təbrik edərəm.
Buyur, tale üzünə güldü Ramilin.
Uşaq tək gözünə baxacam sənin.

Yaman darıxıram inan əzizim,
Suallar içimdə nidaya dönür.
Səsinlə sakitlik tapır ürəyim,
Pıcıltın ən doğma sədaya dönür.

Sən də darıxırsan balam, bilirəm,
Bilirəm hicranın yükü yamandır.
Bu yola çıxmışam artıq gəlirəm,
Gözləmək üzməsin səni amandı.

## Unutmaq çətin

*(Laləmə)*

Sevgimiz sonsuzdur sevgimiz inan,
Tək buna şahiddir böyük Yaradan.
Sevgimiz tükəmməz, sevgimiz böyük,
Odur ki, duracam bax, başı dim-dik.

Mənim bu sevgimə canım da qurban.
Çünki qəlbimdədir artıq hər bir an.
Kaş ki, ayrılmayaq Tanrım, heç zaman,
Qoy bu istəyimiz bitməsin bir an.

Mənim bəxt ulduzum tər çiçəyimsən,
Həm qəlbi təmizim, həm göyçəyimsən.
Həm doğma qızımsan, bax gerçəyimsən,
Qoy bizi qorusun Ulu Yaradan
Səni unutmaram Laləm heç bir an.

## Ruslan

Tərifin sığmaz ki, kitaba sözə
Gözəl əxlaqınla gəlməyəsən gözə
Tutduğun mövqeylə aləmi bəzə
Halal yol tutmusan yüz yaşa Ruslan,
Əziyyətin, zəhmətin heç getməsin boşa Ruslan.
Halal zəhmətinlə hər gün insanlarla təmasdasan,
Hər işində, əməlində sakitcəsən, asdasan,
O qədər dəqiqsən ki, elə bil ki, postdasan,
Bu davranışla inan çox xoşbəxt olacaqsan,
Qanacaqlı insanlardan təşəkkür alacaqsan.

İşinin başındasan hər gələnə baxmazsan,
Bəzi gənclər kimi, hər çuxura axmazsan,
Nə də ki, boş mənasız sözləri qafana taxmazsan.
Sakitcə gələnlərə hörmətlə yanaşarsan,
Nə şitlik eləmirsən, nə də ki, heç çaşmırsan.

Dünyada kaş hamı sən tək olaydı,
Yaddaşda, xatirdə beləcə iz salaydı,
Halal zəhmətiylə sən tək gözlərdə ucalaydı,
Atan İman kimi bax başı dik qalaydı,
İnsanlarla təmasda dili uzun olaydı.

Odur ki, xeyir duası sənə şer qəzəldən,
Çünki şairədir bu gəlir əldən.
Atan İman, anan Zinyət səndən güc alsın,
Sənin tək qeyrət rəmzi ilə qardaşların ucalsın.
Gözəl ailən, balaların üzü gülsün,
Sənin bu təmiz niyyətin dəyərin Tanrım versin.

Balaların Aygün, Günay, Tunarla,
Bir ömür xoşbəxt yaşa sən.

Gözəl xanımın Gülnayməylə,
Sağlam qocalasan Ruslan qoşa sən,
Bu gözəl diləklərimlə yaşa, yaşa, yaşa sən.

Ay Ruslan mərdliyi sən vermə əldən,
Çünki xeyir gəlməz pisliyə eldən.
Həyat mərdə arxa, namərdə qənim,
Sarıgül Yağmur görüb bunu əzəldən.

**Qonşum Nabat**

Dəyərli qonşum Nabat,
Səni hər arzuna çat.
Pislikləri başından at
Səni sıxmasın həyat.

Arzum budur muradına çatasan,
Narahat günlərin daşın atasan,
Yatanda evində rahat yatasan.
Səni bu zamanda sıxmasın həyat.

Səni sıxmasın həyat,
Nabat hər arzuna çat,
Ol Allaha amanat,
Neçədi yaşın Nabat?
Vəfanla yüz yaşa çat.

Həyatda göstərirəm sözlə olan mərifətimi,
Mənə dəyəri olanlar da verir qiymətini,
Çünki mən gərəksizin istəmirəm söhbətini,
Hər bir insan kamalıyla yaşadar şəxsiyyətini.

Ömür karvanın ötən illəri,
Yaşının üstünə qoy yaş gətirsin

Açılsın bağçanda qönçə güllərin.
Hər bahar kədəri səndən ötürsün,
Ağrı-acıları səndən götürsün,
Ömrünü yüz yaşa sağlam gətirsin.
Sarıgül Yagmuru cuşə gətirsin.

## A qardaş

Sən ey dünya görmüş zəhmətkeş qardaş,
Gənc yaşdan tanışıq, bax keçsə də yaş,
Yoldaşın Zinyətlə də qonşu kimi,
Xeyirdə, şərdə də oluruq yoldaş.

Ay İman, xalqımın zəhmətkeş oğlusan,
Sevdiyin Zinyətinə gözəl həyat qurmusan,
Dəyərli oğulların dalında da durmusan.
Həyat boyu gözəllikdən zövq alasan,
Tanrının sevimli qulu olasan.

Gəlirdən, çıxardan vardır xəbərin,
Təmiz söz deməyə çoxdur hünərin,
Şərəflə doldurdun həyat dəftərin.
Ailədə də sözün keçərli qardaş,
Tanrı mükafatıdır Zinyət sənə yoldaş.

Sən hələ də zəhmətə qatlaşırsan,
Oğulların Xəqaniylə, Elmanla, Ruslanla,
Bu yolda əl-ələ dostlaşırsan.
Bir ailə babası kimi ürəklə yanaşırsan,
Arzumdur ki, əməyin itməsin İman qardaş,
Bu ömür yolunda xoşbəxtlik olsun sənə yoldaş.

Sarıgül Yağmur deyər sözün düzünü,
Görəsən sən yaşının sağlam canla yüzünü,

Görəsən ətrafında doğmaların üzünü.
Bizdə gələk təbrikə səni ay İman qardaş,
Bizi sevməyənlərin başına olaq bir daş,
Nə edək Allah yaradıb deyirik, a qardaş.

**Ehtiyacım var sənə**
*(Asəfin 70- illiyi münasibətilə)*

Həyatımın bəzəyi, fəxr edirəm səninlə,
Mülayimləş, kobud olma mənimlə,
Mənalı bir ömür keçdik səninlə.
Üç övladı bəxş elədik həyata,
Mən cəfakeş ana oldum, sən də dəyərli ata.

Sənsən mənim tək arzum, tək diləyim,
Ağrıdığım dar günümdə gərəyim,
Asəf halal olsun sənə əməyim.
Cəkmə siqareti, ziyandır sənə,
Bunu deyəcəyəm mən dönə-dönə,
Cünki mənim ehtiyacım var sənə.

Yığılmır yollardan fikrim, xəyalım,
Görən qəriblikdə kimim var mənim.
Hamıya xoş gələn sözüm, söhbətim,
Özümü ağladan qəmim var mənim.
Cünki dərd yüklü bir gəmim vardır,
O gəmi yükündə dörd növ xəstəliyim qübardır.
Amma ki, dəstəksən ehtiyacım var sənə,
Qoy bizi qorusun Ulu Kimsənə.

Sarıgül Yağmur səni səslər düzlüyə,
Yetmişin mübarək, gedək yüzlüyə.
Bir-birmizin sağlamlığın izliyək,
Övladlar da ürəkli qocalsınlar,
Baxıb bizim sevgiyə güc alsınlar.

## Həşim həkim

Həşim həkim sənlə qonşu olmuşam,
Yaşlanmışam indi yaşa dolmuşam,
Başımda dumanlar içində qalmışam.
Bəlkə bir çarə qılasan başıma,
Vaxtsız əcəl gəlir mənim qarşıma.

Götür sinəm üstən bu ağır dağı,
Qıyma bir ocağın sönsün çırağı,
Məsləhətinlə Asəfin sən ol dayağı.
Mənli yaşamağa vardır marağı,
Bizik bu yaşda bir-birimizin arxa-dayağı.

Həyatın bu şirin, bu yetgin çağı,
Gözəl bir insan tək gəl ol dayağı.
Sənsən Naftalanın məşhur insanı,
Gözəl bir ailənin şahı sultanı.

Göyçək həkim kimi gözəl yarın var,
Bəhruz, Fariz kimi istedadlı balaların var.
Qoy onlarla fəxr etsin sizi tanıyanlar,
Çünki bu balalarda sənin özəl payın var.
Həşim həkim qoy sizi qorusun Ulu Pərvərdigar,
Bu şer də Sarıgül Yağmurdan sizə yadigar.

## Ailə atası

Bir ömür yaşamaq olubdu çətin,
Ailə atası tək oldu zəhmətin.
Çəksən də illərin sən əziyyətin,
Samir tək oğulun yetişdi mətin,
Tanrı versin balaların qismətin.

İnsanlıq qanıyla yoğrulmuşuq biz,
Mərdlik qarşısında dayanmışıq düz,
Sizin tək mərifətli insanlar, Bəylər qardaş.
Bu qərib könlümə salıb doğma iz,
Səni daim görmüşəm qəlbi təmiz.

İllərdir qonşu tək mehriban olub,
Bir şəhərdə işləyib yaşa dolub,
Gözəl balalarının müəllimi olub,
Onların qəlbinə xoş iz salmışam.
Bax beləcə yaxın, doğma qalmışam.
Naqilə müəlliməylə iş yoldaşı olmuşam.

Yüksək mənəviyyatlı balaların var.
Onlarla fəxr elə daim ye nübar
Bir ömürü zəhmətlə, alın təriylə
Bax belə yüz yaşa qəlbində vüqar.
Sarıgül Yağmur bacın səni alqışlar.

**Aylinim**

Bu bir tale yükü biz daşıyırıq,
Alın yazısını biz yaşıyırıq,
Hərdən qaysaqlı yaranı qaşıyırıq.
Kaş ki, bu ayrılıq çataydı sona,
Xoşbəxtlik mələyi çiyninə qona,
Bu həsrət, bu özləm tez çata sona,
Aylinimi birlikdə böyüdə ata-ana.

Könlüm istərdi ki, hər ayım, ilim,
Sənlə birgə keçəydi gözəl Aylinim.
Sən könül bağımda bitən çiçəksən,
Həm həssassan, həm də bir az kövrəksən.
Aylinim, sən hamımıza gərəksən,

Kaş ki, bunu duya biləsən Aylin.
Hər məni görəndə güləsən Aylin,
Hərdən çıxıb bizə gələsən Aylin.
Sarıgül Yağmura nənə deyəsən Aylin.

## Zəhmətkeş insan

*(Ocaqverdi Hidayətovun ad gününə həsr edilir)*

İnsan kimi insansan,
Səviyyəli, qabiliyyətli, təmiz bir ailə kimi
Daim yadda qalansan,
Bax elə ona görə bu təbriki qazan sən.

Bu gün ad günündür, ay Ocaqverdi,
Düşündüm bu günü tarixə salım,
16, 6, 1966, 2016 rəqəmlərini,
Maraqlı faktor tək yaddaşa salım,
Özüm də bu xidmətlə qonağın olum.

Müqəddəs bir babanın övladısan sən də,
Mən də qürur duyuram həm Xəzəllə, həm sənlə,
Mənəviyyatca təmiz, gözəl ailəsən sən də,
Övladların fəxr etsin hər yerdə söz düşəndə.

Halal zəhmət əyarın olubdu gənc yaşından,
Heç kəs çıxara bilməz bu olanı başından.
Heç yerdə geri qalmır dostundan, yoldaşından
Çünki halal çörəkdir bu ailənin məramı
Onun xanımı Xəzəl heç sevməyir haramı
Bir yerdə işləmişik, onu tanıyır hamı.

Ay Ocaqverdi, bu ad günün mübarək,
Əziz oğlun Fərahimin toy gününü də görək,
Nəvələrin Xalidə və Zəhranın xoşbəxt taleyin görək.

Sən çox gözəl insansan bunu qoy hamı bilsin,
Bu şe"r hədiyyəmlə sevənlərin sevinsin.

Yaraşıqlı, ağıllı Fərahimə xoş dilək,
Bir gün yığışaraq biz onun toyuna gələk.
Sarıgül Yağmur desin oğlan toyun mübarək,
Ay Ocaqverdi, səni daima xoşbəxt görək.
Çünki sən qazanırsan halal zəhmətlə çörək,
Sevənlərinlə birgə 100 yaşını qeyd edək,
Amin, amin ay oğul amin deyək.

**Aliyəm**

Gözəlliyi, təravəti üzündə,
Danışdıqca sevinc yağar gözündən,
Daimi bir cəsarət var sözündə,
Odur ki, hörmətlidir el gözündə.
Arzum budur xoşbəxt yaşa Aliyəm,
Əməyin getməsin boşa Aliyəm.

Əməyiylə, hünəriylə ucalar,
Əlçatmayan zirvələrdən var olar,
Bala bəslər, nəvələrdən güc alar.
Asiminlə qoşa yaşa Aliyəm,
Ayağın dəyməsin daşa Aliyəm.

Sinəsində məhəbbəti bitməyir,
Bağladığı əhdi- peyman itməyir,
Haqsızlıqla könlü yola getməyir.
Nadanlara fikir verməz Aliyəm,
Layiqsizdən söz götürməz Aliyəm.

Məlahət var o işvəli gözündə,
Kişi-kişi mərd dayanar sözündə,

Ana kimi bu dünyanın köksündə.
Gözəl, özəl iz qoyubdu Aliyəm,
Sarıgül Yağmur deməyə söz qoyubdu Aliyəm,
Xanımlığı ilə dünyamda iz qoyubdu Aliyəm.

**Pərvanəmə**

İstər səni hər tədbirdə ürəyim,
Ay niyyətli gözəl, qəlbi kövrəyim,
Tanrıdan xoşbəxtlikdir sənə diləyi.
Vaqifinlə yaşa qoşa Pərvanəm,
Bir ömrü şərəflə yaşa Pərvanəm.

Eşitmişəm poeziya sevənsən,
Duyğulusan, ilahidə görənsən,
Bu müqəddəs bir amaldır güvən sən,
Mehdidən, Hüseyindən arzuna çatarsan.

Nərgizinlə sən rahatlıq taparsan,
Doğma Şəbnəmimdir hey səni öyən,
Bax həyat belədir gərdişdir deyən,
Gözəl Pərvanə Vaqifinlə sənə bir ömür uğurlar.

**Şəbnəmə**

Arzumdur hər xoşbəxtlikdə,
Tanrım pay versin sənə,
Biz də şərik olaq,
Şükr edək dönə-dönə.

Məni duyğulandırır sənin həzin keçmişin,
Gözəl təsadüfdür sənin gəlişin.
Məni riqqətə gətirir sənin mənalı gülüşün,
Arzum budur ay Şəbnəm avand olsun hər işin.

Düzdü xatirələr də nağılın bir tayıdır,
Yaşanan hər bir an bizə tanrı payıdır,
Düşünmə ki, evində olduğun əmidir ya dayıdır.
Çünki sən mənim ruh əkizimsən,
Həm qohumum, həm doğmam, həm də ki əzizimsən.

Nailə, Mehdi kimi dəyərli insanlar,
Pərvanəm şükür ki, həyatında var.
Odur ki, Vüsalınla daim xoşbəxt olasan,
Həsən, Fərid gözəl ana paylarınla alasan.
Çünki həm zəkalı, həm əxlaqlı həm də gözəl balasan,
Sarıgül Yağmuru da daim yada salasan.

## Azər həkim

*(Sevimli şagirdim diş həkimi Azərə həsr olunur)*

Azər həkim, alicənab oğulsan,
İnsanlıq dasdanında çox şirin bir nağılsan.
Həm bilikli, ləyaqətli, gözü tox,
Allah səni bu elə görməsin çox.

El içində nüfuzlusan, üzün ağ,
Yüz il xoşbəxt yaşa olsun canın sağ,
Xata-bəla olsun ailəndən uzağ.
Allah səni ailənə bağışlasın,
Ailəni də nəzərində saxlasın.

Azər həkim, elin səndən güc alsın,
Sevənlərin sənlə birgə qocalsın.
Gəncliyini vəsf etdiyin Vətəndə,
Hər yerdə şöhrət heykəlin ucalsın.

Yaşa Azər Aybəniz gülünlə yaşa sən,
Elşəndən, Ayşəndən sevinəsən qoşa sən.

Ömür yollarınız çiçəkli olsun,
Ailə büdcəniz ruziylə dolsun,
Sizi bəlalardan Allah qorusun.

Sarıgül Yağmur müəllimin olmuşdur,
Gözlərinin önündə yaşa dolmuşdur,
Siz tək balaların vəsfini kitablara salmışdır.
İndisə budur fəxr edirəm səninlə,
Poetik dünyaya gedirəm səninlə,
Tarixləşən yaddaşa imza edirəm səninlə.

**Təsadüf**

İbrahim, xalqımın zəhmətkeş oğlusan,
Sevimli Bəsdi ananın göz işığı barısan.
Həyatını bəzəyəcək biri ilə,
Xoşbəxt yaşa birgə ömür, yolu sən.

Bu həyatdan doyunca kam alasan,
Xalqımızçün sən alınmaz qalasan,
Ləyaqətli, çox da təmiz balasan,
Gözəl ömür yolunla həyatda iz salasan.

Sən mənim gözümdə saf bir həqiqət,
Səndə vardır həm tərbiyə, mərifət.
Ürəyimə bahar ruhu gətirdin,
Ay İbrahim, sənin toyunu görək,
Halay çəkək Tahirlə, Fəziləylə gərək.

Sarıgül Yağmur yaddaşa iz salandı,
Səni görcək qəlbimdə ocaq yandı,
Yoldaşım Asəf də insan tanıyandı.
Odur ki doğmalaşdın bir anda,
Bax bu şe"rim də yarandı o anda,
Mən sevinərəm yada salınanda.

## İradənin İradəsi

*(İradə xanımın nəvəsinə)*

İradənin İradəsi,
Nənələrin göz didəsi,
Bax daima gəlsin səsi.
O bir nəslin göz didəsi,
Çox şirin qızdı bu qız,
İşvədi nazdı bu qız.

Kimi görsə sevinər,
Əl, qol atar əylənər,
Əzizləri öyünər,
Şükür xoşbəxt görünər.
Şirin baladı bu qız,
Dərdə dəvadı bu qız.

İradə nənənin sevinci,
Bu qız parlaq bir inci,
İradə-Təhməzin nadinci.
Aysel, bundan az inci
Çünki gözəldi bu qız
Ailədə özəldi bu qız.

Sevinərdi Malik baban,
Yeri olsun cənnət məkan,
Sevir səni bibin Fidan.
Dayın Tofiq, bibin Aygün,
Sevinirlər gördüyü an.

Sevir səni Sevinc nənən,
Çün onunda nəvəsisən,
Bu xoş gündə İradə nənənin.
Şairə dosdu, Sarıgül Yağmur,
Vəsf edəcək səni hər il.

## Sevimli Ayxan

Sevgi, məhəbbətin, təmiz əxlaqın,
Təmiz meyvəsisən əziz Ayxanım.
Ən gözəl nəğmədir varlığın sənin,
Sən ilk nəvəsisən Təvəkkülün, Şəhlanın.

İstəklə, ürəklə oxşa onları,
Sənsən Asimim, Aliyənin vüqarı.
Şirincə dayı payısan Cəlalın,
Gözümdə ayrı aləmsən Ayxanım.

Sənsiz ləzzəti yox meşənin, dağın,
O gözəl yerlərdir sənin oylağın,
Gün gələr bir gözəl qız olar qəlb qonağın.
Onda elçiliyə gedərik canım,
Ən ümdə arzusudur nənən bu Şəhlanın.

Ən böyük zirvələri fəth edəsən,
Xoşbəxt ömür yoluyla gedəsən,
Təvəkkülü xoşbəxt ulu baba edəsən.
Nəslinin fəxridir Təvəkkül baban,
Ona can sağlığı diləyimdir Tanrıdan.

Asim ata qoy səninlə fəxr etsin,
Yüksək naliyyətlərinin ardınca getsin,
Əziz atan kimi bunu haqq etsin.
Çünki Aliyənin can yoldaşıdır,
Arzularına şərik, ürəyinin başıdır.

O körpəcə Aysu sənin bacındır,
Gözəl əxlaqıyla baş tacındır,
Sənlə fəxr edəndir çünki bacındır.
Sarıgül xanımdan bu şer sənə hədiyyəm olsun,
Tarixləşən kitabımda sənə uğurlar olsun,
Xəta-bəlalardan səni Tanrım qorusun.

## Ceyranım

Ceyranım, qəlbimdə özəl yerin var,
Ürəyimdə aşır-daşır arzular.
Xəyallarca görüşürük Ceyranım,
Xəyalları reallaşdırmaq olar.

Sən bizə gələrsən, mən də ki, sizə,
Oturub dərdləşərik üz-üzə.
Nə zaman ki, biz gəlirik göz-gözə,
Şirin duyğuları qarşılaşdırmaq olar.

Sənsiz gözlərimdə virandı dünya,
O şaqrat gülüşü özləyəcəyəm.
Sənin gəlişinlə güldü gözlərim,
Sarıgül Yağmurun düzüldü sözləri,
Səni ömrüm boyu gözləyəcəyəm.

## Bir yol yoldaşım

Sonsuz arzularla yaşayır insan,
Təsadüfi yolculuq bizi rast saldı o an.
Yol boyu danışdıq sözdən, qəzəldən,
Sanki tanış idik biz lap əzəldən.

Təbiətdə həyat mövcud olandan,
Yaranan can atar yaşamaq üçün.
Sabahın tələbin hiss edib bəzən,
Dünənin yükünü daşıyür bu gün.

İnsan ürəyinin aynası gözdür,
Ordan gələn işıq alovdur, közdür.
Yol boyu poetik anlar yaşadıq,
Yolculuqdan razı qaldıq bu düzdür
Onunçün ay İlkin, xatirin əzizdir.

Azəri yurdunun oğlusan sən də,
Fəxr edəcəm hər səndən söz düşəndə,
Hərdən yolun düşsə bax sizin kəndə.
Orada bizim doğmaların da yurdu var,
Qoy səni qorusun o Pərvərdigar,

Necə gəlir, necə keçir bu günlər,
Neçə-neçə açılmayan düyünlər,
Sarıgül Yağmurçün dəyərli bu günlər.
Qoy biz rastlaşdırsın toy düyünlər,
Həmişə qismətimiz olsun xoş günlər.

## Gülverdi qardaşıma

İnanıb insani sədaqətinə,
Mərifətli insan tək ünsiyyətinə,
Milli dəyərlərin ülviyyətinə,
Səni sadiq gördüm, Gülverdi qardaş.

Mənimlə, ailəmlə ünsiyyət qurdun,
Qeyrətli insan tək qulluqda durdun,
Ailənə, sədaqətinlə qəlbimdə yuva qurdun.
Uğurlu, radarsız yolların olsun,
Səni xətalardan Allah qorusun.

Saf övladlar yetişdirmisiz qoy üzünüz ağ olsun.
Oğlanların Sərdar, Seyfəddin, Qurban,
Birdə Saməddin sağ olsun.
Qəhrəman ana tək Zərbab xanımın.
Daima sizlərlə keyfi çağ olsun,
Altı qız ətrafda qoy çıraq olsun,
Hər yerdə işiniz qoy avand olsun.

Əminə, Rəsmiyə, Aygün və Həyat,
Dilrubə, Məhluqə gəl anaya çat,

Qoy sizi sıxmasın bu gərgin həyat.
Nəvələrdən də xoş gün görəsən,
Sevimli Zərbabınla bizə də qonaq gələsən.

Düzdür tutduğun yol, haqdır diləyin,
Əqidən təmizdir, safdır ürəyin,
Sarıgül Yağmur deyər yerinə yetsin,
Allahdan umduğun hər bir isdəyin.
Ailənin başından əksik olma sən,
Ay qardaş, heç bir vaxt darda qalma sən.

## Yaxşı ki, dünyada vardır yaxşılar

Yaxşı ki, dünyada vardır yaxşılar,
Yoxsa bu gözəllik yalan olardı.
Gözəl münasibət, bir də ləyaqət,
Qiymətsiz olardı, yalan olardı.

Əzəmətli bir qüdrət var adında,
İşində realsan el qızınar odunda,
Ay Şəhriyar, yaxşı saxla yadında,
Düzlük müqəddəslik o yoldasan sən.

Xeyirxahlıq olsun sənin vərdişin,
İnsanlığı sevindirsin hər işin,
Əzbər olsun qoy dillərdə gərdişin,
Sənə inanıram o yoldasan sən.

Sarıgül Yağmur deyir istəyini, sözünü,
Xoş təbəssüm qoy bəzəsin üzünü,
Ədalət yolunda danış sözün düzünü,
Mənim ümidim var o yoldasan sən.

## Gözümüz aydın

Sən mənim canımsan, qolum qanadım,
Səninlə ucalır hər yerdə adım,
İstəyirəm fəxr etdiyim bu adın,
Kölgəsində böyük nəsil ucalsın,
Abduləziz balam Tanrıdan güc alsın.

Bu həyat yolunda dayandım mənim,
Gördüm elm öyrənmək çətindir, çətin,
İtirmədim müəllimlərin diqqətin,
Qazandın qeyrətlə elin hörmətin,
Əməyin itməsin ay Abduləziz.

Atanın əziyyətin yerə vurmadın,
Ananın o həssas qəlbini qırmadın,
Qardaşın ehtibarın uçurmadın,
Babaların, nənələrin ümidlərin uçurmadın.
Sənin əməyin itməsin ay bala,
Səni heç bir sıradan qalma dala.

Ulu Tanrım qorusun səni hər bir bəladan,
Qoy uzun ömür versin sənə bizi Yaradan,
İndi özünü qoru, yaddan gələn xatadan.
El-obana xeyir ver elə bizi bəxtiyar,
İndi göstərər tale qarşıda görək nə var,
Sarıgül nənən sənə diləyir bax uğurlar.

## Zeytun gözlü Sədaqətim

Sənlə çox tutur söhbətim,
Hər bir işdə sən ol mətin.
Arzum budur səni xoşbəxt olasan,
Bir ömür beləcə gözəl qalasan.

Sədaqət, hamıyala xoş ülfətlisən,
Ailənə, dostuna sədaqətlisən,
Yaxından tanıdım çox mərifətlisən,
Arzum budur səni xoşbəxt olasan
Çünki çox şirinsən, gözəl balasan.

## A Aydın müəllim

Aydın müəllim hər arzuna çatasan sən,
Xatirə xanımla birgə ömür yaşa sən,
Pərviz, Şəmsi və Nurlanla yarı, yaşa sən.
Çünki ləyaqətli gözəl atasan,
Mənəvi dünyası zəngin atasan,
Gözəl gözlü Xatirənlə
Çətinlikləri boynundan atasan,
Bütün arzularına çatasan, Amin
Ən xoş diləklərim səninlə və gözəl ailənlə olsun
Həyatın xoş anlarla zəngin olsun.

Narahat günlərin daşın atasan
Xatirənlə hər arzuna çatasan
Çünki ləyaqətli, gözəl atasan
Pərviz, Şəmsi, Nurlanından sevinəsən güləsən
Çətin günləri yaddaşdan siləsən
Ürəyin istəyəndə bizə gələsən
Çünki xatirin əzizdi yanımızda.

## Vasif həkim

Bu doğma torpağın oğlusan səndə,
Səninlə qürur duyuram hər səndən söz düşəndə,
Çox özəl diqqət və nəzakətlilik var sən də,
Səni xoşbəxt yaşayasan Vasif doğma Vətəndə.

Vasif həkim alnın açıq, üzün ağ,
Yüz il xoşbəxt yaşa, olsun canın sağ,
Sən olasan bədnəzərlərdən uzaq.
Ailə və elin gözündə böyüksən, ucadan uca,
Çünki el içində qəlbin təmiz, üzün ağ.
Hamı bilir bacarıqlı həkimsən,
Vəzifənə ləyaqətlə təhkimsən,
Qapına gələnə sormadan kimsən.
Qayğı, diqqətini verirsən həkim,
Səndən inciməyib inan heççə kim.

Yaxşı işin üçün sağ ol deyirəm,
İnsanlığın önündə baş da əyirəm,
Sarıgül Yağmuram düzün deyirəm.
Səni unutmaram ay Vasif həkim,
Şerim sənə qalsın yadigar həkim.

**Görüş günü**

*(Nigar xanıma)*

Nəsil kökü ilə yaxşı ad alan,
Dünya görüşüylə yaddaşda qalan,
Şerə, sənətə marağı olan,
Bir gözəl nigarla görüşdüm bu gün.

Gözündən oxunar qəm gizlədənin,
Qəlbinə dəyilməz qəlbi zədənin,
Bu dünya belədir gəlib-gedənin,
Duyduğun yazmaqla söz qurtararmı.

Ey yayın yağışı yağ narın-narın,
Təmizlə sinəsin düzün, dağların,
Barını təmizlə bizim bağların.
İnsanın da öz balasıymış,
Bala insanın dövləti varıymış.

Sordum gözəl Nigar özündən danış,
Qəlbində qaynayan sözündən danış,
Dərində qüssəli gözündən danış.
Dedi fəxr etdiyim Aynur qızımdı,
Mənim fərəhindi, canım gözümdü.

Aynur bala alimdi, güclü bioloq,
Tanrı qismətimdir, uğuru da cox,
Ağıllı, tərbiyəli, həm də gözü tox.
Taleyin xoş olsun, biz də sevinək,
Nigar xanım Aynurun xoş günün görək,
Biz də qohum kimi qəlbdən sevinək.

Sarıgül Yağmur, səndən ilham alıbdı,
Gözəl auranı yada salıbdı,
Yaddaşımda mələk kimi qalıbdı.
Xoşbəxt olsun Ədaləti, Reyhanı,
Mənlə tanış etdi sən tək insanı,
Tez-tez xatırlarsan sən Naftalanı.

Səni unutmaz bu şairə xanım,
Qəlbimdə yerin var ay Nigar xanım.
Ay Nigar, qəlbimdə özəl yerin var,
Qoy səni qorusun o Pərvərdigar.
Sənlə təmas qurdum təmiz niyyətlə,
Bir ömür sürürsən adla, qeyrətlə.
Yaxşı ki, doğmasan sən Ədalətlə,
Yoxsa kənar səni necə görərdim.
O özəl duyğuna dəyər verərdim,
A alim qızım Aynurdan necə bəhs edərdim.
İlahi payı istedadlı Aynuru necə vəsf edərdim?
Bu ilahi hikmətidir, Sarıgül Yağmurun qismətidir.

## Reyhan

Reyhan keçməkeşli həyat yolu keçmisəm,
Vəsf etməli həyat yolu seçmisəm.
Gözəl Reyhanla, Nigarla, Orxanla, Xanımı,
Mənalı toplumda bir çay içmişəm,
Poetik bir yolla qəlblərə köçmüşəm.

Bu görüşün təsiri ilə sizi də vəsf edəcəm,
Növbəti kitabımda sizdən də bəbs edəcəm,
Sarıgül Yağmuram mən haqq yoluyla gedəcəm,
Qiymətli insanları daima vəsf edəcəm.

## Sevimli Aytənə 26 may

*(Ad günü münasibətilə)*

26 may sənin doğum günündü,
Ürəkdən mən səni alqışlayıram.
Tərifə, Rahilə iştirakıyla,
Bu şeri sənə bağışlayıram.

Dinlə ürəyimi danışdır bir an,
Məhəbbət oduyla alışdır bir an,
Duyğuya sevgini qarışdır bir an.
Ad günün şad günün olsun ay quzum,
Qoy xoşbəxtlik olsun sənə pay qızım.

Ay gözəl Aytənim xatirin var məndə,
Sən zəkalı bir övladsan Vətəndə.
Rauf, Əli qardaşlara istəyi vardır sənin,
Səni tanıdığımçün inan sevindim məndə,
Daim xoşbəxt gəzəsən bu mübarək Vətəndə.

Bu gün istəklər bulaq tək qaynasın,
Şad günündə hamı çalsın oynasın,

Tərifə anan gözəl xonça bağlasın.
Ad günün daima şad günün olsun,
Səni bədnəzərdən Allah qorusun.

Xəqanin ürəkdən, qəlbdən sevinsin,
Mənalı gözləri daima gülsün.
Esma balan daim sizlə öyünsün Aytən,
Ad günün şad günün olsun,
Sarıgül Yağmur qoy vəsf etsin səni.

**Sən mələkmisən**

*(Aybəniz xanıma)*

Gözlər qəlbin aynasıdır deyiblər,
Aynadan dünyaya baxmaq istərəm.
Gözlər ki, aldatmaz bu bir qaydadır,
Həyata gözündə baxmaq istərəm.

O qədər mənalı baxışların var,
Əsən küləyin səsində səni aradım,
Hər gələn baharda, hər bitən nübarda səni araram.
Həzin bir duyğu var baxışların,
Aybənizim, mələyim, səni unutmaram.

Dağ çayının şəlaləsi tək bərraq və safsan,
Hər axşam damlada səni araram.
Gecələr yuxumdasan, gündüzlər xəyalımda,
Çünki baxışlarını unuda bilmirəm,
O doğma baxışların xəfif axışlarını.

Sarıgül Yağmur deyər sözün düzünü,
Tanrım bədnəzərdən qorusun o gözəl üzünü,
Xoşbəxt yaşa 90-nını, yüzünü.
Onda oxuyarsan rəhmət bu şeri yazana,

İndisə uğurlar dilə səni vəsf edən ozana.
Aybənizim, sevimli Azər ailəsinin bəzəyisən sən,
Bir cüt doğma balaların nəfəsisən sən,
Bir şirin nənə kimi də həvəslisən sən.
Zəhmətkeş ailənin üsdə əsdiyi,
Tər bahar gülünün qönçəsisən sən,
Qoy Allah qorusun xatadan səni,
Daim bəzəyəsən Vətən gülşənin.

**Tale yazısı**

Bəzən yorulursan sözlə, söhbətlə,
Müştəriləri qarşılayırsan hörmətlə,
Baxıb şəxsiyyətə, həm də diqqətlə,
İnsanlığa xas olan bir cəhətlə,
Səni belə gördüm, ay İlqar bala,
Səni və ailəni qorusun Allahu-tala.

Bu nə xoş təsadüf, bu nə əməldi,
İlqar bala ilə işimiz rast gəldi,
Bircə saat sonra mebel qapıya gəldi,
Əhval ruhiyyəmiz daha da yüksəldi.

O təəssürat və fərqli baxışla,
İçimdə bir duyğu keçdi alqışla.
Dedim ay şairə bu dəyərli insana,
Yazdığım kitabdan birin bağışla.
Qələmi istəyib adını sordum,
Oturub kitaba imzamı qoydum.

Bəli, qoca dünya hər şey qismətdi,
Tale yazısı da böyük hikmətdi.
Onun kitaba ani baxışı,
Təqdimdən sonrakı o davranışı,

Şairə qayğıdır, həm də hörmətdi.
Məni ona bağlayan da bu diqqətdi,
İlqar insanlıqçün böyük nemətdi.

Bu dünyada yollar yolçular çoxdur,
Ən gözəli, müqəddəsi oxucu qəlbinə gedəndir.
Bu yola çıxmaq üçün gərək qəlbləri duyasan,
Bir baxış titrəyişiylə sən onu qavrayasan.

Sonra bu istəkləri poetik dillə vəsf edib,
Ürək qanında cilalayıb, göz yaşıyla suvarıb.
Taleyin gözəl payı tək oxucuya qaytarasan,
Sarıgül Yağmur xeyir duası alasan.
Bu gözəlliyi haqq edəni tarixləşən yaddaşa salasan,
Kitabınla, əsərlərinlə yaddaşlarda qalasan.

## Ay Eldar həkim

*(Elimin fəxri oğlu Eldar Rəhimova həsr olunur)*

Sağlamlığın keşiyində durursan,
Sən xalqın qəlbində yuva qurursan,
Doğma Vətən Boynəkər üçün Eldar qürursan.
Tanrı səni nəzərində saxlasın,
Allah səni ailənə bağışlasın.

Böyüdük doğma kəndin bucağında,
Hərəmiz bir müəllim ocağında,
Yetişdik doğma, qohum qucağında.
Bunlar olub xatirələr dənizi,
Danışanda kövrəldir də bax, bizi.
Azəri yurdunun oğlusan sən də,
Fəxr edirəm hər səndən söz düşəndə.

Deyirəm ay Eldar, kaş ki, gedərdik kəndə,
Kəndimizə həsrət qaldıq sən də, mən də.

Süleyman dərəsi, o novlu bulaq,
Yarqanlıqdan sonra o əyri bucaq.
Görəsən açarmı o bizə qucaq,
Düşmən tapdağındadı o doğma torpaq.

Həm alimsən, həm loğmansan həm ata,
Halal olsun Sənin kimi övlada,
Ay Eldar, çatasan hər bir murada,
Çünki qardaş, sən elimə gərəksən.

Çox gözəl insan tək mənəvi dəstəksən,
Doğma, əzizlərin səndən güc alsın,
Səni xoşbəxt edib sənlə qocalsın.
Gəncliyini həsr etdiyin Vətəndə,
Bala, nəvələrin sən tək ucalsın.
Sarıgül Yağmur da sizdən mənəvi güc alsın,
Qubadlı, Boynəkər adı gələndə göylərə ucalsın.

**Ayrılıq**

Qərib könlüm sənsiz qaldı bu axşam,
Sənli xəyallara daldım a Pünhan.
Hey dolub boşalmaq gözlərə qaldı,
Həsrətin sədasın aldım, a Pünhan.

Sənsiz öz donunu dəyişdi ruhum,
Qalxdı bir andaca göylərə ahım,
Ermənin boyun mən yerə soxum.
Mən Tap-Qaraqoyunluya necə çıxım, a Pünhan.

O doğma baxışlar getmir gözümdən,
Allam təsəllini doğma gözündən.
Öpərəm nəvə- nəticənin üzündən,
Xatırlaram sənli olan anları,
Şair Pirkazlı xoş zamanları.

## Ay Ehtibar

Mənin etibarlı Ehtibarımsan,
Mənəvi dəyərlim, həm vüqarımsan.
Həm qardaş balası, bacı payımsan,
Allahın nəzəri səninlə olsun.
Ömür yolun xoşbəxtliklərlə dolsun.

İstəkli Zülfiyənin qəlbini dinlə
Oğulların Azər, Nəbi fəxr etsin sənlə.
Hamıya örnək ol sədaqətinlə,
Mənəvi dünyama sən rövnəq verdin.
Ürəkdən səmimi şerimi dərdin.
Mənə ürəyimcə çox diqqət verdin.

Min nağıllı bu Naftalan torpağı,
Naftalanın fəxridir bax bu Nəbi ocağı.
Elçin tək, Etibar tək yanan çırağı,
Xoşbəxtliklə daim gəlsin sorağı.

Ay Ehtibar, mən bu yolu seçmişəm,
Şeriyyət camından mən də içmişəm,
Sarıgül Yağmuram, candan keçmişəm.
Sizin tək dəyərli insanları vəsf edəcəm,
Bu işdə də haqq yoluynan gedəcəm.

## Laləm

Könül çiçəyim, bəzən dəli Kürüm,
Bəhri Xəzərim, qırx bulağım,
Gur şəlaləm, Laləm.

Bəzən boynu bükük bənövşə payım,
Dərin düşüncəm,

Havam, suyum, günəşim,
Bir sözlə yaşamaq stimulum.

Günəş üzlüm, gözəl gözlüm,
Könül çiçəyim, ruhu göyçəyim.
Saflıqda bəyaz Mələyim,
Bir ömür gərəyim Laləm,
Realım, gerçəyim.

**Zəngi litseyi**

Həyat yollarıyçın düzgün yerişi
Çətin sınaqlara mənim yürüşü
Elmdə, savadda qalib gəlişi
Biz sənə borcluyuq, Zəngi litseyi.

Bayram müəllim, milli dəyərlərin məcmusu səndə,
Şərəfli ömür yolundasan doğma Vətəndə.
Dövlətə sədaqət, dinə itaət,
İnsanlıq da, ləyaqət də var səndə,
Litsey rəhbəri kimi gözəl iz qoydun.

Ata-anamız tək mehribanlığı,
Pak təmiz insantək istiqanlığı,
Bizə həsr etdilər bax cavanlığı.
Zəngi litseyin müəllimləri,
Bizə həsr etdilər uzun illəri.

Kövrək addımlarla yollar getmişəm,
Abdul əziz, Öməri sizə etibar etmişəm.
Daim sizi vəsf etmək olub peşəm,
Bunu şerlərimlə isbat etmişəm.
Rəfiyyə müəllimən, ey gözəl xanım,
Sizi vəsf etmişəm bunu nə danım.

İndi Abduləziz imtahan versin,
Litsey kollektivi xeyirli bar görsün.
Əziz müəllimlərimiz xeyir dua versin,
Müəllimlər xeyirli bir bar görsün,
Valideyinlər də uğurlu həyacan görsün,
Litsey kollektivi sağlam can görsün.

Sarıgül Yağmur deyər əməyiniz itməsin,
Xoşbəxtlik mələkləri heç sizi tərk etməsin.
Şagirdlərdən sevinəsiz, güləsiz,
Azad vətəndə xoşbəxt ömür sürəsiz,
Zəngi litseyin daim zirvədə görəsiz.

**Vəfa**

Bir ömrü pay verib taleyin sənə,
Qoy səni qorusun Ulu kimsənə,
Ömür yolun bürünməsin duman-çənə.
Bu ömür yolun xöşbəxt yaşa, ay Vəfa,
Xoşbəxt həyat olsun sənə pay Vəfa.

Vəfa xasiyyətin vardır adında,
Qızınırsan ürəyinin odunda.
Vardır el içində sənin hörmətin,
Nabatınla itməsin heç zəhmətin.
Bir ömür davam etsin bu məhəbbətin,
Pozulmasın bu birliyin vəhdəti.

Vətənin qeyrətli oğlusan sən də,
Sənə hörmətim böyükdür qonşun tək məndə,
Ailəcanlılıq milli dəyərdi səndə.
Bax buna şahiddir tanıyan bəndə,
Düzdü narahatlıq var Vətəndə.
Amma qalib bizik sən buna inan,
100 yaşa çat təbrik eşit o zaman.

## A Pünhan

Qərib həsrətiylə bu gün səhəri,
Lap tezdən yoluna çıxdım şəhərin.
İstədim dağların seyrinə dalam,
Doğma Qubadlımı yadıma salam.
İndi döyüşlərdə alınmaz qalam,
Tap-qaraqoyunlu kəndidə mehman olam.

Duman Talış dağlarına süründü,
Doğma torpaq yaşıl nura büründü.
Sonra birdən darvazanın önündə,
Bir mələk gülüşlü insan göründü,
Dünyam sanki gözəlliyə büründü.

İdrakdır varlığın anası inan,
Kamaldır müqəddəs yol tutan insan.
Bu səhər geyinib evdən çixanda,
Gördüm gülümsəyir təbiət bu an,
Həmin gün qarşıma sən çıxdın, Pünhan.

Yerlər də, göylər də, bu kainatda,
Gözəlliyin əsəridir real həyatda.
Könül bu dünyanı səyahət etsən,
İlahi möcüzələrin seyr etsən.
Hər yerdə hakimdir məhəbbət inan,
Qəlbində məhəbbət yaşadır Pünhan.

Bax bu keşməkeşli həyat yolunda,
Yaşadır bir şair ruhu onu da,
Teymur oğlu Pirkaz sevgisi o da.
Unutmur çətində, darda da inan,
Pirkaz sevgisiylə qururlu Pünhan.

Yaşanan mənalı illər xatirələr dənizidir,
Dünyaya gələn balalar o məhəbbətin izidir.
Şairin sevgisiylə hey gülümsəyən üzüdür,
Hər an doğmalıq yağan o mənalı gözüdür.

Ana kimi anadır balalarına Pünhan,
Odur ki, əzizdir doğmalarına inan,
Amma bəzi yaralar var deyil sağalan.
Bu həyatın hər naxışı var inan,
Böyük məhəbbətə sığınır Pünhan.

Sevdiyim insanla yanaşısan sən,
Səni sevən deyil bir yoldan ötən,
Bir ömrü paylaşıbdı səninlə o tən.
Həm şairdir, həm zəkalı bir insan,
Onun böyük sevgisinə sən inan,
Bu həyata nikbin gözlə bax Pünhan.

Bir qərib Vətən həsrətiylə yanıram mən də,
Zaman pərən-pərən salıb hərəni bir kəndə,
Amma böyük eşqə sığınıb mən də.
Kamillik yaşına çatmışam inan,
Sarıgül Yağmur olmuşam keçdikcə zaman.
Bizi sevdiklərimizdən sındırmasın böyük Yaradan,
Əziz bacım Pünhan səni unutmaram bir an.

## Əziz İsrafilovlar ailəsinə

Əziz balalarım, kitablarımda,
Sizli anları, sizlə keçən zamanları.
Sağlığımda təqdim etdiyim üçün,
Çox xoşbəxtəm, bu xatirələr əbədiləşdi, tarixləşdi.

Sizli, bizli zamanları,
İndi tarixləşən anları xatırlayıram.

Bəzən acılı anılardan ağlayıram,
O anları qəlbimin gizli varağında saxlayıram,
Qoy yaddaşa düşməsin, nə də böyüyüb şişməsin.

Bu acılı anları unudub gələcəyə ümidlər bağlayıram,
Bu gözəl gələcəyi düşünəndə dağ çayı tək coşub çağlayıram.
Çünki Ulu Tanrım imdad edir, çünki ümid yerim Allahdır,
Onun böyüklüyünə sığınıb, ona ümid bağlayıram.

Sizsiz darıxsam da, daim qəlbimdəsiz,
Çünki hər cümləmdə, sətrimdəsiz.
Tanrıya şükr edərək kitabları qucaqlayıram,
Sizli anları əbədiləşdirdiyim üçün.
Könlümü çağ saxlayıram,
Sizlərə bir ömür xoş gələcək arzulayıram.

Kitabımda Abdüləziz və Ömərin,
Barmaq izlərini, öz əlləri ilə yağdıqları.
Nənəyə aid xoş ürək sözlərini,
Əbədiləşdirib kitaba saldım.
Sarıgül Yağmur kimi,
Bu işimdən də razı qaldım.

## Mirsədi ağama

Həyat gedir, çəkmir qəlb minnətini,
Duyur ürəklərin saf niyyətini,
Mizan-tərəzidə hesab çəkəndə.
Uca tutur insan sədaqətini,
Mənəvi saflığı, ləyaqətini,
Bir də seçilmişlər tək mənəvi sərvətini.

Düzdür tutduğun yol haqdır diləyin,
Vicdan tərəqisindədir arzun, istəyin.

Ehtiyac duyana etdin köməyi,
Ulu Tanrım olsun dəstəyin sənin,
Sən dəyərli oğlusan doğma Vətənin.

Tanrıdan seçilmiş bir ailənin oğlusan,
Əməlinlə, vicdanınla el içində doğrusan,
Əziz insan, sevimlisən, əzizsən,
Ona görə ay Mirsədi ağa əqidəsi, təmizsən.

Bəxtəvər o kəsdir qəlbi doludur,
Hikmətli sözlərlə, xoş kəlam ilə.
Daim el içində nüfuz qazandın,
Gözəl və dəyərli kəlamlarınla,
Şəcərədən gələn ehtiramınla.

Əziz insan, şükür qəlbi təmizsən
Bilik, bacarığınla coşqun dənizsən.
Dağ şəlaləsisən bərraq, təmizsən
Gözəl ailənlə xoşbəxt yaşa sən,
Xoşbəxtliklə daim ol qoşa sən.

Tanrıya inamı qazandırırsan,
Gözümdə ucasan, zirvədə qarsan,
Vətənin əziz oğlusan, vüqarsan,
İllərimizi atsanda könlü baharsan.
Əziz Mir Məhəmməddən, sevimli Akifədən
Bu gözəl dünyamıza bir yadigarsan.

Məntiq var, məna var hər bir sözündə.
Odur ki, ucasan elin gözüdə,
Mənəvi bəzəksən yerin üzündə.
Elimə, günümə sən bir örnəksən,
Odur ki, sən bəzə daim gərəksən.

Sarıgül Yağmur deyər bunu hər zaman,
Müqəddəs zirvəsən gözümdə inan,
Cənnət məkan olsun övliya övladı Atan, anan.
Səni və əzizlərini qorusun uca Yaradan,
Arzum sənə xoşbəxtlikdir Ulu Tanrıdan.

## Ayrılıq

Qərib könlüm sənsiz qaldı bu axşam,
Sənli xəyallara daldım, a Pünhan.
Hey dolub boşalmaq közləri qaldı,
Həsrətin sədasın aldım, a Pünhan.

Sənsiz öz donunu dəyişdi zaman,
Qalxdı bir andaca göylərə ahım.
Ermənin boyun mən yerə soxum,
Mən necə dağlara çıxım a Pünhan.

O doğma baxışlar getmir gözümdən,
Allam təsəllini oxşar gözündən,
Öpərəm nəvələrin üzündən.
Xatırlaram sənli olan anları,
Şair Pirkazlı xoş zamanlar.

## Vüqarlı vüqarım

Vətənin gələcəyin parlaq görürəm sənlə,
Ay Vüqar, xoşbəxt yaşa doğma vətəndə,
Qoy sənlə qürur duysun balan Ömər də.
Çünki halal zəhmətinlə yaşarsan,
Yaxşı ki, həyatda, ay Vüqar varsan.

Çox az rast gəlinir sən tək insana,
Xasiyyətin rövnəq verir qanana,

Qoy səninlə qürur duysun o ana,
Çünki halal övlad verib cahana.

Mən bu doğmalığı görürəm səndə,
Qiymətli bir insansan doğma Vətəndə,
Səndən ilham aldım tanıdıqca mən də,
Çünki qanımdadı vergi əzəldən,
Yeri düşən tək yazıram şeir, qəzəldən.

Sarıgül Yağmuru sən ruhlandırdın,
Qayğı, diqqətinlə stimullandırdın.
Nurlu könüllərdə işıq yandırdın,
Bu jestinlə, bu qayğınla yüz yaşa, Vüqar bala,
Əzizlərini və səni qorusun Alah-təala,
Amin, Amin, Amin.

**İradəm**

Ruhum sənlə, cismim məndə inləyir,
Sevən qəlbim xatirəni dinləyir.
Sənsizliyin yağmur olub çiləyir,
İradəm, səni həmişə şən görək.

Ürəyində nur saçan bir şəlalə,
Təbəssümü yaraşıbdı camalə,
Ağrı, acı yol tapmasın bu halə,
Taleyindən heç əsməsin sərt külək,
İradəmi daima gülümsər görək.

Hər bir insan ömrünün şirin, acı dəmi var,
Həyat həzin bir neydir, onun zili, bəmi var.
İradə xanımın öz aləmi var,
Bu təmizlik dəstək olsun qoy sənə,
İlyası, Samiri qorusun Böyük Kimsənə.

Ay İradəm, çox sevimli cavansan,
Zəhmətində halal ruzi qazan sən,
Mətbəədə, nəşriyyatda böyük nüfuz qazan sən,
Halallıqla ömür yolu seçmisən,
Bu yolda çox çətinliklər keçmisən.

Sarıgül Yağmur deyər sözün düzünü,
Yaşa əzizlərinlə ömrün uzunu.
Qismət olsun görəsən sən həyatın gözəl üzünü,
Yerinə yetişsin xoş arzu-dilək,
İradə, səni daima gözəl görək,
Biz doğmaların kimi çox şükür edək.



## Sən qoru, Allah

Axı kim yarıyıb çətin zamanda,
Hərə etdiyini başa qaxanda,
Namərd, alçaq mərdə silah sıxanda,
Sən qoru bizləri xatadan, Allah,
Haqsızlıq aləmi bürüyüb, vallah.

Qəlbimdən keçəni sormayın nədir,
Həyat maraqlıdı, yaş bəhanədir.
Ürəkdən min arzu, min xəyal gedir,
Sən qoru bizləri bəladan, Allah,
Haqsızlıq aləmi bürüyüb, vallah.

Əllərim acıqdı uca tacına,
Bahar nəsib eylə qəlb otağıma,
Xoşbəxtlik nəsib et bu növrağıma.
Sən qoru bizləri bəladan, Allah,
Haqsızlıq aləmi bürüyüb, vallah.

Qanmazlar işində xeyli dolandım,
Haqsızlar etdilər alışdım-alışdım,
Bəzi məqamlarda lap aciz qaldım.
Artıq səbrim çatmır, bezmişəm, vallah,
Haqsızlıq aləmi bürüyüb, Allah.

## Neynirəm

Gözlərim hey yolda qəlb intizarda,
Sən başqa məkanda, başqa diyarda.
Amma məndə güvən də var, etibar da,
Yoxsa etibarsız yarı neynirəm.

Yazdıqca yazıram şeir, qəzəldən,
Buna səbəb vardır inam əzəldən.

Əl çəkmərəm sənin kimi gözəldən,
Sənsiz olan bu diyarı neynirəm.

Bilirsən ki, məndə hazırdır cavab,
Çünki çox oxudum əzəldən kitab.
Qarşılıqlı sevgi özü bir savab,
Səndən özgə bir nigarı neynirəm.

Sən olmadan mən baharı neynirəm,
Aləmi bürüyən gülzarı neynirəm.
Sən mənim ol, qoy, dünyam rəngli olsun!
Sən olmayan bu diyarı neynirəm.

## Allahım

Yerin də, göyün də hərəkətlidir,
Dünya güc alıbdır sözündən, Allah.
Qışın da, yazın da bərəkətlidir,
Bizi sən yaratdın tozundan, Allah!

Eşqin qəlbimizdə sönməz od, ocaq,
Olsa da çətinlik lap qucaq-qucaq,
Bizləri gözəllik yaşadır ancaq,
Olduq gözəlliyin kölgəsi, vallah,
Özün imdada yet, kömək ol, Allah.

Varsan, var edənsən özün Qadirsən,
Dünyanı yaşadan höküm Qadirsən,
Yaradanım sənsən, hikmət-nadirsən.
Olduq gözəlliyin kölgəsi, vallah,
Özün imdada yet, kömək ol, Allah.

Hakimi dövransan, hökmü qürursan,
İlkdə ol kəlməsi. Sonra vurursan,
Ruhun nur, eşqi nur, əməli nursan.
Üzümüz nur alır üzündən, Allah,
Bizləri sən salma gözündən, Allah.

## Dərin

Mənə bir sual verdin min bir mənası var dərin,
İzahı mümkün olsa, izah edərdim hər birin.

Bu dünya üzündə nə varsa, dəyişir tədricən,
Amma ki, sən fərqlisən, nəysə dəyişmir heç yerin.

Hər kəsin bir dərdi var, hər dərdində bir acısı,
Sənin dərdin başqadır, acısı da gəlir şirin.

Bəzi nadanlar varı pulda görür, malda görür,
Sənin varın daxildə, çox dəyərli, yerin dərin.

Sarıgül, döz acıya, səbr et Allahın eşqində,
Çünki faydası yox, nə nifrətin, nə də kinin.

## Zəngini gözləyirəm

Gözlərim leysandır, ürəyim çadır,
Tez keçir aylarım, ilim necəsən?
Nə ünüm yetişir, nə əlim çatır,
Mən hardan öyrənim, bilim necəsən?

Amma səni diqqətlə izləyirəm,
Daima yüksəlməni istəyirəm.
Yanıma gələndə əzizləyirəm,
Mən harda olsam da səni özləyirəm,
Qısası bir zəngini gözləyirəm.

Qəlbinə dəysə də məni bağışla,
Qarşıla sən məni doğma baxışla,
Dinlə şeirlərimi, qəlbdən, alqışla.
Sən mənim doğmamsan bunu unutma,
Sarıgül Yağmuru çox ucuz tutma.

**Bənövşəm**

Səfalı bahardır ilin göyçəyi,
Bütün canlılara verir dəstəyi,
Həvəsə gətirir gülü-çiçəyi,
Çiçəklərin baş tacıdır bənövşə,
Çox dərdlərin əlaçıdır bənövşə.

Qızmar günəşlidir ilin yay ayı,
Onun da var məhsuldarlıqda payı.
Amma bənövşəm heç sevmir yay ayın,
Qaçıb kol dibində keçirir yayı.
Mənim çox gözəl payımdır bənövşəm,
Hətta müalicə çayımdır bənövşəm.

Səma aydın, yaz günəşi nur saçır,
Güllərin üstündə bülbüllər uçur.
Qara buludlarsa, günəşdən qaçır,
Qaçıb kol dibində qalan bənövşəm,
Məni xoş duyğuya salan bənövşəm.

Mürəbbəsi çox dərdlərin dərmanı,
İçən kimi üzü gülər insanın.
Görən kimi sevindirən mehmanı,
Xəyalı da çox şirindir bu anın.
Özəl paydır bənövşə mürəbbəsi,
Təqdimində sevindirər hər kəsi.

Baharın yoluna dikərək gözün,
Bir həsrətli qız tək duran bənövşəm.
Kövrək dodağında titrək pıçıltı,
Boynunu yol üstə buran bənövşəm,
Yol üstə qız kimi duran bənövşəm.

Mənim həsrətimin adı bənövşə,
Vüsal sevgilərin şadı bənövşə.

Dərdim keçmədi ki, dərmanı olsun,
Damaqlardan getməz dadı bənövşə,
Bax, bu sevginin də adı bənövşə.

Bax, bu olur əsl bayram hədiyyəsi,
Bəh-bəh gəldi bənövşə mürəbbəsi.
Qoy, həmişə olsun belə həvəsim,
Bəzəsin süfrələri bənövşə mürəbbəsi.

Ay bənövşəm, sən ömrümə bəzəksən,
Çox canlısan, nə olsun ki, çiçəksən.
Sən Sarıgülə bax, bir ömür gərəksən,
Həm çiçəksən, həm sehirli mələksən.
Çünki mənə sən bir ömür dəstəksən,
Şirin paydı bənövşə mürəbbəsi,
Təqdimində sevindirər hər kəsi.
*21.03.2015*

**Ürək yorulur**

İndi məhəbbətim həsrət dənizi,
Orda dalğaların yarışı başlar.
Tutular göylərin narahat üzü,
Narahat duyğudan düyülər qaşlar,
Sonra da son sözün yağışı başlar.

Qəlbimsə səhvlərdən çoxlu yanacaq,
Niyə bəs qədrimi bilmədilər heç?
Axı el sevgisi daşıdın qəlbdən,
Amma ki, itəndən sonra özləndim,
Bir qərib yolçu tək yolda izləndim.

Belə sancılara dözən ürəklər,
Kövrək yaşlarında tezcə yorulur.
Gün batır, qar yağır, əsir küləklər,

Bilmirəm ayrılıq beləmi olur?
Artıq qəm yükündən ürək yorulur.

Əl açdım əllərim sənə çatmadı,
Özüm yatdım, amma ruhum yatmadı.
Deyəsən istəyə ümid qalmadı,
Yetişdi ayrılıq, beləmi olur?!
Bax, beləcə sınıq qəlbim yorulur.

## Gedir

Ürəyimə vurma yara,
Günümü eyləmə qara,
Nə qədər gəlsə də para,
Bu gün gəlir, sabah gedir.

Gələn gəlir ünvanıma,
Hörmət edib ad-sanıma,
Poeziya işləyib qanıma,
Sağlamlıqsa bu canıma,
Bu gün gəlir, sabah gedir.

Düzdü bir az var əsəbim,
Amma pozulmur ədəbim.
Həm də coşğuludur təbim,
Amma nə edim bilmirəm?
Ömür-gün qaçaraq gedir.

Zaman dəyişibdir, qaqa,
Qanmaz sürür sağa-sola.
Əli batmayanda yağa,
Başlayır qisas almağa.
Yığır üstünə ah gedir,
Həm də edir günah gedir.

Uyma sən fani dünyaya,
Düşmə sən boş-boş xülyaya.
İnsanlar fani dünyaya,
Bir gün gəlir, bir gün gedir.

Ay Sarıgül, çəkmə ahı,
Canım, bağışla günahı.
Küsdüyün doğmadır axı.
Allah əfv etsin günahı,
Qalmasın heç kəsin ahı,
Gərdişi dünyadı gedir.

## Yollar yolçusu

Yollar dolanbacdı, gülüm, yamacı var, düzü var,
Hər bir yolun insan ömründə silinməyən izi var.
Həyatdı bəzən bu yolun əyrisi var, düzü var,
Bəzi yollarda isə bir qorxunun közü var.

İllərin içindən keçən yolu var,
Yolların üstündə tikan kolu var,
Damarlardan axan qanın yolu var,
Axar, axar gedər durular yollar.

Kimsə tapar ucuz bəhanə gedər,
Kimi cüt, kimisə biganə gedər,
Kimisi qürurla şəhanə gedər,
Kimi yolçusuna vurular gedər.

Üzülər, dağlar baxan olmasa,
Uzanmaz, dayanar çəkən olmasa,
Səni düz yoluna çəkən olmasa,
Yorular, üzülər, çəkinər yollar.

Yollar yorğunuyam yata bilmirəm,
Ürəklə sevdiyimi ata bilmirəm.
Bu ömür yoludu seçə bilməzsən,
Amma hər arzuya çata bilmirəm,
İstəyi başımdan ata bilmirəm.

## Ya Rəbbim

Ya Rəbbim, mənə elə ürək ver ki,
Daş atana gül atım.
Ya Rəbbim, mənə elə iman verki,
Qəbrimdə rahat yatım.
Ya Rəbbim, mənə elə ömür ver ki,
Balalarımdan sevinim.

Ya Rəbbim, mənə elə dilək ver ki,
Daim onunla öyünüm.
Elə bir sevgi ver ki,
Məhəbbətdən yanım.
Ya Rəbbim, mənə elə həyat ver ki,
Sənin rizanı qazanım.

Ya Rəbbim, elə bir gün ver ki,
Hər an sənin adını anım.
Ya Rəbbim, elə göz ver ki,
İmkansızı ağlayım.

Ya Rəbbim, mənə elə söz ver ki,
Dağ, çayı tək çağlayım.
Ya Rəbbim, elə yaddaş ver ki,
Sirlərimi saxlayım.
Elə yaddaş, elə sirdaş ver ki,
Ona ümid bağlayım.

Ya Rəbbim, elə ömür yolu ver ki,
Övladlarıma gün ağlayım.
Ya Rəbbim, şükür sənə,
Mənə ümid işığı versənə,
Ümidim yalnız sənə, yalnız sənə.

## Həyat bir səhnədir

Bəzən bir macəra, bəzən bir dram,
İstərəm ömürlük bir nağıl quram.
Hərdən bir inciklik, hərdən barışıq,
Amma gözündə, qəlbində işıq.
Bizə baxanlara nümunə olaq,
Yolun azanlara bir çıraq olaq.

Həyat bir səhnədir deyənlər də var,
Hətta ağız-burun əyənlər də var.
Amma ki, düz söz deyənlər də var,
Gəl, indi səhnədə düz rol oynayaq.
Yolun azanlara biz çıraq olaq,
Ən sonda çalışaq mehriban olaq.

Üç övlad böyüdək, xeyrini görək,
Tanrıya daima şükürlər edək.
Nəvələr böyüdək, barını yeyək,
Biz də rahatlanaq ahıl çağında,
Allahım, xoşbəxtlik, bax indi, deyək.

## Var mənim

Xalqımın övladı torpaq canlıyam,
Hamıya mehriban, istiqanlıyam,
Şairlər aşığı Azərbaycanlıyam.
Bu cür cənnət məmləkətim var mənim,
Amma Qarabağ, adlı həsrətim var mənim.

Bütöv diyarı gəzmişəm Ərdəbili, Təbrizi,
Böyük, dahi insanların orda qalıbdır izi,
Azərbaycan möcüzələr diyarıdır, gərək söyləsin düzü.
Odur ki, fəxr etməli diyarım var mənim,
Qarabağı tələb etməyə ixtiyarım var mənim.

İstedadlı, dahi oğullardan söz düşəndə,
Ağdamlı Germandan bəhs etdim mən də,
Onun poetik dili salıb məni kəməndə,
Ulu Tanrı eyləsin onu çox xoşbəxt bəndə.
Vətəni vəsf edir bu əziz insan,
Onunçün o şəxsiyyətə hörmətim var mənim,
Qarabağ adlı həsrətim var mənim

Hey yazıram, yenə yazdım dübarə,
Dözməyənlər qılsın başına çarə,
Bir-iki qanmazı atsaq kənarə.
Hər yerdə sevilən sənətim var mənim,
Anlayanlara hörmətim var mənim.

İndi edim balaca bir izahı,
Bu vergidir, verir bizə ilahi,
Sarıgülün yoxdu burda günahı.
İslam adlı şəriyətim var mənim,
El üçündə hörmətim var mənim,
Mübariz olmağa cürətim var mənim.

**Gedəcəm**

Həyat çox şirindir, ürək doymayır,
İnsan var ki, həyatda iz qoymayır.
Adam var dəryadan damla qıymayır,
Mənsə söz mülkünü qoyub gedəcəm,
Həm də son tikəmi qəlblə böləcəm.

Ey könül, susmasın eşqin, həvəsin,
Qoy, daim hər yerdə gurlasın səsin.
Sevənlərim üçün gələcək nəfəsim,
Xalqıma qeyrətlə xidmət edəcəm,
Sonda son tikəmi bölüb gedəcəm.

Şərəflə yaşayıb ömür sürənlər,
Dərin düşüncəli, uzaq görənlər,
Şeriyyətin dəyərini bilənlər.
Mən öz izlərimi düzlərə qoydum,
Ən yaxşı sözləri sizlərə qoydum.

Dünyada bir dəfə doğulur insan,
Ağıllı, düşüncəli, ya da ki, nadan,
Ay ürək, gəl köçmə, tez bu dünyadan.
Cahilə, nadana gülənlər də var,
Poetik dünyanın qədrin bilənlər də var.

Almışam həmişə qiyməti eldən,
Görmüşəm hər zaman hörməti eldən,
Eşitmişəm müdrik söhbəti eldən.
O müdrik söhbətdən ilham almışam,
Sarıgül Yağmur tək yadda qalmışam.

## Körpə uşaq olaydım

Kaş ki, bir quş olaydım,
Uçub qanad çalaydım.
O Hərtiz meşəsində,
Lap gizli köşəsində,
Bir qızılgül kolunda,
Lap Boynəkər yolunda.
Gizli yuva quraydım.

Mamam yuxa salanda,
Nənəm olan eyvanda.

Gizlicə göz qoyardım,
Yağ dürməyindən doyardım.
Nənə, nənə, ay nənə,
Ay, biraz da versənə,
Deyib hay-küy salaydım,
Körpə uşaq olaydım.

Sonra çəpərdən keçib,
Süleyman dərəsində,
Zümrüd mamamı göyrədim.
Çırpısın götürəydim,
Köməyinə çataydım,
Yükü dalından ataydım.

Gəncəçik qız olaydım,
Lap o yaşda qalaydım,
Kaş ata-analı olaydım.
Nağıllı dünyamıza,
Bir də qonaq olaydım,
Elə orda qalaydım.

### Səninləyəm

Tutulsun ayağım, görməsin gözüm,
Yadına düşdükcə gəlməmişəmsə.
Bölünüm min yerə qəlpələnərək,
Səninlə ağlayıb, gülməmişəmsə.

Könlümün ən şirin sevdası sənsən,
Ruhumun məhəbbət dünyası sənsən,
Ömrümün, günümün mənası sənsən,
Mən də səninləyəm, ölməmişəmsə.

Ürəkdən keçəni göz-gözə deyər,
Həyanı, isməti üz-üzə deyər,
Bu qərib öləndə bircə söz deyər,
Bağışla, qədrini bilməmişəmsə.

## Gəlmişəm

İçimdə vüqarım, başımda qarım,
Baxsan dağ görərsən qarşında məni.
Sən gəldin dünyama ilk bahar kimi,
Nə yaxşı güldürdün üzümü mənim,
Qovdun bax, başımdan dumanı, çəni.

Gözlərim önündən getmir xəyalın,
Nədir bu duyğunu adın biləydim.
Səni görən gündən gözüm sevinir,
Gözlərindən sevinc yaşın siləydim.

Buraya gəl, ay dərdimin çarəsi,
Sənlə, sənli olmaq üçün gəlmişəm.
Axı səndədir qəlbimin parəsi,
Bax onun halın sormağa gəlmişəm,
Qəlbimizi qorumağa gəlmişəm.

## Şirin xəyal

Biz həyat yükündən çox xəbərdarıq,
Təmiz insanlara biz dostuq, yarıq.
Bir günəş tək, ay tək sənin dünyanda,
Həyatda olduqca yanında varıq.

Bax, indi artıq gör keçib neçə gün,
Narahat oluram, gülüm, sənin üçün.
Hərdən zəngin üçün, bir xoş sözün üçün,
Özüm də bilmirəm çox darıxıram.

Həyatı sən varsan deyə çox sevdim,
Dadsız həyatımın dadı sən oldun,
İstək-zad yalandı, düşünən zaman.
Qəlbə atəş saçan odu sən oldun,
Həqiqi istəyin adı sən oldun.

## Nəsihət

Çalış ömrün boyu halal olasan,
Halal zəhmətinlə yadda qalasan.
Halal əməlinlə yaşa dolasan,
Haramdan uzaq ol, yaşa halalnan.

Oğurluq eləmə, sən haram yemə,
Doğruya meyl elə, sən yalan demə.
Yaxşılıq eləsən inan hər kimə.
Əvəzin alarsan Pərvərdigardan.

Nə qədər ömrün var yaxşılıq eylə,
Əyriyə əyri de, düzə düz söylə.
Cavab verəcəksən hər bir əmələə,
Bunu təsdiq edir müqəddəs Quran.

Hər kim nə əkərsə onu da biçər,
Yaxşıyla, yamanı Xudavənd seçər.
Kim bu imtahandan hünərlə keçər,
Yerin cənnət edər böyük Yaradan.

Xeyir, şərdən misal gətirirəm mən,
Gələcək nəsilə yetirirəm mən,
Bu nəsihəti burda bitirirəm mən.
Başa düşəcəklər, edirəm güman,
Sarıgül Yağmuru etmə imtahan,
Tanrım, bizi qoru şərdən-xətadan.

## Şəhidlər

Ölməz ərənlərdir şəhidlərimiz,
Bizim qəlbimizdir sizin yeriniz.
Artıq üzülməsin əzizlərimiz,
Qanınız yerlərdə qalmayacaqdır.

Oyunda zər atar hərə baxta-baxt,
Xalqa xidmət edən qazanar tacı-taxt.
Şəhid qanı inan itməz heç bir vaxt,
Daha qərənfillər solmayacaqdır,
Şəhid qanı yerdə qalmayacaqdır.

Düşmənin üstünə məğrur getdilər,
Canların Vətənə qurban etdilər.
Tanrı dərgahında kama yetdilər,
Şəhidlər, şəhidlər, igid şəhidlər.

Dözmədi millətin axan qanına,
Amma ki, qıydılar şirin canına,
Yaddaşlara köçən hər bir anına.
Bir daha xəyanət olmayacaqdır,
Şəhid qanı yerdə qalmayacaqdır.

## Ömür yolu

Ömür həyat kitabıdırr, varaqların biz kəsirik,
Yaşanan varaqların hər biri üstə əsirik,
Yaşayanda duymuruq, bax necə gəldi gedirik,
Amma ki, ömürdü bu, yaşayırıq, tələsirik,
Bax beləcə təqvim kimi vərəqləri biz kəsirik.

Kəsilən o varaqlar xatirələr dənizidir,
Yada salınan keçmişimin təkrarlanmayan izidir,
Mənim duyğum həssasdır, çün havadan nəm çəkirəm,
Düzünü söyləməsəm ürəyimdə qəm çəkirəm.

Doğmalarım yadlaşanda lal olardım danışmazdım,
Kənardan boylanardım, heç qaynayıb qarışmazdım.
Nahaqdan qəlbə dəyilməz, bu həqiqət də düzdü,
Çünki qəlbim saf bulaq suyu tək təmizdi.

Havadan çəkdiyim nəm olanları bilməyimdir,
Olub keçən keçmişdir, ona içdən gülməyimdir.
Amma qoy düzün bilim, nə olsun keçmişimdə qalıb,
Sarıgül Yağmur kimi hər səhifədə də iz salıb.
Bilmədiyim bir şey qalıb, indi qoy onu da deyim,
Bilmədiyim bir şey varsa, o da nə vaxt ölməyimdi.

**Kömək edin**

Yuxum ərşə çəkilib yatmıram,
Qayğı fikirləri başdan atmıram,
Vətən torpağın dığaya satmiram,
Amma gücüm çatmır halım yamandır.
Ay qardaşlar, köməy edin amandır.

Görəsən indi haradır bu yol,
Vətən həsrəti salıbdır qəlbə yol,
Ay vətən övladı, gəl qeyrətli ol,
Qoymayaq Vətəni darda amandı.
Əsgər analarının halı yamandır.

Canından pay verən ata məzarı,
Südüylə can verən ana məzarı,
Bu Vətənin hər bir qarış torpağı,
Yaralıdır, əl çəkməyin zamandır.
Vətənin dağları, çəndi, dumandı,
Ey igidlər, qalib gəlin amandır.

Qubadlı da, Zəngilanım haraylar,
İndi görən nə haldadır oralar?
Şəhid anaları bağlayıb qaralar,
Bu mənzərə ürəyimi paralar,
Ay igidlər, siz yatmayın amandır.
Yaralı ruhların halı yamandır.

Sarigül, dua et qəlbin şad olsun,
Vətənin torpağı qoy azad olsun,
Şəhid balaların ruhu şad olsun,
Anaların gözü sevinc yaşıyla dolsun,
Allahım, imanımız yanmasın amandır.
Bircə sənə olan inam qalandı.

**Arzularım**

Səni buraxmaram səndən qopmaram,
Ehtirafda qürur dizi üstədir.
Bütün vücuduma ruhuma hakim,
Xətrin bu ananın gözü üstədir.

Yağışmı yağdırmaq istəyir bulud,
Həsrət dolu yağış yağacaq indi.
Sənə özləmimdən sənə həsrətdən,
Üzümdən yağmurlar axacaq indi.

Əlini başına, üzünə qoyum,
Bu səni incidən dilimi kəsim.
Ver ovucu öpüb üzümə qoyum,
İncitsəm özüm öz əlimi kəsim.

Bu zalım həyatda tək günəşimsən,
Qaralar bu dünyam saçmasan işıq.
Üzündən buludu çək, ey günəşim,
Kor olllam gözünü açmasam, bir gün.
Oğlum, sənə doğru qaçacam, bir gün,
Sonra da göylərə uçacam bir gün.

**Gedərdim**

Qismətim sözümə baxsaydı əgər
Dünyadan bu halda çıxıb gedərdim.
Əzrayıla təhvil verib canımı,
Özümə qıyaraq çıxıb gedərdim.

Qıymazdım doğmalar göz yaşı tökə.
Qəbrim üstə təkcə qızılgül əkə,
Qızlarım qəbr üsdə boynunu bükə,
Oğlumun əlini sıxıb gedərdim.

Duymazdım haqsızın əməllərini,
Dər mənim bağçamın tər güllərini,
Yoldaşımın yaş silən nəm əllərini,
Görməzdim səssizcə çıxıb gedərdim.

Görməzdim nəvələrin göz yaşlarını,
Duymazdım doğmalar təlaşlarını,
Ömür sarayının qəm daşlarını,
Özüm öz əlimlə söküb gedərdim.

## Axtarıram mən

Kaş ki, oğul anaları çökməsin,
Gözləri gülsün qanlı yaş tökməsin,
Oğul-qız itirib dərdlərin çəkməsin,
Hər gün Allahıma yalvarıram mən.

Bir vaxtlar kasıb-küsüblar çox idi,
Amma inanın ki, gözləri tox idi,
Cavan idik dərdimiz də yox idi,
Ötüb gedən zamanı axtarıram.

İndi yetkin yaşlı ana olmuşam.
Zaman keçib xeyli yaşa dolmuşam.
Balalarımın qayğısına qalmışam.
Anasızlıq dərdin ağlayıram mən,
Darıxanda anamı axtarıram mən.

Qəlbən bağlananda könlüm alışsa,
Mənimlə doğmatək qaynayıb qarışsa,
Hərdən bir marağla halım soruşsa,
Yaşdan aslı deyil bağlanıram mən.
Sarıgül Yağmur tək odlanıram mən.

**Ana itkisi**

Neçə vaxtır dərdli, qəmliyəm,
Başımdan getməyir fikrin ay ana.
Köksümün üstünə qəm yenə-yenə,
Dağılır sinəmin şadlıq yuvası.

Bilmirəm dözəcəmmi bu həsrətə,
Yoxluğun salıb bizləri möhlətə,
Düşür doğmaların hər əziyyətə,
Yoxluğun qəhr edir bizləri, ana.

Dünya gözlərimdə boş bir xaniman,
Gördü öz işini bax artıq zaman,
İtirir başını şəklinə baxan,
Sən qıymazdın balaların halına
Kənardan boylan, bax doğmalarına

Şəklin baxır məlul-məlul üzümə,
Qəm tökür bax görənlərin gözünə,
Mat qalıram vallah özüm-özümə.
Bu həyat faniymiş doğrudur ana,
Özün imdada yet ey böyük Allah,
Cənnət məkan eylə anaları Allah,
İtkisi çətinmiş, çətinmiş vallah.

## Nəsihət

Necə ucuzlaşıb sevgi, istəklər,
Hesaba vurulur arzu-diləklər,
Artıq kasıblaşıb sevən ürəklər,
Haqsızlığa qol çəkirlər biləklər.
Çalış uzaq dur xatadan, qarışma,
Yersiz həmlələrdən yanma, alışma.

Cavabı bilinməz tərsdisə sual,
Səbrli olmasan düşər qalmaqal.
Sonunda kimsələr verməsə macal,
Çalış dözümlü ol, yekə danışma,
Şər, xata işlərə heç vaxt qarıma.

Sarıgül, sirrini dərində saxla
Paylaşdığın dostu dərindən yoxla
Sədaqət, ehtibar ölçülmür baxtla
Odur ki, hər şeyi dərindən yoxla.
Dərdini hamıyla paylaşma, saxla.

## Neyləyim

Həsrət, hicran zəncir oldu boynuma,
Dərd yükünü yükləmişəm qoynuma,
Çox rast gəldim kələkbazlar oynuna,
Heç bilmirəm indi daha neyləyim?

Haqlı oldum haqsızlığa dözmədim,
Qəlbim təmiz, əyri yolda gəzmədim,
Özüm qəsdən heç kimsəni üzmədim,
Heç bilmirəm indi daha neyləyim?

Bir kül idim yandırdılar köz oldum
Çeşmə idim dondurdular buz oldum

Hər qanmaza, hər nadana söz oldum,
Heç bilmirəm indi daha neyləyim?

Kövrəlsəm də dost yanında güldüm mən,
Göz yaşımı gülüşümlə sildim mən,
Sarıgüləm bu həsrətdən öldüm mən,
Heç bilmirəm indi daha neyləyim?

## İtirmisən sən

Hər bir kəsin öz dünyası var gözəl
Səni öz dünyamda itirmişəm mən
Bilmirdim həsrətin acı olacaq
Zamanla kədəri gətirmişəm mən.

Taleyin, qismətin yazısıymış bu
Bit məskən icində ayrı yerdəyik
Daha dönməz ki, o ötən çağlar
İndi nə yerdəyik, nə də göydəyik.

Bilmirəm xoşbəxtlik uzaqdır sənə
Kim nə danışırsa toxunur sənə
Sənə xəbərdarlıq etdim toxunma mənə
Sən mənsiz kədəri bölə bilməzsən
Nə də ki, doğmanı görə bilməzsən.

Bax sən gizlənsəndə özün özündən,
Mənsiz darıxdığın bilinir gözündən,
Bil ki, peşmanlıq yağacaq üzündən,
Bu duyqu selindən cıxmayacaqsan.
Sarıgül Yağmuru unutmayacaqsan.

## Eşqimin ünvanı

Ay məndən məhəbbət ünvanı soran,
Mən çoxdan vermişəm sözə eşqimi,
O çiçək deyil ki, o gül gül deyil ki,
Hər bir yoldan ötən qoxlaya eşqimi,
Yada ki, əlində saxlaya eşqimi.

Mənim baharımın solan çağıdı,
Mənim kitablarım eşqin bağıdı,
Gözü götürməyənlərin bağrın dağıdır.
Sənsə gözün üstə saxla eşqimi,
Hərdən bir aç götür varaqla eşqimi.

O Allah vergisi bir əmanətdir,
Qanmaz qəlbə dəyir bu cinayətdir,
Amma ki, doğrudan bir cəsarətdir.
Hər kəs dəyər verir, sevir eşqimi,
Özü də xeyrini görür eşqimin.

Heç kimin kimsəyə inamı yoxdur,
Bu gündən səhərə gümanı yoxdur,
Hörmət itirənin imanı yoxdur.
Mənin sevgim dəniz limanı yoxdu,
Sarıgül Yağmurun limanı şerdir,
Sevgisi, istəyi, gümanı şerdir.

## Sığışmaz

Göz yaşım axır sel kimi dəryaya sığışmaz,
Dərdim o qədər çoxdu ki, dünyaya sığışmaz.

Nolaydı dedim doğmamı röyada görəydim,
Arzum, diləyim amma ki, röyaya sığışmaz.

Divanə kimi çoxları səhrayə düşübdü,
Mən özüm ki, divanəyəm səhrayə sığışmaz.

Poetik dünya mənim təsəllim olub,
Bu sahədə dəli bir aşiqəm dünyayə sığışmaz.

Sarıgül, biz rəsmləriyik Yaradanımızın,
Bu elə gözəllik ki, heç bir tabloya sığışmaz.

## Ümidim Allah

Həsrət məni üzür, vüsalsa xəyal,
Bu boş xəyallara aldanmam daha.
Həyata çox nikbin yanaşmaq üçün,
Artıq ümid qalır qadir Allaha.

Bu qədər intizar, həsrət var daha,
Nə qədər xəzan var, özləm bahara.
Vətənim həbsdədir unutmam daha,
Artıq ümid qalır qadir Allaha.

Xəyalla ovunmaq çətindir, çətin,
Tükənmir sonu yox acı həsrətin,
Artıq mənası yox bu məhəbbətin.
Çünki gümanım yox yalana daha,
Artıq ümid qalır qadir Allaha.

## Ömür yolum

Alnıma yazılıb çox hadisələr,
Ömrüm hədiyyələr toplusu olub.
Verdiyim hədiyyə xoş xatirələr,
Aldığım hədiyyə tüstüsü olub.

Sevgi ürəyimdən əsən bir külək,
İçimdə əsdikcə sıxacaq məni.

Köksümdə narahat çırpınan ürək,
Bir gün nəm torpağa yıxacaq məni.

Bilən olmayacaq nədəndir bu hal,
Duyan olmayacaq ürək yükünü.
Beləcə gələcək ömür karvanı,
Sonra başlanacaq yarpaq tökümü.

Ağlama, həmişə gülən gözlərim,
Məni yaman yerdə xar eyləyərsən.
Yorulma çağlayan, coşan ürəyim,
Sarıgül Yağmuru dağ eyləyirsən,
Hər yerdə üzünü ağ eyləyirsən.

**Allahım**

Erməni göz dikdi el torpağına,
Nankorlar əl qatdı xalqın malına,
Vicdansızlar yer verdi erməni dığalarına.
Nəydi zəhmətkeş insanın günahı?
Allahım, qoy tutsun onları, ahım.

Nankor bilməz torpaq nədi, el nədi?
Dünya ona əyləncəli səhnədi.
Yetim ahı ürəkləri göynədir,
Könüllərə qan çiləndi Allahım,
Nəydi doğma torpaqların günahı?

Qoy, kəsilsin silahların gur səsi,
Qoy, kəsilsin ana-bacı naləsi,
Qoy, sülh olsun arzuların müjdəsi.
Deyək dünya haqqı gördü Allahım,
Axı yoxdu xalqımızın günahı?

## Zikr etmək

Zikr eləmək çox vacibdir insana,
Bir Allahdan qorxu gəlməli cana.
Yoxsa haqsızlıq çökəcək cahana.
Allah özü islah edən,
İnsaf verər insana,
Çünki insan zikr edəndə ruhu gələr imana.

Zikr Allahın adın anmaqdır,
Allaha sığınmaq savabdır.
İnsafa gəlir qəlblər zikr edəndə,
Allahın adın anmalıdır bəndə,
Çünki insan o zaman gəlir imana.

Zikr etmək çox vacibdir insana,
Zikr edəndə dinclik gəlir imana,
Ey insan, zikr et, düşmə gümana,
Allahın adını anmaq inam verir insana.
Çün o gəlir həm dinə, həm imana,
Zikr etmək çox vacibdir insana.

## Dünya

Yaddaşlarda anı qaldı,
Əməllərin sanı qaldı,
Adın sənin fani qaldı.
Getdi fitnə-felə dünya,
Niyə uydun felə dünya?

O tay ayrıldı bu tayla,
Hay-həşirlə, bax vur hayla,
Qasırğayla, fırtınayla,
Sığal çəkdi telə dünya,
Niyə uydun felə dünya?

Qorxur daha qurd qoyundan,
Baş açılmır bu oyundan,
Üz döndərir öz soyundan.
Çoxu bilə-bilə dünya,
Niyə düşdün dilə dünya?

Xəzan gəlir yayda bağa,
Dəhşətdir bu inan, qağa,
Bülbül susur ötür qarğa.
Tikan dedik gülə dünya,
Bu nə işdi belə, dünya?

Qəddarllaşıb indi çoxu,
Dost-dostuna sancır oxu,
Bu gerçəkmi, yoxsa yuxu?
Bilmirik biz hələ dünya,
Bu nə gərdiş belə dünya?

Qoru bizi Allahımız,
Qalxır göylərə ahımız,
Nədi bizim günahımız?
Çiynimizdə şələ dünya,
Bu nə işdi belə, dünya?!

Acı sözdən qəlb qırılır,
Savab işə tor qurulur,
Yaxşılara od vurulur,
Yaxşılığa tələ dünya,
Bu nə işdi belə, dünya?!

Mərd qovulur namərd olur,
Saflıq adama dərd olur,
Düz söz söyləmək şərt olur.
Yanıb dönmə külə, dünya,
Bu nə işdi belə, dünya?!
Düşmə namərd ələ, dünya,
Uyma heç bir felə, dünya!

## Gərəkdir

Düz qiymət qoyala xeyrə, şərə,
Bütün incəliklər çata nəzərə,
Yaz bu söhbəti də dostum dəftərə,
Çəkilən zəhmətə hörmət gərəkdir.

Şeirimdə döyünür dövrün nəfəsi,
Oxuyan hər kəsin gəlir həvəsi,
Düz ola hecası, həm qafiyəsi,
Çəkilən zəhmətin izi gərəkdir.

Demək bax, bu imiş çarə dərdimə,
Diqqətsizlik ağır yük imiş demə,
Bir xoş sözlə iz salırsan qəlbimə,
Çünki bu xoş sözlə məlhəm gərəkdir,
Hər bir xoş söz bu halıma dəstəkdir.

Qəlbimin başında yer edən gözəl,
Uzaqdan-uzağa əl edən gözəl,
Ay mənim dilimi lal edən gözəl.
Az naz elə, burda kəlmə gərəkdir,
Hər bir cümlə bu istəyə gəstəkdir,
Sarıgül Yağmura istək gərəkdir.

## Gedəcək

Köksünə sığmayan məğrur ürəyim,
Dərd, qayğı üzündə əridi getdi.
Bir acı söz inan onu qəhr edir,
Düşüb söz ardınca çürüdü getdi.

Bu şeiri də saxla qalsın yadigar,
Bir gün mənsiz qalıb çəksən intizar,
Yadına düşəcək kədərli çağlar,
Həsrətin qəlbimdə əridi getdi.

Gecələr xəyalım gəzəcək səni,
Şirin xatirələr üzəcək səni.
Hər mahnı, şeir səsi anacaq məni,
Həsrətdən ürəyin yanıb gedəcək.

Bəxt uçan bir quşdur tuta bilməzsən,
Əldən uçub getsə çata bilməzsən.
Hər şeyi atsan da məni heç zaman,
İnan xəyalından ata bilməzsən.

## Halallıq

Ölməyə, qalmağa qərar verilsə,
Beynimdə dolanar bir neçə sual.
Fikrindən halallıq almaq keçərsə,
Mən sənə haqqımı edirəm halal.

Bu canım həsrətindən saraldı, soldu,
Sənsə laqeydlikdən bezmədin ancaq.
Bu şeiri oxusan gözlərin dolar,
Qorxarsan ölərəm, boynunda günah.

Ömür yollarında gözlətdin yenə,
Sən öyrəncəlisən incitdin yenə,
Nədir ki, mənimçün ölmək həyatda,
Hər günüm ölümdür onsuz da sənsiz.

Ruhum da dayanar səndən kənarda,
Nə qədər yorulub zarə mən gəlim?
Yumum gözlərimi soyuq məzarda,
Gedim qırxımacan bir az dincəlim.

Bəlkə mən ölümə sarı yönəlim?
Ya özüm, özümü eyləyim edam,
Yada ki, gözləyim gəlsin əcəlim.
Bir yolluq canımı alsın, ay adam,
Ya da ki, ananı yada salasan.

## Xatırlanmaq istəmirəm

Xatirəyə çevrilməsin xəyallarım,
Yada düşənən düşənə xatırlanmaq istəmirəm.
İstəmirəm unudulum, istəmirəm gendən baxım,
Yada düşənən düşənə yad olunum.

Qaranquşlar gələn zaman,
Ümidlərim ölən zaman,
Hərdən-hərdən, zaman-zaman
Xatırlanmaq istəmirəm.

Son baharda darıxanda,
Pəncərədən çölə baxanda.
Ağacda quruyub soluxan,
Son yarpaq tək soluxuyub,
Xatırlanmaq istəmirəm.

Yağışlar tək pəncərəndən süzüləndə,
Bir ürəyi üzdüyün üçün üzüləndə,
Göz yaşı tək yanağında süzüləndə,
Xatırlanmaq istəmirəm.

Xəzan vurmuş yarpaqların arasında,
Gül üstündə yaralanmış bir bülbülün naləsində.
Göy üzündə bərqad ayın haləsindən nəzər çəkib,
Xatırlanmaq istəmirəm.

Lap ömrünün səhifəsinə qızıl həriflə yazılsam da,
Ən duyğulu xəyallarla  anılsam da,
Səni əziz, doğma bilib yanılsam da,
Xatırlanmaq istəmirəm.

Bir ürəyin sevgi harayından,
Bir istəyin doğma taxtından devrilmək istəmirəm.

Bir əziz insanın yaddaşından itib,
Sonra xatirəyə çevrilmək istəmirəm.
Xatırlanmaq istəmirəm,
Unudullanlar xatırlanır,
Xatırlanmaq istəmirəm.

**Ay dənizim**

Bax sənsiz olmayır ağlım başımda,
Qələmim də yazmır bax bu yaşımda.
Baxıram hər kəsə qol-qola gəzir,
Al məni qoynuna aman dənizim,
Darıxıram sənsiz yaman, dənizim.

Salam, ay dənizim, bax mən gəlmişəm,
Körpə uşaq kimi lap kövrəlmişəm,
Haqsızlıqlardan lap zara gəlmişəm.
Sən mənim sirdaşım ol, ay dənizim,
Salmışam sahilə yol, ay dənizim.

Qəm yükün çəkməyə qalmayıb taqət,
Döndərib üzünü məndən sədaqət,
Mən dözürəm, ürək dözməyir fəqət,
Gəl, al məni məndən coşqun dənizim,
Artıq sahilində itibdir izim.

Hərdən köks ötürüb yaman baxırsan,
Sahilə çırpınıb uzaqlaşırsan,
Bəlkə də sən dərdlərindən qaçırsan?
Al məni qoynuna coşqun dənizim,
Artıq sahilində itibdir izim.
Dənizim, dənizim, aman dənizim,
Darıxmışam sənsiz yaman, dənizim.

## Nağıllı dünya

Həyat bir macəra, bəzən bir dram,
İstərəm ömürlük bir nağıl quram.
Hərdən bir inciklik, hərdən barışıq,
Yenə gələcəyə düşə nur işıq.

Bizə baxanlara nümunə olaq,
Yolu azanlara bir çıraq olaq.
Beləcə dil tapaq mehriban qalaq,
Bir ömür beləcə biz xoşbəxt olaq.

Həyat bir səhnədir deyənlər də var,
Gəl, biz bu səhnədə düz rol oynayaq.
Baş qəhrəman sən ol, mən sənə qonaq,
Ən sonda çalışaq biz xoşbəxt olaq,
Yaddaşlarda xoşbəxt ailə tək qalaq.

## Gözəllik

Aldım bu cahan içrə mən ilhamı gözəldən,
Çatmış başa hər istəyimin kamı gözəldən.

Mən könlümü verdim gözəllik dolu dünyaya bir ömür,
Amma çox şükür xudaya yox şikayətim də gözəldən.

Çox vəsf elədim layiq olan hər gözəlliyi,
Çünki gözəllik aşiqiyəm özüm əzəldən.

İlahi kəşfidir bu gözəllik insanlıq üçün,
Bax bu mövzusudur şairlərin, dövrü əzəldən.

Sarıgül, vəsf elə gəl gözəlliyi ilahi eşqi ilə,
Çün müəllifi Tanrım özüdür dövrü əzəldən.

## Dünyaya məhəbbətim var

Vətəndaş adına layiq görülən,
İllərdir xalqıma bir xidmətim var.
İnsan zəkayla heyrətə salan,
Şirin söhbətlərim, şeriyyətim var,
Mənim bu dünyaya məhəbbətim var.

Bax, budur hey coşur qəlbimin səsi,
Çünki daxildəndir ilham çeşməsi.
Görün nə söyləyir, nədən danışır,
Köksümə sığmayan şeriyyətim var,
Mənim bu dünyaya məhəbbətim var.

Doğmaya, ailəmə sədaqətim van,
Kimlə təmas qursam xoş niyyətim var,
Yaşadığım yerdə çox hörmətim var,
Çünki, insanlara məhəbbətim var,
Mənim bu dünyaya məhəbbətim var.

Mən sizlərlə ülfətimə inandım,
Hər nə söylənirsə həqiqət sandım,
Hərdən haqsızlıqdan alışdım, yandım,
Amma ki, Allah var onu sığındım,
Mənim bu dünyaya məhəbbətim var.

İlahi qismətdi sədaqəti eşq,
Olsun haqq edənə daima qismət.
Amma nə olursa-olsun orada,
Gərək gözlənilə daima hörmət.
Zorla qazanılmaz sevgi, məhəbbət,
Mənim bu dünyaya məhəbbətim var.

## Ağlayır

Dünya qarışıb yaman canım, ürək qan ağlayır,
Hər gün, hər yerdə, hər an gör insan ağlayır.

Kimi vətən uğrunda öz əzizlərini itirir,
Kimi etdiyi səhvdən olur peşiman ağlayır.

Bəzi insanlar da var məzluma heç əl tutmayır,
Baxma ki, varı da var, əlində imkan ağlayır.

İllər ötdükcə ömür yüklənir ahu-zar ilə,
Ömürdən ötür bahar, qəlbdə zimistan ağlayır.

Dünya yaranandan bəri qardaş olub xeyirlə-şər,
Haqsız qanlar tökülən gör neçə meydan ağlayır.

Cahan fanidir deyə gəl, üzümə əlin dünyadan,
Yarandığı gündən belədir gərdişi dövran ağlayır.

Ey könül, etmə fikir, çəkmə cəfa səbirli ol,
İnsan yarandığı gündən dünyaya mehman ağlayır.

Sarıgül, ötənləri xırdalama, keçmişi də salma yada,
Haqsızlıqdan sarsılan gör neçə insan ağlayır.

## Qocalır

Gün keçir, ay dolanır, yaş keçir insan qocalır,
Heç dəyişmir qoca dünya, dəyişir can qocalır.

Bircə qaydası budur ötsədə illər keçsə,
Dəyişməz qanunu var gərdişi dövran qocalır.

Tək bircə qocalmayır bəni adəmdə eşq,
Ondan başqa nə varsa olur zimistan qocalır.

Amma yenə də maraqlıdır qoca dünya hər halı ilə,
Qəlbə dəyən kəlmədən qəhr olur insan qocalır.

Qəm çəkmə, könül, dəyər verən insan ki, var,
Hər zaman dəstək olur, nə olsun ki, can qocalır.

Dəyişir fəsillər də, hərdən ötür saniyələr,
İnsan oğlu kimi də gərdişi dövran qocalır.

Sarıgül, həyat eşqi güclüdür bax halı ilə,
Amma ki, ürəkdi dözməyir buna damla-damla qan qocalır.

## Yaradan qadın

Dünyamda yaşamın mənası sənsən,
Çiçəklər açılır bağçada gəzsən,
Köksümdə ürəksən, dilimdə sözsən,
Alovlu ürəksən, çınqısan, közsən,
Sevgidən şeirlər yaradan qadın.

Sehirli aləmdi məhsun baxışın,
Gülüşün güllərə atar naxışın.
Çıxışın əridər qarı, yağışı,
Hər zaman xoş gəlir sədan, alqışın,
Sevgidən şeirlər yaradan qadın.

Ömrümə bəzəksən qəlbimə hakim,
Sən mənə naz göstər nazını çəkim,
Gözünə görünür tək bircə həkim,
Mələklə, huriylə çəkilsin adın,
Sevgidən şeirlər yaradan qadın.

Nəğmələr doğulur bir baxış üstə,
Sən bu şairədən bir nəğmə istə.
Aşıq da söyləsin qoy asta-asta,
Belə yaşayaraq ucalsın adın,
Sevgidən şeirlər yaradan qadın.

## Cavanlığım

Sənə yeni vüsal verdi, hicran qaldı cavanlığım,
Saçlarımı ağ görəndə fikrə daldı cavanlığım.

Qartal idim birdən-birə zirvələrdən endim yerə,
Belə uzaq bir xatirə, bir xəyaldı cavanlığım.

Səsləyirəm geri dönməz, gözləyirəm heç görünməz,
Közü getdi, odu sönməz, üfüqdə də heç görünməz.

Məni sönməz alovlara saldı, getdi, cavanlığım,
Məni sönməz alovlara saldı, itdi, cavanlığım.

## Övlad

Aləmdə könül mülkünə dürdanədi övlad,
Şöhrəti əziz xanədə bir danədi övlad.

Onsuz bu həyat anlamıram kəsb edə məna,
Olmazsa əgər can evi, viranədi övlad.

Aqil çıxa gər olsa fərasətli əcəbdi,
Fərsiz ki, ola, əfsus ki, sənə tənədi övlad.

Sarıgül, at kənara, dərdün qüssəni ki, yoxdu səfası,
Unut olmuşları, bas bağrına bir danədi övlad.

## Nənələr, ay nənələr

Həyat şirindir, amma qocalmaq istəyirik,
Müdrüklük zirvəsinə ucalmaq istəyirik.
İstəyirik qocalaq nəvə-nəticə görək,
Tanrı, qismət eylə gözəl nəticə görək,
Əməyimiz itməyə gözəl nəticə görək.

Görək ki, övladımız boya-başa çatıbdı,
Kasıblığın, yoxluğun daşın çoxdan atıbdı:

Arzudan arzu doğar belə deyib atalar,
İnsan qocalanda qocalmayır arzular.
Necə ki, dağ başını yazda duman-çən alır,
İnsan qocalanda da arzusu cavan qalır…
Qocalıq «gəlirəm ha» deyə yaman səs salır,
Qəlbin duyğu axışı, həyacanlı atışı,
Gözlərinin baxışı,
Birdə ruhu qocalmır!
Bir təsəlli axtarır güzgü qabağında o,
«Hələ şükür, yaxşıyam» bəzən söyləsə də o,
Vallahi və Billahi, inan ruhu qocalmır,
Duyğulu insanların bil ki, ruhu qocalmır…
Ruhu qocalan insan məncə ölücanlıdır,
Ruhsuz-duyğusuz insan elə-belə canlıdır.
Əsil insan odur ki, Allahın yaratdığı,
Bütün gözəllikləri doya-doya yaşaya.

Qışda çiçək axtara yarpaqlar arasında,
Necə ki, hər gün səhər yuxudan oyananda.
Oynaqları, dizləri, biləyi, barmaqları,
Birə-bir ağrıyanda namazından qalmaya.
Yenə şükürlər edə yuxudan durduğuna,
Qəlbinin yeni odla, atəşlə vurduğuna.
Bu eşq nəvə eşqidir, bu eşq bala eşqidir,
Bu eşq səni həyata bağlayan bir eşqdir.

Görməyənə də qismət şirin olur nəvələr,
Nənə, baba və dədə istəklidir nəvələr…
Oodur ki, eşqin səmti, yönü də dəyişib,
Arzunun-həvəsin də səmti, yönü dəyişib.
Balaların dalında durub sevinmək üçün,
Onların şöhrətinə baxıb öyünmək üçün.
Qocalmaqdan qorxmayır indi artıq nənələr,
Nəvələrdən sevinsin, balalardan yarısın,
Ömür-gün yoldaşıyla qoşa-birgə qarısın,

Balalardan güc alsın.
Yenə sağlam qocalsın,
Ruhu cavan nənələr,
Tez qocalan nənələr…
Övlad sevgisi ilə ruhu cavan nənələr,
Göyə ucalan nənələr,
Nənələr, ay nənələr!

## Dost

Əziz dostum, bel baglama,
Dar ayaqda sına dostu.
Məqsədini öyrən sonra,
Məqsədlisə qina dostu.

Hər kim gəlib dostum dedi,
Nə biləsən qəsdi nədi?
Bu vaxdacan yüzlərlədi
İndi enib birə dostum.
Bəli dost deyildir hər üzə gülən,
Gülüşü bəlkə də süni, saxtadır.
Gözündən od, alov püskürürsə də,
Qəlbinə boylansan ayaz, şaxtadır.

## Mənsiz

Köc edər ömür karvanı, fani dünya olar mənsiz,
Mənim vəfalı cananım, həsrət cəkib ağlar mənsiz.
Mənim dünyadan köcməyim, dəyişməz dünyanin halın,
Acar güllər, ötər bülbül, köc eder durnalar mənsiz.

Kədərlənmə, ay Sarıgül köcub getsən də dünyadan,
Xatirimi seven xalqın məni yada salar mənsiz.
Dogmalar hər sabah məyus olarlar,
Hər günkü hal sorma yada düşəndə.

Amma ki, həyatdı öyrənəcəklər,
Telefon yaddaşı qalanda mənsiz.

Hərənin bir şeir düşər yadına,
Oxuyanda gözlər doluxar mənsiz.
Baxçada güllərlə danışan olmaz,
Ordakı çiçəklər soluxar mənsiz.

**Bir payız geçəsi**

Ay həmin aydır, hava da eynən həmin.
Şahidim payız gecəsi, kədərim dərin.
Ay bulud dalında gizlənib yenə,
Bəlkə də gözümdən yayınır mənim.

Bu payız geçəsi nə uzun oldu,
Səhərim nə yaman geçikir mənim.
Baharım gəlməiş cicəyim səldu,
Görüşüm yenə də ləngidi mənim.

Sirli bir sevdamız yatır dərində,
Özüm də özümü yada salım mən.
Bu sərin intizar gecələrində,
Ürəyini şam tək əldə tutmuşam

Gözlərim gözünə diklə sənin,
Arzumu yanıma köcürəm səni.
Açır kipriklərin uzun gecədə,
Qara köynəyindən görə bilməyir.
Bax arzum sevinə, gülə bilməyir.

Bu payiz gecəsi üzüm gülmədi,
Cünki xəyalımı görə bilmədim.
Buludlu səmadı, gözlərim nəmli,

Xəyalım o nəmi silə bilmədi,
Bu payiz gecəsi üzüm gülmədi.

Özüm də özümçün unudulmuşam.
Duyğusuz şəxslərin laqeyidliyindən.
Payız gecələrin dogma tutmuşam,
Dağınıq fikrimi toplayım deyə.

Fikir -düşünçələr pəncə -pəncədir,
Göydə buludların axarı boyu.
Duymadan yaşamaq bir işgəncədir,
Mən bu qayğıları de hara qoyum?

Bəlkə yığım qayğıları, alnımdakı qırışlara,
Yığa- yığa addımlayım yoxuşlara,
Yığım qayğı topasını, tutum yağan yağışlara.
Yusun, bitsin bu qayğılar düşüncələr,
Bəlkə onda bitə, gedə işgəncələr, düşüncələr,
Kövrək qəlbim, qayğı yüküm bəlkə bir azca incələr,
Sarıgül Yağmur duyğuları bəlkə o zaman dincələr.

## Nəsə yazmaq istəyirəm

Nəsə yazmaq istəyirəm,
Amma nəsə yazmamışdan.
Ürəyindən, gözlərindən bu kədəri, bu həsrəti,
Mənsizliyi pozmaq, pozmaq istəyirəm.

Nəsə yazmaq istəyirəm,
Çəkəm, çəkəm nəfəsimə.
Tellərinin qoxusunu,
Baxışların qorxusunu.
Yazmaq, yazmaq istəyirəm,
Bu qorxunu belə pozmaq istəyirəm.

Nəsə yazmaq istəyirəm,
Elə bir şey indiyəcən
Yazılmayan, hər həmlədən pozulmayan,
Zirvələrdən uca olan,
Bu kürrədən qoca olan,
Duyğulardan yenə nəsə yazmaq,
Yazmaq istəyirəm.

Nəsə yazmaq istəyirəm
Bu soyuqda, bu sazaqda.
Tutub titrək əlləri,
Çıxıb nəmli çölləri mən,
Alıb qaçmaq istəyirəm,
Gözlərindən atəşi alıb,
Yenə göyə uçmaq istəyirəm.

**Çatıb**

Bax çöküb susqunluq gülən üzümə,
Artiq tənhalığın məqamı çatıb.
Kədərdən göz yaşı düşüb üzümə,
Göz yaşın silməyin məqamı çatıb.

Duyğulu anlarım qalır kənarda,
Diqqət görməyirəm həmən anlarda.
Çox-çox sevdiyim də anlamayanda,
Qəfildən ölməyin məqamı çatıb.

Qayğı, istəklərim nəticəsində,
Xalqımın gözündə abidə oldum.
Bu qədər qayğılar cavabsız qaldı,
Diqqət görməyəndə qəlbən yoruldum,
Bu sözü deməyin məqamı çatıb.

## Qismətim

Başdan getmir bu istəyin havası,
Tapilmayır onun dərman davası,
Xəzinətək kip bağlıdır qapısı.
Tapsam əgər acarını sevinnəm,
Amma tapılacağına əminəm.

Qəlbdə nə var oda düşüb yanaraq,
Təsadüfü milyon kərə anaraq,
Bu qismətdi deyiləni qanaraq.
Xeyirlisi olmağını diləröm,
Qismətimə sevinərəm, gülərəm.

## Qəlbim oldu tikə-tikə

İnciklikler bezdi məndən,
Öz dərdim də küsdü məndən.
Yad dərdlərin çəkə-çəkə,
Qəlbim oldu tikə-tikə.

Sadə gəzdim, lal oturdum,
Özümçün bir dünya qurdum,
Hər yerdə də sakit durdum.
Danışdılar yekə-yekə.

Çox ürəklər dağlı yanıb,
Yanıb köz olub dağlanıb,
Deyim ona bəlkə qanıb.
Daşı ətəyindən tökə,
Qalıb bağrım sökə-sökə.

Dəyməmiş nəfəs- nəfəsə,
Qönçə gül açdı həvəsə.

Bülbülü salıb qəfəsə,
Ad verirlər lal ördəyə,
Qalırsan ət tökə-tökə.

Heç kimsəylə yox bir dərdim,
Xoş niyyətlə qanad gərdim.
Yandan ötdü salam verdi,
Arxamda bir kölgə gördüm,
Gəlir tikan əkə-əkə.

Bu nə sondu, nə əvvəldi,
Bir xəbər qəlbimi dərdi,
Yenə də bir şəhid gəldi.
Eldə qopanda mərəkə,
Qəlbim olur tikə-tikə.

Sarıgül Yagmur qəm çəkirdi,
Bulud olub nəm çəkirdi.
Mən ki, yaramı tikirdim,
Hardan çıxdı bu təhlükə?
Mən qaldım dərd çəkə-çəkə,
Doğmayçün yaş tökə-tökə.

## Uzun gecələr

Yaman qəribsəyir ürəyim sənsiz,
Həsrətin yuxuma qəfəs gecələr.
Sənli xəyallarım qoynuna girib,
Yatmaq isdəyirəm uzun gecələr.

Ətri qaldı bir ömür kürəyimdə,
Xoş arzulu, isdəyi diləyimdə.
Agrısı acısı var ürəyimdə,
Daha yata bilmirəm ki, gecələr.

Günlər itirdiyini tapardı illər,
Ayların telini qopardı illər,
Gəncliyimi alıb apardı illər,
Yatmaqla da bitməyir ki, gecələr.

Ayıldım sandım ki qayğılar itdi,
Qoşulub dərdlər də yuxuyla getdi,
Nə yaxşı ki, bax bu gecə də bitdi,
Yatmaqla bitmir ki, uzun gecələr.

**Ən şah əsər**

Mənə bir söz yetər səninəm desən,
Gələrəm yanına məni səsləsən,
Necə sevdiyimi bilmək istəsən.
Yoxdur bu sevgimin ölçü qədəri,
Sənsən bu dünyanın ən şah əsəri.

Yuxuma gəlirsən gecələr yenə,
İsdəyirəm durub zəng edəm sənə,
Səsini eşitmək bəs edər mənə.
Çətindir gözləmək inan səhəri,
Sənsən isdəyimin ən şah əsəri.

Nə mən vaz keçmərəm nə də sən vaz keç,
Bir ömür yoluna məni çıraq seç.
Bu yolda sədləri sağ-salamat keç.
Unudaq həsrəti, dərdi, kədəri,
Sənsən isdəyimin ən şah əsəri.

Bu ürək sevirsə tərk edə bilməz,
Bax sənin eşqinlə yaşayar ölməz,
Anlamayan qammaz, heç qədir bilməz,
Sənsiz inan canım heç üzüm gülməz.

Sənsən bu sevgimin ən şah əsəri,
Səndən gözləyirəm ən xoş xəbəri.

Bu yatmış duyğunu oyadan sənsən,
Bu çılğın sevgini yaradan sənsən,
Mənə həvəs verib yaşadan sənsən,
Sənsiz mən gəzirəm sanki sərsəri.
Sənsən bu dünyanın ən şah əsəri,
Sarıgül Yağmurun sənsən hünəri.

## Həyat bir nərd oyunu

Bax ölən duyğuların üsdünü torpaqlamışıq,
Böyük tək eşqə düşüb, uşaq kimi ağlamışıq.
Amma divanə tək heç kimə bel bağlamırıq,
Ətəkdən əllər yapışır, ürəkdən ağlamırıq.

Həyat bir nərd oyunu, amma hələ bax zəri yox,
Çünki dünya belədi aparan öz işin görüb.
Zəri elə çalıblar nərddə belə əsəri yox,
Sarıgül Yağmurunsa hələ dərdi-səri çox.

## Allah bəndəsi

Mən o bəndəyə heyran qalaram məşhərdə
Peyğəmbər, Əli ümmətiylə ola bir yerdə.

O kəsi qarşılaya, müjdə verə huri mələk,
Aydindir ki, Tanrım edib ona kömək.

Kimin ki, niyyəti düzdü əməli təmiz.
Tanrı yanında deməli xətri əziz.

İnsan oğlu bu dunyada tutsa əgər doğru yolu,
Yeri cənnət olacaq bil ki, huridədi qolu.

Tanrının yolun tutan bil ki itirməsə iman,
Yeri behişt olcaq daxildədi çünki inam.

Həyat yolu qısadır ömür isə azdır,
İnsanın son mənzili soyuq məzardır.

Həyat da bir gül tək açıb solacaq,
İnsana bu yolda yaxşılıq qalacaq.

Oxuyun sözlərimi qalsın yadigar,
Çünki ölümə yoxdur etibar.

Gördüyün gözəlliyi Sarıgül, vəsf et sən də,
Çünki Tanrı kəşfidir hər gözəl bəndə.

## Vaxt olar

Bu tənha duyğuya ürək dözmədi,
Səni xatırladım ürək bezmədi,
Əlini dostluqdan yenə üzmədi,
Bəlkə anlayarsan deyə vaxt olar.

Bitər hər bir şeyi nübarı başda,
Qalxar iztirabın buxarı başdan.
Bəlkə utanarsan qohum qardaşdan?
Bax onda deyərik afərin sənə,
Mehriban olarıq yenidən yenə.

Yaşlanarsan bərkə- boşa düşərsən,
Sənətə, sənətkara diqqət başa düşərsən,
Yaşlananda səndə yaşa ilişərsən.
Onda ətrafından diqqət umarsan,
Görməyəndə gözlərini yumarsan.

Bəxş etdim öz şer dünyamı sənə,
İncitdin sən məni bax dönə-dönə,

Amma doğmalardan əmanətsən mənə.
Nə deyim mən, daha nə deyim sənə,
Bu son qərarımdı gərək alışam.
Sarıgül Yağmur kimi yenə barışam.
Doğma insanlara qaynayam qarışam.

## Kövrələcəksən

Qış da bəyaz dona bürüyər yeri.
Saatın əqrəbi hərlənər geri,
Buzlaşan əlimi tutacaq biri,
Baxıb bu halıma kövrələcəksən.

Həsrət bu istəyi çəkəcək dara.
Fikirdən axtaracaqsan dərdinə çarə.
Baxıb kitabıma kövrək vərəqlərə,
Oxuyub bunları kövrələcəksən.

Onda qayğılardan getmiş olacam,
Artıq bu dünyadan itmiş olacam,
Şerlərimlə yaddaşlarda qalacam,
Vaxtında duymadığınçün kövrələcəksən.

Ömrüm keçir aram-aram,
Sızıldayır hər gün yaram,
Hərdən zəng et yoxam, varam.
Axı səndən balam nigaranam,
Bunları eşidib kövrələcəksən,
Sarıgül Yağmur adı gələndə
Bilmirəm nə edəcəksən?
Yəqin ki, yenə də kövrələcəksən.

## Uzağam sənə

Ürəyin dili yox hisslərin deyə,
Talesə istəyir qəddimi əyə,
Özüm də bilmirəm nə üçün, niyə?
Yaxın ola-ola uzağam sənə.

Bir mənim halıma, günümə baxın,
Kədər sel tək edir üstümə axın,
Düzdü deyiliksə biz-bizə yaxın.
Hər gün yuxularda qonağam sənə,
Yaxın ola-ola uzağam sənə.

De necə tərif edim ey dünya səni?
Həmişə qayğıyla sıxmısan məni,
Yola salacaqsan bu halla məni.
Bilirsən beş günlük qonağam sənə,
Səni sevə-sevə uzağam sənə.

## Gəlmədik

Mənmi tələsmişdim, sənmi gecikdin?
Niyə bu dünyaya qoşa gəlmədik?
Qanmaza, duyğusuza tuş olduq yenə,
Nə dedik, danışdıq xoşa gəlmədik.

Ömür boyu düz dolandıq düz gəzdik,
Haqsız hücumlardan yorulduq, bezdik.
Bəzən də lap dünyadan da əl üzdük,
Qismətə sığınıb qoşa gülmədik.

Çalışdıq, vuruşduq daim düz olduq,
Sevgisizlik sazağında buz olduq,
Yanıqlı sətirlərdə də söz olduq.
İlıq baxışlardan coşa gəlmədik,
Bir-birimizə baxıb qoşa gülmədik.

## Közəm mən

Saf sevgilər haqq adından görülür,
Niyyəti saf, qəlbi təmiz izəm mən.
Kül altında saxlamışam qorumu,
Ocağından ayrı düşən közəm mən.

Gözünə baxanda dünyanı gördüm,
Özümü dünyanın xoşbəxti sandım.
Nə biləydim tale yazılıb qara,
Bu eşqin odunda təkcə mən yandım.

Nə qədər sevsəm də səni ey gülüm,
Bilirəm dərdimə yanan deyilsən.
Eşqimdə vəfalı sadiq olsam da,
Sən amma vəfalı canan deyilsən.

## Şair ömrü

Şair ömrü təlatümdü, tufandı,
Coşanda daşqını, seli var onun.
Bir üzü bahardı, bir üzü qışdı,
Gec açıb, tez solan gülü var onun.

Uzaqdadı o istəyən ocaqlar.
Artıq xəyallardı onu qucaqlar.
Yerinə qor dolar gecə ocaqlar,
Yaddaşlarda qalan sözü var onun.

Qərarları verən beyni olsa da
Şairin yükünü ürək daşıyır.
Şəlalə qoynunda uca dağların,
Şairin qəlbində dastan yaşayır.

Qəlbi kövrəkləşir üzü gülüncə,
Beynində yaşayır sağlam düşüncə,
Məqsədi təmizdir, məramı incə.
Sarıgül Yağmur belə ürək daşıyır,
O, bir şair ömrün şərəflə yaşıyır.

## Tükənməz sevda

Səni çox sevirəm ürəyim mənim,
Sənə olan sevgim ölçülən deyil.
Sənlə bütün ömrü yaşasam belə,
İnan ki, bu sevda tükənən deyil.

Gəl, sən atma məni həsrət oduna,
Alışdır səninçün yanan qəlbimi.
Səni sevmək belə günahsa canım,
Razıyam bu yolda tökülsün qanım.

Deyirəm sevdamız heç vaxt olməsin,
Qəlbimizdən atəş heç vaxt sönməsin.
Sənli günləri Allah çox görməsin,
Səni itirərsəm yanacaq canım.

Mən sevda xəstəsi sən həkim oldun,
Dərdimi düzgün yaz qurbanın olum.
Carəsi yoxdusa sevgi yolunun,
Qoy bu yolda daim səninlə qalım.

Mənim bu dünyadan umacağım sən,
O sənli xəyallar ovudar məni.
Mən səni sevdim ki, çox xoşbəxt olum,
Eybi yox bir busən dərmanım mənim.

Altı bağlı, üstü bağlı bir kibrit tək olsan belə,
Bir andaca cırağımı yandırmayıb sönsən belə,
Təkcə qapıdan boylanıb darvazadan dönsən belə.
Eybi yoxdu bu baxışın da bəsimdir bax aldığım nəfəs kimi.

## Yaz buluduyam

Mənə sənsizliyi gətirmə yaxın,
Gəl ki, onu qovaq gəlməsin daha.
Elə bir aləmə çəkilək sənlə,
Həsrət adlı bəla gəlməsin daha.

Mənə tənhalığı yaşatma, gülüm,
Cüt uçan quşlara baxa bilmirəm.
Axı eşq mövzusu zülüm deyildir,
Gül açan dağlara çıxa bilmirəm.

Mənə gözləməyin cəzasın vermə,
Bu dərsin qiymətin çoxdan almışam,
Gözləyə-gözləyə yolda qalmışam.
Həsrətin qəlbimi sızladan andan,
Bahar buludu tək çoxdan dolmuşam.

Yenə köklənmişəm minor laddayam,
Bilmirəm səmada hansı qatdayam?
Hələ şükr edirəm bu həyatdayam.
Umduğum sevgini duya bilmədim,
Özümü çox xoşbəxt saya bilmədim.

## Ümid Allaha

Bir cığırıq gəl birləşək yol olaq,
Dağ cayı tək daşaq-coşaq sel olaq,
Yar bağında təzə qöncə gül olaq,
Bu qərarı unutmayaq bir olaq.

Çünki canım, insan kimi insansan,
Cox qeyrətli, bir sifətli cavansan,
Ətrafdakılarla cox mehribansan.
Həyat yollarında düz insan olaq,
Dəyişməyək həmişə belə qalaq.

Bu yaşda şimşək tək caxan deyiləm,
Heç kəsin varına baxan deyiləm,
Əl tutsam da kiməsə başa qaxan deyiləm.
Bircə onu deyirəm daima halal olaq.
Dəyişməyək heç nəylə, daima insan qalaq.

Sarıgül ümidi Tanrıya bağla,
Onun yazdığına nə küs, nə ağla.
Bu sözü həmişə yadında saxla
Tək bircə Allaha ümid bağlayaq.
Daima böyüyün yolun saxlayaq.

## Doğmalıq

Ürək sevdiyindən ayrı düşəndə
Anasız uşaq tək yetim qalarmış
Cətin sınaqlardan keçdiyin zaman
Ürək də sərtləşib mətin olarmış.

Həmişə qəribkən dərd çəkən insan,
Bilir ki, ayrılıq gətirir hicran.
Üzü dönüklərdən dönməyə nə var?
Sevəndən ayrılmaq çətin olarmış.

Sarıgül taledən nə küs, nə ağla,
Bu sözü həmişə yadında saxla.
Yalnız Allahına sən ümid bağla.
Doğmaya yad olmaq çətin olarmış.

## Daha

Mən ailənin sözlərindən alıram.
Xəyalına daim qonaq oluram,
Sən olmasan da bil sənli oluram.
Mən səni unuda bilmirəm daha
Ümidim qalıbdır sənli sabaha.

Səni sevdiyimi bilə bilsəydin,
Mənlə birgə hey danışıb gülsəydin,
Oturub üzbəüz hey dərdləşsəydin.
Bilərdin qədrini gedən illərin,
Sənə şer deyən şirin dillərin.

Allahım, necədə sevirmiş səni,
Sənin taleyinə bax, yazdı məni,
Ha gəzdi Sisiyanda çölü çəməni.
Bu dəli ceyranı de hardan aldın.
Bax bir ömür yolunu onunla qaldın.
Sarıgül Yağmurun tək aşqı oldun.

## Ayrı

Mənim bu tənha qəlbim qala bilməyir,
Sevdiyi bir doğma nəfəsdən ayrı,
Elə sən özün də düşün gəl, bunu.
Sənə möhtac olan sevgindən ayrı,
Qala bilərsənmi söylə ay gülüm?

Niyə mən bu dərdə düşdüm, ay Allah,
Görən nə olubdur günahım mənim.
Niyə bu həsrətin düşdü araya,
Candan çox sevdiyim birindən ayrı.

Niyə tale mənə bu qisməti yazdı,
Bəyəm indiyəcən həsrətim azdı?
Fələk mənə yenə bir quyu qazdı,
Düşmüşəm mən səndən bu qədər ayrı.

## Sevirmi

Mən cəni sevdim ki, canım olasan,
Canımdan da əziz canan olasan,
Arzuların şahı insan olasan.
Sevmədim ki, məni belə üzəsən,
Yanağıma yaşdan inci düzəsən.

Niyə yuxularım çəkilib ərşə?
Niyə güzaranım dəyişib mənim?
Niyə təkcə o var mənim qəlbimdə?
Niyə rahatlığım kəsilib mənim?
Görəsən o biri sevirmi məni?

## Xatirələr

Keçdiyim küçələr qəmgin, kədərli
Bir də o yerlərə gələrsənmi sən?
Ağlayan döngənin göz yaşlarını
Gəlib əllərinlə silərsənmi sən?
Könlümə dağ çəkib sitəm eyləmə.

Keçdiyim küçələr qəmgin, kədərli,
Ayaq izlərini əzizlər, saxlar,
Küçələr həsrətdən gözləri nəmli.
Gedib dönmədiyim səmtə hey baxar,
Bu qədər könlümə sitəm eyləmə,
Boş yerə, çılğınca üsyan eyləmə.

İndi o döngələr xatirə dolu,
Day keçə bilmirəm indi o yolu,
Kürəyinə dəyən günahsız qolu.
Kəsib bax, dibindən atmaq istərəm,
Bu yersiz günaha batmaq istərəm.
Könlümə deyərəm üsyan eyləmə.
Mənasız boş yerə tufan eyləmə.

Sən sevgi dənizi mənsə bir ada,
Ölub keçənləri gətirmə yada,
Bax bu hərəkətlə salarsan yada,
Sonra da coşaraq tüğyan eyləmə.

## Nidalar

Mən səni gül kimi qəlbimə əkdim,
Bir körpə fidan tək qayğını çəkdim.
Amma qoruduqca qəhrini çəkdim,
Hər səhər şehini gözümə vurdun.

Olmadı carəsi bu istəyimin,
Ayrılıq silahın üzümə çəkdi.
Nə qədər yalvardım, yanında durdum,
Sonuncu gülləsi üzümə dəydi.

Qayğılar o qədər sıxdı ki məni,
Sətirlər, misralar uzağa düşür.
Sanki ağ vərəqlər xəstə yatağı,
Qələm söz eşqindən yatağa düşür.

Nəbzimin səsinə oyandım bu gün,
Gəlib qəlb evində dayandım bu gün,
Ömrün bitdiyini mən sandım bu gün,
Amma yaşamaqdan bezməmişəm mən.

Sənsiz boşa imiş aldığım nəfəs,
Sevirəm kəlməsi eyləməz ki bəs.
Ürəkdən, könüldən bağlanan bir kəs,
Sevdiyin daima qorusun gərək.
Bu isdə Sarıgülə lazımdı dəstək.

## Virtual aləm

Sevgi yoxdur cavanların gözündə,
Gəl alışma məhəbbətin közündə,
Yaxşı düşün, götür- qoy et özün də,
Yalan durur döyüntünün çəmində,
Nə tapmısız virtual aləmində?

Yerlər də, göylər də, bu kainatda,
Həqiqət axtarmalıdı real həyatda.
Ay ürək, gəl düşün həyatın bu dəmində,
Yalan dolanlar durur virtual aləmində.

Hər gündə girirlər min bir cür dona,
Yalan vəd verirlər gah ona, buna,
Çox vaxt axırı çatır faciəli sona.
Ancaq şirin yalanlar virtual aləmində.

## Diləklər adası

Əlini üzmə əlimdən canımda ol sən mənim,
Acısıyla, şiriniylə anımda ol sən mənim,
Tək isdəyim, tək arzum yanımda ol sən mənim,
Mənim üçün fərqi yox dünyanın harasında,
Gəl yaşayaq ürəyim, mələklər adasında.

Deyilən fikirlər deyildir əbəs,
Bu isdək ürəkdə yaradır həvəs,

Boş yerə yazmır ki, şair olan kəs.
Kiminsə arzusu qəlb adasında,
Gəl yaşayaq ay ürək, Məhəbbət adasında.

Xoşbəxtlik eləcə pul-para deyil,
Ürəkdə iz qoyan tək yara deyil,
Nigaran baxışlar tək ora deyil.
Sevdiyi dilbərinin dərdiyi butasında,
Gəl çıxaq gül dərməyə Məhəbbət adasında.

Nə olar gözəlim insaf et barı,
Sənlə birgə sevək güllü baharı,
Eşq gəmisin döndər sahilə sarı.
Oturaq diz-dizə, baxaq göz-gözə,
Birgə seyrə çıxaq diləklər adasında.

Qartal zirvələrdə görünməlidir,
İlan da yerlərdə sürünməlidir,
Paxıllar dünyadan silinməlidir.
Bizcə gəzək gözəllik ortasında,
Bir ömürü yaşlanaq mələklər adasında!

## Ey mənə həyatı sevdirən qadın

Sinəmdə döyünən ürək gəlmisən,
Xoş arzu yaradan dilək gəlmisən.
Sən mənim dünyama mələk gəlmisən,
Bəlkə də demirsən mələkdir adım,
Ey mənə həyatı sevdirən qadın.

Qəm-kədər görməsin gözəl gözlərin,
Canıma can qatır şirin sözlərin,
Bir eşqə düşmüşəm dərindən dərin,
Səninlə dadıram sevginin dadın.
Ey mənə həyatı sevdirən qadın.

Dərdimə-sərimə göz yetirmisən,
Qəm- kədər gözlərə nur gətirmisən.
Könlümün bağında gül bitirmisən.
Dünyamı sevginlə nura boyadın,
Ey mənə həyatı sevdirən qadın.

Sarıgül Yağmurdur deyəsən adın,
Sevginin qüdrətin qəlbinə yazdım.
Mən batıb gedərdim sən olmasaydın.
Sən məni hər zaman göyə qaldırdın,
Ey mənə həyatı sevdirən qadın!

**Əl çəkə bilməz**

İncə duyğuları nə bilər nadan,
Şerdi, nəğmədi məni ovudan,
Könlüm məhəbbətdən, beyinsə duyğudan,
Ruhum da sevgindən əl çəkə bilməz.

Qəlbimdə nə qədər dözüm var imiş.
Mən çəkən dərdləri fil çəkə bilməz.
Elə yanmışam ki, odlar içində,
Dözüm var gözümdə, göz çəkə bilməz.

Ömür yollarında çox oldum naşı,
Qəlbimi qırıblar hər addım başı,
Dözdüyüm çovğunu, çəkdiyim qışı,
Bir ucsuz-bucaqsız can çəkə bilməz.

Sarıgül dözümlü yamandır dərdi.
Bitib tükənməyən inləyən kamandır dərdi,
Dərya tək sahilsiz ümmandır dərdi.
Ümman çəkdiyini göl çəkə bilməz.

## Gətirmisən

Mən səni gəzirdim sevgi bağında,
Bülbül tək uçardım gül sorağında,
Ömrümün bu yetkin, kövrək çağında,
Məhəbbət adında bar gətirmisən.

Arzulara, xəyallara dalma gəl,
Bircə an da məndən uzaq qalma, gəl,
Həsrətini ürəyimə salma gəl,
Şeriyyət adında bar gətirmisən.

Hərdən bir sən məni yada sal canım,
Xəsdəydim tapmışam səndə dərmanı,
Sarıgül Yağmurun sən qəlb mehmanı,
Həsrətdən yanırdım qar gətirmisən.

Aparır!
Sevgi sevən kəsin yaşına baxmır,
Həsrətin ürəyə salıb aparır.
Nə gözünə baxmır, qaşına baxmır
Ürəyin əlinə alıb aparır.

## Dayağın ollam

Duyğular da gözəl, sən də gözəlsən,
İlahi bəxş edib gözəllik sənə.
Özgəni bilmirəm məndə özəlsən,
Nə gözəl yaraşır dəcəllik sənə.

Biz ürək qırmayaq, qədrini bilək,
Könüllər şad olar sevək sevilək.
Səninlə bir dəfə üz-üzə gələk,
Çətin ki üzündən gözümü çəkim.

Darıxma gözəlim tənha otaqda,
İsdəsən gələrəm qonağın ollam.
Saçını oxşaraq isdi qucaqda,
Ölüncə mən sənin dayağın ollam.

Qaşına, gözünə salmışam meyil
Dərdindən xəstəyəm qalmışam veyil
Yalandan tə"rif də bil mənlik deyil.
Yanında ömürlük dosdun olaydım.

## Qurbanam

Dediyin hər kəlmə ürəyimi açır,
Dediyin hər cümlə sözünə qurban.
Ürəyin özün tək nurunu saçır,
Canımı verərəm özünə qurban.

Həm deyirəm ki, gözünə qurban,
Mənə ruh gətirən sözünə qurban.
Özün bu dünyaya qapalı idin,
Könlümə nur saçan özünə qurban.

Gör nələr yaşadım həyatda sənsiz
Qar yağdı hər bahar qərib könlümə
Dondu duyğularım qaldı diqqətsiz
Sənsiz fəsillər də özgədir mənə
Ömrə işıq verən gözünə qurban.

Vaxtilə od idim indi sönürəm,
Sənsizlikdən müqəvvaya dönürəm.
Sarıgül Yağmuram daha çönürəm,
Bir təsəlli verən sözünə qurban.
Məni qoruyacaq özünə qurban.

## Arzularımdı

Deyirəm ayağın dəyməsin daşa,
Dayana bilmərəm gözündə yaşa.
Mən səni hər zaman düşərəm başa,
Ayrılıq istəməm bu gündən sonra.

Getmə ay ürəyim, sözümə qayıt.
Özünü göstərsən gözümə qayıt.
Sən elə mənimsən özümə qayıt.
Özgənin ocağı yandırar səni.

Mən sənin dünyana gələndən bəri
Sən məndən vaz geçib çıxıb gedirsən.
Könülümü, qəlbimi verəndən bəri,
Sən onu ovcunda sıxıb gedirsən.

İndi sən uzağda, xəyalımdasan.
Ağlına gəlməyən varlığındayam.
Nə olar yaramı gəl oyma, gülüm
Məni sənsizlikdə çox qoyma gülüm.

Sübhün duasıyla oyan əzizim.
Səhərə salam de, günə salam de,
Bağçamda çiçək aç, boylan əzizim.
Bir mənə, birdə ki bağa salam de.

## İstəklərim

İstək dilənmədim həyatım boyu.
Onu qazanmaqsa qismətə bağlı.
Zorla gözəlliyə dəyər verməram
Sevgi qazanılır həyat yolunda.

Əllərim arzumun daş ətəyində,
Ümidim İnama uzalı qaldı.
Duyğusuz insanlar öz ətrafımda.
Mənim ümidlərim vaxtsız saraldı.

Heç kəs məni qıra bilməz bu yolda
Qururum, əqidəm tutarlı cavab.
Kimlər mane olsa bu yolda inan.
Özü haqq yolunda cəza alacaq
Sarıgül Yağmura imza qalacaq.

## Bəlkə də

İnsanlar cürbəcür, insanlar fərqli,
İnsan var ki, insanlığa gərəkdi,
İnsan da var imkansıza dəstəkdi,
İmkansıza əl də tutar bəlkə də.

İnsan var ki, arzusu saf özü saf,
İnsan da var əməli saf, sözü saf,
Özü boyda ürəyində var insaf,
Haqsızlıq görəndə solur bəlkə də.

İnsan var insançün vuran ürəkdi,
Insan da var dostçün güclü biləkdi.
Belə insanlar dünyaya gərəkdi,
İnsafsızlıq görsə ölər bəlkə də.

## Gəlir

Mən səni gül kim qəlbimə əkdim,
Bir körpə fidan tək qayğını çəkdim,
Amma qoruduqca qəhrini çəkdim.
Hər səhər şehini gözümə vurdun,
Sənli arzularla yuxudan durdum.

Olmadı çarəsi bu istəyimin,
Ayrılıq silahın üzımə çəkdi.
Nə qədər yalvardım, yanında durdum,
Sonuncu gülləsi üzümə dəydi.

Qayğılar o qədər sıxdı ki, məni,
Sətirlə, misralar uzağa düşür.
Sanki ağ vərəqlər xəstə yatağı
Qələm söz eşqindən yatağa düşür.

Nəbzimin səsinə oyandım bu gün,
Səssiz divarların sədası gəldi
Güzgüdə özümə baxanda gözüm
Sükutun pozulmaq nidası gəldi.

Qələmin ucunda nöqtə olanda,
Duyğuların izi vərəqdə qalda,
Sarıgül Yağmur hərdən fikrə dalanda.
Al götür qələmi sədası gəlir,
Nöqtələr sonunda nidası gəlir.

## Zaman bir an dayandı

Zamanın qəlbindən doğan bir güləm,
Baxmasan quruyub, solub gedərəm.
Mən sənin əlində ətirli bir gül,
Sən mənim qəlbimdə gur bir şəlalə.
Zaman bir anlığa dünən dayandı,
Alışdı ürəyim, bir anda yandı.
Dedim Allah bəlkə qəlbim dayandı.
Bəs necə dözəcək yazıq bu halə?

İllər gəlib keçdikcə,
Ömür yaşlanır hədər.

Hər bir diqqətsiz duyğudan,
Bürüyür məni kədər.
Amma bir an düşünürəm,
Axı mənsiz o nə edər,
Qədər, nə edək qədər.
Üzməsin məni bu qədər,
Lənət şeytana deyək,
Keçər gedər söyləyək.
Bir-birimizə dəyər verək,
Çalışaq ki, səbr edək,
Haqqın yoluyla gedək.

## Məni sevdiklərim yaşadır

Sevgi yollarında tənha qalmışam,
Ümidim bir sənədir böyük Allah.
Nə vaxtdır qəriblik qapımda möhür,
Sevinclə kədərim qoşadır vallah.

Çoxların gözündə mələk görmüşəm,
Onlardan sonunda kələk görmüşəm,
Çoxundasa cılız ürək görmüşəm,
Yaxşılıq da etsən boşadır vallah.

Bəxtimdən gileyli olmadım heç vaxt,
Naəlac qapılarda qalmadım heç vaxt,
Çətinliyi də boynuma almadım heç vaxt,
Nadana bu şuar boşadır vallah.

Bəzi sevməyənin gözü kor oldu,
Şan-şöhrətdən yerinə qor doldu.
Amma axırda olan ona oldu
Ümidim itirmədim mən vallah,
Çünki güvəncim sənədir Allah!

Bəzən hicran-həsrət mənə yar oldu,
Bu geniş dünya da mənə dar oldu.
Nə əkdimsə ondan şirin bar oldu.
Məni sevdiklərim yaşadır vallah,
Sarıgül Yağmur deyir Lailəhaillah!
Allah böyükdür Allah!
Ona sığınıram vallah!

**Söz-sözü çəkər**

Düz bax gözlərimə sözü düz danış,
Yalan eşidəndə qəlbindən alış,
Əyriyə əyri de, düzü düz danış,
Düzü düz axtar ki, düzü düz çəkər.

Hərdəndi bəzən yaxşı yamana tuş olur,
Ürək yanır, bəla çəkən baş olur,
Düz söz qanmazın başına daş olur.
Bunun ağrısını yenə baş çəkər.

Kədərə ağlayıb sevincə güldüm,
Hər zaman yaxşının qədrini bildim,
Zəifin hər zaman gözünü sildim,
Qəlbin ağrısını ağlar göz çəkər.

Vurğunu olmuşam qanan kəslərin,
Onlarla ünsiyyət dərindən dərin,
Qanmaz insanları qandırmaq çətin,
İnsan öz abrından xəcalət çəkər.

Ha deyirsən insan eyləmə qeybət,
Axır yetişəcək bir gün qiyamət.
Əməlinə görədir cəhənnəm, cənnət
Adətkərdə olan yenə söz çəkər.

Belə adətlərlə inan ət tökər.
Bu haliylə cəhənnəmdən köz çəkər.

Sarıgül Yağmur yazdım səhər bu şeri,
Dərin mənası var düşünsən xeyli,
İndi yazan çoxdu çoxalıb meyli,
Amma göz xəzinədir sərraf söz çəkər.

**Bilməzmiş**

Dedim unudub ataram səni,
Gördüm ki, sevənlər ata bilməzlər.
Rahatlıq axtardım yuxularımda,
Sən demə dərdlilər yata bilməzmiş.

İnsan müqəvvadır duyğusu yoxsa,
Ürək adi ətdir diləyi yoxsa,
Bir kəsin Tanrıdan köməyi yoxsa,
Heç bir arzusuna çata bilməzmiş.

Sarıgül qismətə nə etsin bəndə,
Günah nə səndədir, nə də ki, məndə
Tale üzə gülüb bəxt gətirəndə,
İnsan dəryada da bata bəlməzmiş.

**Yanındayam mən**

Məni başqa yerdə axtarma heç vaxt
Damarında axan qanındayam mən,
Səni qoruyuram mələklər kimi,
Çiyninə qonmuşam yanındayam mən.

Həyata keçirsə, arzun niyyətin,
Keçərli olursa sözün-söhbətin,

Daim qorunursa eldə hörmətin.
Demək ölməmişəm canındayam mən.

Sən eşit könlümün səsini dinlə,
Gəlmə sən üstümə dumanla çənlə,
Daim sevincini də sən böl mənlə,
Ruhumla, qəlbimlə yanındayam mən.

Sinəmdə çox deyilməmiş sözüm var,
Sevgi dolu atəşim var közüm var,
Sarıgül Yağmuram, hər yerdə izim var,
Bax nəfəs aldıqca yanındayam mən,
Ölsəm də ruhumla canındayam mən.

## Yuxularımı

Gözümə getməyən yuxularımı,
Sənə bağışlayım yat şirin-şirin,
Duyduqca bitməyən duyğularımı,
Sən ol, qat ruhuna qat şirin-şirin.

Hopum vücuduna, hopum qanına,
Keçim döyüntüylə, keçim canına,
Baharı keçirmiş qış ünvanına,
İsinsin birlikdə iki can bu dəm.

Unudaq ötüşsün bütün kədər-qəm,
Ovudum gözünün yaşı qurusun,
Silim yanağından yaşını sənin.
Donmuş bir ürəyin atəşiyəm mən,
Gəlmişəm əridəm buzunu sənin,
Gəlmişəm əridəm buzunu sənin.

## Ay Allah

Ay Allah ağrıyır mənim ürəyim,
Öyrəşə bilmirəm bu ayrılığa.
Niyə yarı yolda unutdu məni,
Mən dözə bilmirəm bu ayrılığa.

Nə idi günahım bilə bimirəm,
Niyə yarı yolda buraxdı məni,
Sən niyə rastıma çıxardın onu,
Bəs niyə qovuşmadan ayırdın məni.

Ay Allah sönməyən bir arzum budur,
Məni sevdiyimdə ayrı saxlama,
Qısqanclıq odunda alışır qəlbim,
Onu bu odlara salıb saxlama,
Allahım nə olar bitməsin bu eşq.
Mənim ayrılığa tabım yox daha.
Mənim çəkdiyimi çəkdirmə ona.
Artıq taqətim yox onsuz sabaha.

## İtən ümidlər

Gəl daha üzməyək ümidimizi,
Ümidi aparaq Allaha pənah.
Bəlkə qovuşdurdu yenə də bizi,
Mümkünsə çatdırın sevgimə soraq.

Hərdən zəng edərdi telefonuma,
İndisə ondan da yoxdu bir xəbər.
Deyərdi ki, hərdən yada sal məni,
Çünki təkcə sənsən qəlbimə qonaq.

Yoruldum bəlkə də bitməyib sonu,
Axı istəmirəm itirəm onu.

Bəlkə düşünməkdən mən yorulmuşam,
Qatıb bir birinə gecə-gündüzü.

Mən hardan biləydim itirsəm onu,
Həyatda qazancım dərd-qəm olacaq.
Mən necə biləydim qalan göz yaşı,
Birdə xatirələr dənizi qalacaq.
Bax bu dərd də məni yoracaq.

**Bilmədi**

Suallarla dolu bir həyatda yaşayırıq biz,
Nöqtələrlə, vergüllərlə davam edir işimiz.
Həyat davam edir bunu görürük,
Xoş nidalarla davam etsin deyirik.
Amma yenə olanları deyirik.

Sevgi dolu bu ömrü yaşamadıq, üzüldük,
Kədər dolu göz yaşımız çeşmə kimi süzüldü.
Gözümüzə tufan gəldi, duman, çiskin büründü
Üzüm güldü, ruhum isə gülmədi ki, gülmədi,
Bu duyğusal, gözəl ruhun hamı qədrin bilmədi.

Çox adama gəl inanma dedim mən.
İnanıb da çox bağlanma dedim mən.
Bax bu yolda töhməti də yedim mən.
Amma ruhum gülmədi ki, gülmədi.
Nadanlar da heç qədrimi bilmədi.

Uyub bu dünyanın dövlət varına,
Çoxu yiyə durmur düz ilqarına,
Sarıgül Yağmur gəl inanma insanların etibarına.
Bəlkə bu kəs üzünə də gülərlər,
Təbii verginin qədrin bilərlər.

## Ehtiyacım var

Minor ladda köklənmişəm, ay gülüm,
Mənim də zamana ehtiyacım var.
Gözləmədiyim yalnışı görəndə.
İnan ki, dağlar tək ağrım acım var.
Mənim də qayğıya ehtiyacım var.

Dərdimə çarədir ümid dənizi.
Onunla görünər bəxtimin izi.
Bəxtimdən gileyli deyiləm inan.
Amma ki, istərəm hey gülsün üzüm.
Çünki doğmalığa ehtiyacım var.

Payız yeli yarpaqları varaqlayır,
Daş ürəkdə çiçək bitməz, bitər çayır.
Kobudluqlardan yuva yanır cayır-cayır.
Kin uçurur dünyamızı, qalır bayır,
Ey insanlar, bir istəyə var ehtiyac.

## İnan

Rahatlığ tap gülüm, mənim sevgimlə,
Ümmanı yarıda qoymaram inan.
Özümü öldürrəm heç of demədən,
Yoxluğum olarsa dərdinə dərman,
Səninçün ölərəm sən buna inan.

Sən niyə küsürsən mənim sözümdən?
Qoymaram damcı yaş çıxa gözündən,
Nə eşitsən gəl bir soruş özümdən
Həmişə təbəssüm olsun üzündə.

Ümidlə yaşamaq gözəldir inan,
Qəlbinə dolmasın heç yersiz güman.

Həyata pozitiv baxmalı insan,
Ümidə söykənər qəlbdə istəklər.
Bax gör bu ürəkdə nələr var nələr?

Canımdan da əziz canımsan mənə,
Sənə olan duyğum bitməyəcəkdir,
Bir ömrü yenidən yaşasam belə,
Qəlbimdə tək yerin görünəcəkdir,
Sarıgül Yağmurun da üzü güləcəkdir.

## Arzular

Asılma qəlbimdən quru daş kimi,
Həyatı mənasız yaşayamam mən,
Canlandır, həyatı, canlı et ömrü,
Cansız bir qəfəsdə yaşayamam mən.
Bu sıxıntı yükün daşıyamam mən.

Niyə izləyirsən hər addım başı.
Damarında axan qanındayam mən.
Şerə dəyər verməz hər baxan naşı,
Sənsə diqqət versən canındayam mən,
Bir ömür, hər bir an yanındayam mən.

Qoy səndə yaşasın gözəl arzular
Arzudan qiymətli dünyada nə var?
Ürəkdə yaşarsa vəfa, ehtibar.
Bu sevgi yolunda odlanaram mən
Hər cür çətinliyə qatlanaram mən.

Bir arzum var ürəyimdə arzu olmaq isdəyirəm,
Əziz İradəyə qonaq olmaq isdəyirəm,
Çevrilib arzularına, sənli olmaq isdəyirəm,
Arzulardan arzulara əl ataydın yorulmadan.

Hər arzuya çatdıqca sən sənlə qalmaq isdəyirəm,
Əziz, gözəl İradəmdən ilham almaq isdəyirəm.

İstək xoş arzudur, arzu bir ümman,
Bitməyir ürəkdə ümman arzular.
Həyat çox qısadır, bilinmir zaman,
Tək sevgi yaşadır bizə xoş anlar,
Sarıgül bitməsin bu xoş arzular,
Arzudan da gözəl, yenə arzular,
Amma ki, tükənmir arzu dünyada.

**Niyə unutdun**

Sanma ki, asandı sevmək, sevilmək.
Bir gündə min dəfə bəlkə çaşırsan,
Bəzən bir nadanın baxışlarıyla,
Kibrit çöpü qədər ucuzlaşırsan.

Əzizim belədi həyatın hökmü,
Ürək gah sevinir, gah qəmlə dolur.
Bəzən böyük bir eşq dastanından
Kiçicik xatirə yadigar qalır.

Xəyalım qarışdı arzularıma,
Qəlbimdə tək sənin yerin var inan.
Ruhumu bəzədi şirin sözlərin,
Bircə xoş rəftarla sevinər insan.

Nə deyə bilərəm bu saf sevgiyə?
Ancaq qoşularam arzu selinə.
Allah ayırmasın kaş sevənləri,
Sevənin əlləri dəysin əlinə
O ılıq nəfəsi ipək telinə.

Deyirdin dözmərəm bircə an belə,
Deyirdin unuda bilmərəm səni,
Sevgimiz darıxar tənha qalanda,
Bəs niyə unutdun, unutdun mən?

## Unutmaq cətin

Sən ki, bu qərarı özün vermisən.
Bəs niyə unutmaq çətindi dedin?
Məni ürəyindən sildin demisən.
Bəs niyə bu qədər olubdur çətin.
Səni unutmaqcün olacam mətin.

Xal düşüb eşq adlı bu yuvamıza.
Artıq əğyar girib bax aramşza.
Gedirik baxmadan heç arxamıza.
Amma ki, unutmaq çətindən çətin.
Bax gərək bu dəfə olasan mətin.

Əl açıb Rəbbimdən səni istədim,
Dedi mələyini verməərəm sənə.
Dedim ki, vermirdin niyə tanıtdın?
Dedi bilmədiyin çox şey var hələ.
Bəzi məqamları gətirmə dilə.

## Asəf qədrimi bil

Baxışların hərarəti gözündə
Nəfəsinin rayihəsi sözündə
Bu qədər gözəllik bunun üzündə
İnan ki deməyə tapmıram kəlmə
Deyə bilmirəm ki day bizə gəlmə.

Görən kimin kələyidi bu həmlə,
İnan ki, qarşıda acizdi kəlmə.
Çalış ki, bax fırıldağa rast gəlmə,
Onda deməyə də tapılmaz kəlmə.
Düşün, canım ağıl, fikrini cəmlə.

Dastanlar da azlıq edər sevgidə.
Təmiz qəlblər saf duyğular bəsliyə.
Həttda ruhlar bir-birini səslər,
Boş-boş şübhələri sevgini zədələr.
Heç bir köməyə çatmaz, bu hədələr.

Məni yaşadan da, sağaldan da sən,
Yazdığlarım qəlbimdəndir biləsən.
Hərdən bir xatirinə dəyəndə,
Bu mövzudan Asəf yazım ki güləsən,
Sarıgül Yagmurun qədrin biləsən.

## Tapa bilmədim

İstədim dəyişəm xasiyyətimi,
Daxili dünyamdan qopa bilmədim.
Mən kimi qoydumsa insan yerinə
Qayıdıb yerində tapa bilmədim.

Bir gün səsim gəlsə lap uzaqlardan
Kövrəlmə, pis olma xatirla məni,
Əgər çıxıb getsəm mən buralardan,
Sevgimə sadiq ol, xatırla məni.

Bu eşqi mən özüm bitirməmişəm,
Min cürə bəhanə gətirməmişəm,
Əslində mən səni itirməmişəm.
Sən özün yalanla itirdin məni,
Yalan-dolanlarla bitirdin məni.

## Ürəklər açıram

Budur Allah vergisiyə ürəklər açıram.
Bu duyğu ilə bədbinlikdən də qaçıram.
Bəzi nadan, anlamaz sözündən uzaqlaşır.
Amma gözəl şeirlərimlə onlara atəş saçıram.

Nə olsun ki, xəstəlik var, şükür dərmanlı dərdlərdir.
Məni duyan, dəyər verən, dərmanlarımdı, fərdlərdir.
Əsas dərmanım isə sevdiyim şəxsiyyətlərdir.
Onlara həsr etdiyim şeirlərlə ürəklər açıram.
Bu özəl şeirlərimlə könüllərə nur saçıram.

Budur bax həyat yolum, ay məni duyanlar,
Məni duyaraq duyğuma qiymət qoyanlar,
Dünya yaradanın işidir buna içdən uyanlar.
Odur ki, daxili tələbimlə ürəklər açıram,
Qanmazların, şərindən, böhtanından qaçıram.

Mənə süni öyüd verənlər ki, özünü yormayacaq,
Bu ilahi vergisidi, özümü o yerə qoymayacam.
Bayquşa çevrilib öz yuvasında uyusun nadan
Çünki Sarıgül Yağmur şeirləriylə yenə ürəklər açacaq,
Bu mənəvi gözəlliklə tarixləşib nur saçacaq.

Çünki dünyada yollar yolcular çoxdur
Ən gözəli, müqəddəsi oxucu qəlbinə gedən yoldur
Bu yola çıxmaq üçün gərək qəlbləri duyasan
Hər kəsə diqqət edib arzu-istəyin qavrayasan
Sonra bu istəkləri poetik dillə vəsf edib
Ürək qanı ilə cilalayıb göz yaşı ilə suvarıb
Taleyin gözəl payı tək oxucuya qaytarasan.

## Xatirələr yaşadan qadın

Poetik dəryaya baş vurdu gəmim,
Onun yelkənidir yazan qələmim,
Sorağını alcaq azaldı qəmim,
Seyid Nigarinin izi var səndə,
O müqəddəslərdən yazanda coşuram mən də.

Poetik çiçək göndərirəm sərin küləkdən,
Ətri gözəl olsun güldən, çiçəkdən,
Təşəkkür edirəm sənə ürəkdən,
Mirsədi ağanı, Mirməhəmmədi yada saldığınçün,
O böyük övliyanın nəzərində olduğunçün.

Sorağın almışam Asəf həkimdən
Artıq qəlbimdəsən buna inan sən.
Yoxsa duyğu dolu belə bir şeir
Coşquyla gəlməzdi belə içimdən.
Səni vəsf edəcəm söz verirəm mən.

Əziz Məhəmmədinlə yaşa qoşa sən.
Gözəl niyyətinlə gəldin xoşa sən
Seyid Nigari-Mirhəmzə sevgi dastanıyla
Bir ömrü məhəbbətlə vur başa sən.

Zəhmət çəkib daim əmək verdiyin
Oğlun Teymur, Rəsul sənin qürurun.
Sığal çəkib gözəl saçın hördüyün
Qızın Ülviyyədir sənin uğurun.

Başın üstün alsın nəvə kölgəsi,
Məhəbbətlə daim gəlsin gur səsin.
Sarıgül Yağmurun eşit tövsiyyəsin.
Odur məhəbbət dastanını vəsf edən
Gözəl insanları tarixə həkk edən.

## Qəribəlik

Bax bu dünya da çox qəribədir
Gələndə gülümsə, gedəndə ağla
Səndən də heç gözüm su içməmişdi
Bu qədər göz yaşı gəlməz ağıla
Gülümsə gələndə, ağla gedəndə
Bu qədər göz yaşı hardadı məndə.

Nazınla oynadım hər darıxanda
Ürəyin istəyən vaxda görüşdün
Sən çıxanda ancaq başıma çıxdın
Düşəndə bəs niyə gözümdən düşdün?

Gözüm bir nöqtəyə baxır hər bir an,
Diqqət et gör hardan hara düşmüsən.
Ən uzun cümləyə sığmayan adın,
Kiçik son nöqtəyə sığa bilmisən.

Bir yol ayrıcına bənzərmi həyat,
Olmazmış həyatın üstündə əsmək
Cəsarət istərmiş, bir də ehtiyat,
Nə ləngimək olar, nə də tələsmək,
Olmazmış həyatın üstündə əsmək,
Sarıgül, olmazmış heç vaxt tələsmək.

## Olsun xəbərin

Mənə bu söz xoşdu səninəm desən,
Hər vaxt yanındayam məni səsləsən,
Necə sevdiyimi bilmək istəsən,
İnan ki sevgimin yoxdu qədəri.
Səni çox sevirəm, olsun xəbərin.

Bu yatmış ürəyi oyadan sənsən,
Bu gözəl istəyi yaradan sənsən,
Mənə bu həvəsi yaşadan sənsən.
Səni ilk gördüyüm o gündən bəri
Sənsən istəyimin ən şah əsəri.

Yuxumda görürəm gecələr səni,
Icimdən keçir ki zəng edim sənə.
Səsini eşitmək bəs edir mənə.
Bir səsli mesajin bəs edir yenə,
Hərdən bir səsini eşitdir mənə.

Nə mən tək qalım nə də ki, sən tək,
Bir ömür gəl olaq doğma tək dəstək.
Həmişə bir birimizlə xoş rəftatar edək,
Bu gözəl dünyanı birlikdə sevək.
Bu gözəl istəyin bəhrəsin görək.

## Yağış damlaları

Yağışın adını bilib, anlamırıq mənasını.
Ağlımız kəsb eləmir zərrə qədər itirəcək.
Göydən endirir yerə mələklər hər damlanı,
Torpağa can gətirir hər yağışın damlaları.

Ona ürəyimcə belə nəğmə yazdım,
Dərdimi, qaygiları naməmi ona yazdım,
Söz yazımla qarışıq naləmi ona yazdım.
Sonuncu misraya ad qoydum yağış damlaları.

Qoca dünya silə bilməz bu silinməz yazıdır,
Ruhuma nəm gətirən bax bu silinməz yazıdı,
Sənin ismin yazılıb bax bu silinməz yazıdı.
Silə bilməz əsla yağışın damlaları.

O yerdə ki olmuşduq sənlə tanış,
İndi o ev sahibindən də xatirə qalmış.
O yerdə ki ayrılmışdıq bax yenə də yağdı yağış,
İzimizə, xatirəmizə yenə də yağdı yağış,
Gəzdi o yerləri bax yenə də qarış-qarış.
Gəzdi, yudu izləri yenə də yağış damlaları.

## Xatirə

Bəzən söhbətləşirdik
Ağlımdakılarla gündüzlər.
Bəzən də danışırdım qəlbimdəkilərlə gecələr,
Baxın bax bu təzadlar neçə olar xatirə?

Bəzən onu düşünüb üzülsəm də hər şeylə,
Ondan yadigar deyə toxunmadığım hər şeyə,
Ayrılığın sonunda ondan yadigar deyə,
Bircə şəkil saxladım bu görüşdən xatirə.

## Könlüm

Təmiz dost sevgisi haqqın səsidi,
Taleyin insana hədiyyəsidir.
Qəlbə nə gəlirsə qismət səsidi.
Kaş dost xəyanəti görməyə könlüm.

Payız sərt olarsa, qış da gec gələr,
Ürək sevilməsə çətin üz gülər,
Yağmurun qədrini sevəni bilər,
Bunu qiymətsizə bildirmə könlüm.

Nadan adamlardan zərbələr aldım,
Ağlımla, zəkamla qələbə çaldım.
Bu gücü, qüdrəti Tanrıdan aldım,
İndisə imkan ver yaradım könlüm.

Bu sevda yolunda ocaq qalanmaz,
Laqeyidlik görəndə ruhum oyanmaz.
Duyğusuz insan da məhəbbət olmaz.
Boş sözə -söhbətə aldanma könlüm,
Sarıgül Yağmuru diqqətsiz sanma könlüm.

**Mənsiz**

Köç edər ömür karvanı,
Fani dünya olar mənsiz
Mənim vəfalı cananım
Həsrət çəkib ağlar mənsiz.

Mənim düyadan köçməyim
Dəyişməz dünyanın halın
Açar güllər, ötər bülbül
Köç edər durnalar mənsiz.

Doğmalar hər sabah məyus olarlar,
Hər günkü hal sorma yada düşəndə.
Amma ki, həyatdı öyrənəcəklər,
Telefon yaddaşı qalanda mənsiz.

Hərdən bir şerlər düşər yadına,
Oxuyanda közlər doluxar mənsiz.
Bağçada güllərlə danıçan olmaz,
Ordakı çiçəklər soluxar mənsiz.

Bu şeri dinləyib ağlayacaqsan,
Mənli xatirələr üzəcək səni.
Bəlkə də şəklimi qucaqlayərkən,
Kənardan incik ruh süzəcək səni.

Hərdən bir arada gözlərin dolar,
Mənli xatirələr düşər yadına.

Sən körpə olanda layla çaldığım,
Xoş avazlar səni salar oduna.

Unuda bilməzsən doğma ananı,
Ürəkdə, beynidə, canında qalar.
Quru xatirələr çatar dadına,
Hər "ana" sözündə yadına salar.

Kədərlənmə ay Sarıgül,
Köçüb getsən də dünyadan.
Yolunda əməyim olan,
Dar gündə köməyim olan,
Məni sevən, dəyər verən çoxdur insan.
Xatirəmi əziz tutar,
Məni yada salar mənsiz.

## Zamanın günahı yoxdur

Bu dünya kədərə, qüssəyə batıb,
Sanki yaxşılığı dənizə atıb.
İnsanların çoxu günaha batıb
Bəlkə də zamanın günahı çoxdur?
Niyə toxun acdan xəbəri yoxdur?

Deyək saf qəlbləri incitmə, insan.
Yoxsa ki, həyatdan gedəssən peşman.
Yalanlardan bezir təmizlər inan.
Sanıram zamanın günahı yoxdur.
Sadəcə yolun azan insanlar çoxdur.

Gəl, təmiz insan adına danışmayaq,
Kimdi bəs günahgar heç soruşmayaq,
Bəlkə pis işlərə də qarışmayaq.
Babal da yumayaq, şər danışmayaq,

Yalan danışıqlara baş qoşmayaq.
Çünki, bax zamanın günahı yoxdur,
Sadəcə pis insanlar artıb çoxdur.

Onda ver ürəyimi dağlar saxlasın,
Bülbüllər təzə gül bilib qoxlasın,
Həkimim də tez-tez gedib yoxlasın.
Qoymasın o küskün ürək dayana,
Haqsızlıqlardan bezərək o yana.
Sarıgül Yağmur səbr edərək dayana,
Artıq hər şeyi buraxa zamana.

## Mələklər də dərd çəkər

Sevgi incə hissdir, onu daşıyaq
Allah tərəfindən bir hədiyyədir.
İnsana yaraşan, layiqli olan
Adını ucaldan bir tərbiyədir.

Xəyanət son vaxtlar lap adiləşib,
Təzə paltar kimi düşübdür dəbə.
Odur ki, yenicə üsul tapıblar,
Bağışla, ürəyim, səhv olub demə.
İnsan aşiq olar gözləri gülər.
Saf, təmiz eşqini əmanət bilər.
Onun sevinciylə mələklər gülər.
Xəyanət görərsə göz yaşı tökər,
Mələklər də insanlardan dərd çəkər.

Sevgi gözəl hissdir sevənlər üçün,
Sevginin qədrini bilənlər üçün,
Sevəsən birini cani ürəkdən.
Diqqəti, qayğını ver bilərəkdən,
Sarıgül Yağmur alqış desin ürəkdən.

## Dərd yükü

Ey tale küləyi nədir günahım?
Dumandan götürüb çənə verirsən.
Deməli bu qədər dözümlüyəm ki,
Belə dərd yükünü mənə verirsən.
Atasız nəvələri mənə rəva görürsən?

Gecələri qaranlıq, gündüzləri ağ idim,
Bütün yaşam boyunca dərdlərdən uzaq idim,
Nadanlar sinəsinə bu yaşda da dağ idim.
Ey həyat, bunu ki, sən lap əvvəldən görmüsən.
Bəs niyə qanmazlara sevinc şansı vermisən?

Dünya indi belədi pullunun var ədası,
Gəlib yandan düz keçir maşınladı qadası,
Amma ki, taledi bu heç bilinməz sonrası.
Yolunu azanların çox pis gəlir sədası,
Böyüyü saymayanın əksik olmaz xətası.

Sarıgül Yağmur yenə ürəyini danlayır,
Bir körpə uşaq kimi hər dəqiqə ağlayır,
Ramonumun həssaslığı ürəyimi dağlayır,
Amma ki, inamım var Tanrıya ümid bağlayır.
Gələcəyi xoş olsun mənim balalarımın,
Tanrı dayağı olsun mənim doğmalarımın.

## Qəriblik

Ayrılıq adına yazmışam əsər,
Ömrümü bu yolda etmişəm çəpər,
Doğmalardan daim çəkmişəm qəhər.
Odur ki Sarıgül Yağmur olmuşam,
Qəriblik yüküylə yaşa dolmuşam.

## Bu sənin dünyandı

Bu mənim dünyamdı – dedin vətənə,
Sən özün Vətənsən, Vətən sənindi.
Demədin sözünü yoldan ötənə,
Ağlayan sənindi, gülən sənindi.

Sevgi ilə oxşadın sən öz dünyanı,
Zamanla qazandın sən öz Payını.
İtirmək olarmı haqqı, sayını,
Bu sənin dünyandı, sənin dünyandı.

Sevgi ilə bəslədin balalarını,
Onlarla qazandın dünyalarını.
Asəflə yaratdın xoş anlarını,
Bu sənin dünyandı, sənin dünyandı.

Görmüsən dünyanın çılğın üzünü,
Görmüsən əyrisin, gördün düzünü.
Sözünlə qırmısan düşmən gözünü,
Bu sənin dünyandı, sənin dünyandı.

Yazmısan dünyanın hər bir üzündən,
Hər bir çiçəyindən, hər bir gülündən.
Yazmısan, bu sözü çıxıb dilindən,
Bu sənin dünyandı, sənin dünyandı.
*19.10.2016. Tərtər, Əskipara,*
*Kazımov Şahin*

# Siz mənə dəyər verən dəyərli insanlarsınız



# VƏTƏNİNƏ SARILIB VƏTƏNİNİ SEVƏNLƏR

*– "İnsan mənəviyyat üçün yaşamalıdır.*
*– Mənəviyyatını qoruyan, yaşadan insan əbədi olacaqdır.*

*– İnsan müəyyən zaman və məkanda dünyaya gəlir. Bu onun qismətidir.*

*O, ya öz taleyi, qisməti ilə barışmalı və mühitə, onun işıqlanma dərəcəsinə uyğunlaşmalı, ya da mühiti dəyişdirmək kimi çətin bir yola qədəm qoymalıdır ki, bu yolda ancaq daxildən gələn işıqla aydınlaşa bilər. Mühitə qarşı dayana biləcək, ona alternativ ola biləcək yeganə mənbə insanın daxili potensialı və mənəvi alımidir"*

*S.Xəlilov.*



*Sarıgül Paşaqızı Yağmur*

Bu baxımdan Ulu Tanrının bəxş etdiyi tale qismətinə sığınaraq çətin, lakin şərəfli bir ömür yolu keçmiş insanlardan biri də Əliyeva Sarıgül paşa qızıdır. O, Azərbaycanın dilbər guşələrindən birində Qubadlı rayonunun Böynəkər kəndində müəllim ailəsində dünyaya göz açmışdır. Orta təhsilini Qubadlı orta məktəbində almışdır. O illəri xatırlayan Sarıgül xanım deyir:

– Böyük Vətən müharibəsindən sonra çox qızlarımızın uzun illər gözləri

yollarda (bəlkə də ömürlərinin sonuna kimi) qalmışdır. Lakin mərdlikdə, qeyrətdə ad qazanan, o torpağın oğulları çoxlarına həyan olub, çətin günləri birlikdə adladaraq arxada qoymuşlar. Düzünü deyim ki, o vaxtlar bütün müəllim ailələri kimi mənim atam da cüzi əmək haqqı alırdı. Buna baxmayaraq onu tanıyanlar yaxşı bilirlər ki, Paşa müəllim mükəmməl bilik və bacarığa malik, həm də təmənnasız insan olmuşdur. O, çörəyini namus və qeyrətlə qazanmışdır. Bəlkə də onun müəllimliyə yaraşan xarakter və xüsusiyyətləri də məni müəllim olmağa sövq etmişdir. Qürurlu olmağımı çox sevdiyim Hərtiz dağından, coşqulu olmağımı Bərgüşad çayından, saflığımı isə bumbuz saf bulaqlarımızdan almışam. O yerlərdən uzun müddət aralıda da oraları qəlbimdə sevərək yaşatmışam. Düzü erməni daşnaqlarının o müqəddəs torpaqları zəbt etməsilə barışa bilmirəm. O elin bir övladı, bir balası kimi bu həsrət dolu nisgili yaşamaq mənə çox çətindir. Lakin bununla bağlı möhtərəm prezdentimiz İlham Əliyev cənablarının atdığı inamlı addımları mənə ümid verir deyim ki, yaxın gələcəkdə işğal olunmuş torpaqlarımız azad olunacaqdır.

V.İ.Lenin adına (indiki Nəsrəddin Tusi)Azərbaycan Pedaqoji institunu bitirən Sarıgül xanım həyat yoldaşının həkim işlədiyi Naftalan şəhərinə gəlir.

Sonralar respublika qəzetlərindən biri yazırdı: “Naftalan şəhər orta məktəbinin pedaqoji kollektivində gənc və gözəl bir qadın da görünməyə başladı. Gəldiyi ilk gündən hamının diqqətini cəlb edən bu qadın təyinatla işləməyə gəlmiş dil-ədəbiyyat müəllimi Sarıgül müəllimə idi...”

Sarıgül müəllimənin pedaqoji qabiliyyəti, mehribanlığı, həm də səmimiyyəti müəllim və şagird kollektivi ilə ünsiyyət bacarığı tezliklə özünü göstərir. Hamının sevimlisinə çevrilmiş, bu müqəddəs peşənin daşıyıcısı Təhsil İşçiləri həmkarlar İttifaqı Komitəsinin sədri direktor müavini vəzifəsinə təyin olunur.Pedaqoji sahədə qabiliyyətinə görə 1983-cü ildə SSRİ Maarif Nazirliyinin Fəxri Fərmanı ilə təltif olunur. 1987-ci ildə Naftalan

şəhər Maarifində inspektor vəzifəsinə irəli çəkilən Sarıgül müəllimənin gərgin əməyi, bilik və bacarığı şəhər ictimaiyyətinin və rəhbərliyin nəzərindən qaçmır. 1991-ci ildə Şəhər Maarif inspektorluğu şöbəyə çevriləndə o, şöbə müdiri vəzifəsinə təyin olunur. Sarıgül Əliyevanın təşəbbüsü ilə şəhərdə yeni 422 yerlik məktəb binasının tikintisi Təhsil Nazirliyinin planına salınır.

Sarıgül xanımın ailəsinin xeyirxahlığı haqqında "Xocalının Səsi" qəzeti 1992-ci ildə yazırdı: "Sarıgül və Asəf Əliyevlə ailəsi Naftalan şəhərində xeyirxah bir ailə kimi tanınır. Bu həqiqətən də belədir. Vətənpərvər ailə Azərbaycan İqtisadiyyat İnstutunda təhsil alan oğulları, indi Goranboy Özünü Müdafiə Batalyonunun döyüşçüsü olan Zaurun xeyir işi üçün illərlə topladıqları vəsaiti yaranmaqda olan Azərbaycanın Milli Ordusunun fonduna köçürüblər."

Başqa bir vaxtda"Naftalan" qəzetinin 1 iyun 1997-ci il tarixli 116 saylı "Uğurlar diləyirik" adlı bi məqalədə həssas, qayğıkeş, bacarıqlı, mehriban və xeyirxah bir insan olan Sarıgül müəllimənin ictimai və pedaqoji fəaliyyətinin 25 ili və Şəhər Təhsil Şöbəsinə rəhbərliyinin 10 illiyi münasibətilə onun həyat və yaradıcılığı ilə bağlı pedaqoji kollektivlərdə çalışan başqa-başqa insanların ürək sözləri qeyd olunmuşdur.

– İlqar Əsgərov (Təhsil şöbəsində Metodik Mərkəzin direktoru):

– 5 ildir ki, Sarıgül müəllimə ilə birlikdə işləyirik.

Onun bacarıqlı bir idarə rəhbəri, gözəl müəllim, qayğıkeş və mehriban bir insan kimi tanıyır, şəxsiyyətinə dərin hörmət bəsləyirəm.

– Gülgəz Bazyaru (Şəhər 1 saylı orta məktəbin müəllimi) :

– Mən Sarıgül müəlliməni orta məktəb illərindən tanıyıram. O, bizə Azərbaycan dili və ədəbiyyat fənnini tədris edirdi. Sarıgül müəllimə yüksək ixtisaslı, savadlı pedaqoq olmaqla bərabər həm də bacarıqlı rəhbərdir. Onun səyi və bacarığı sayəsində məktəbimizin sorağı çox uzaqlardan gəlir.

İllər ötsə də xoş xatirələrdi.

Sarıgül müəllimənin ictimai fəaliyyəti də çoxcəhətli və zəngin olmuşdur. 1994-cü ilin 3-4 oktyabr hadisələri və Azərbaycanda ictimai-siyasi vəziyyətə həsr olunmuş ümummilli liderimiz Heydər Əliyevin rəhbərliyi ilə keçirilən ümumrespublika toplantısının iştirakçısı olmuş, Azərbaycan qadıları məclisinin konfransına, "Ehtiyat əmək qüvvələri" idman cəmiyyətinin qurultaylarına nümayəndə, "Sevil" qadınlar cəmiyyətinə sədr, Türk Litseylər birliyinə üzv seçilmişdir. Heydər Əliyev Fondunun üzvüdür. 1995-ci ildən isə YAP-ın sıralarında fəaliyyətdədir. O, hal-hazırda "Ailə və Uşaq" problemləri üzrə dövlət komitəsinin Naftalan şəhəri üzrə təşkilatının sədridir.

Bütün bunlara baxmayaraq Azərbaycan dövlətinə və onun rəhbərliyinə sədaqətlə xidmət edir, yenə də Naftalan şəhəri və respublikanın qaynar həyatında yaxından iştirak edir və öz dəyərli məsləhətlərini yerində verir.Gördüyü işlər və respublikada gedən proseslərlə bağlı soruşanda deyir:

– Şəhərin ictimai həyatında fəal mövqeyimi qoruyuram. Çünki, 2 dəfə YAP-ın, 3 dəfə müəllimlərin, 2 dəfə qadınların qurultaylarında, 2 dəfə isə gənclərin forumunda dünya şöhrətli Ümumilli liderimiz Heydər Əliyevlə görüşmüşəm. Bu görüş mənim həyata daha sıx bağlanmağıma, o cümlədən duyğusal olmağıma səbəb oldu. Respublikamızın indiki inkişafında da seyirici qalmıram.İstər təbliğat və çıxışlarımla, istərsə də şəhər əhalisi ilə görüşlərimdə də bu yüksəlişi, inkişafı, onun köklərini və stimul verənləri ardıcıl qeyd edirəm.

Həvəskar şairə kimi yazdığım şerlərimdə hər bir qoru atəş olan Heydər Əliyev ocağından çıxan hər bir közün isə bir günəş olacağını qeyd edirəm. Çünki o işığı, o şəfəqi görürəm. Və o işığı, o istini duyuram. O, işıqdan, o, şəfəqdən də həyat yoldaşım Asəf Əliyev də, mən də yaşadığımız Naftalan şəhəri də öz bəhrəsini görür.Şəhərimiz gündən-günə inkişaf edir, gözəlləşir. Yeni-yeni iş yerləri açılır. Gənclərimiz işlə təmin olunur. Naftalan şəhəri indi unikal Naftalan nefti ilə ümumdünya mövqeyi qazanmışdır. Bütün bunların cənab prezdentimiz İlham

Əliyevin və Heydər Əliyev fondunun prezidenti, öz zəkası ilə xalqa, onun mədəniyyətinə, musiqisinə, tarixinə dəyər verən lider xanım Mehriban Əliyevanın təşəbbüsü və səyi nəticəsində yüksək zirvələrə çatacağına inanırıq. Son illərdə Naftalan kurort şəhərinin inkişafına verilən dəyər və diqqət bütün sakinlər kimi mənim də ümid və sevinc mənbəyimə çevrilib, gələcəyə ümidimizi artırıb. Bütün bunlara görə dövlətimizə, cənab prezidentimizə minəttdaram.

"Qurani Kərim" də bir hədisdə deyildiyi kimi:

"Hikmət verilən insanın xeyir bərəkəti də çox olar".

Əlbətdə ki, Sarıgül müəllimənin həyatı, onun keçməkeşli həyat yolları hər bir gəncə bir örnək və bir təsəllidir. Deyərdim ki, belə insanlar bizim cəmiyyətimiz üçün bir qənimətdir. Onları qoruyub-saxlamaq və dəyərləndirmək hər birimizin borcudur. İnanıram ki, bundan sonra Sarıgül xanım öz həyat fəaliyyəti ilə dövlətimizin və dövlətçiliyimizin qorunub saxlanması və inkişafında öz dəyərli töhfələrini verəcəkdir. Ona bu çətin lakin şərəfli yolda uzun ömür, can sağlığı və firavan həyat arzulayırıq.

***Qələmə aldı: İş adamı Hacı Asif Qubadlı***
*16 noyabr 2011-ci il № 18*
*"Yeganə yol" beynəlxalq ictimai,*
*siyasi, hüquqi, əbədi-bədii qəzet.*

# İŞİN İNSAN HƏYATINDA ÖNƏMİ

***Asəf Rəsul oğlu Əliyev. Həkim.***

***İnsanlar həyata dair bir çox sahədə seçim edərək həyatlarına istiqamət verirlər. Edilən seçimlərin hamısı insanın həyatına müxtəlif dərəcədə təsir edir. Müəyyən bir yaşa qədər qərarlar böyüklər tərəfindən verilir. Ancaq zaman keçdikcə insan özü müstəqil qərarlar verməyə üstünlük verir.***



Hər kecən gün inkişaf edən və dəyişən dünyamızda insanların ehtiyacları da dəyişir. Bu ehtiyacları yüksək səviyyədə təmin etmək üçün yeni texnologiyalar və həyata uyğun peşə sahələri meydana gəlir. Yalnız bir şey olduğu kimi qalmaq məcburiyyətində yox qalması məsləhət edilən və tövsiyyə görülən peşədir. Mühitimizdə yalnız səmimilik, uzaqgörənlik, sağlamlıqla, sakitlikdə yaşamaq üçün məsləhət verən bir ailicənab olur. Bu yaşadığımız mühitdə, mahalda, rayonda, kənndə ortaq məxrəcə gəlmək üçün dünyagörüşlü, məsləhət yeri seçilən insan ziyalı olma-

sı önəm daşıyır. Hər savadlı oxumuş olmaq ziyalı dünyagörüşlü olmaq demək deyil. Amma bu genetik xarakterli ola bilər.

Bu geniş təfərrüatlı məqaləmdə sizlərə 1946-cı ildə Qərbi Azərbaycanının Zəngəzur mahalının Sisian rayonunun Sofulu kəndind ə müəllim ailəsind dünyaya göz açmış Əliyev Asəf Rəsul oğlundan söhbət açmaq istəyirəm. Məqalənin əvvəlində giriş sözü verdiyim bir çümlədə dünyagörüşlü dedim. Bu söz sadəcə dünyanı gəzib-dolaşmaq deyil. Dünyagörüşlü deyildikdə yəni yaşadığı mühitin insanlarının fərqli, bir-birindən seçilən xasiyyətləri olmasına baxmayaraq onları ümumiləşdirən bir kəlam arada sakitliyə, mehribançılığa gətirib çıxarırsa, deməli məsləhət verən insanın geniş zəkası, dərin düşüncəsi vardır.A.Əliyev də məhz elə bir ailənin övladı olmuş, ailəsindən gələn bu tərbiyə ilə böyümüş, başqalarına örnək olmuş, bu günlük gündə də öz dəyərli məsləhətləri ilə çoxlarına sağlıqlı həyat bəxş etmiş şərəfli peşə sahibi olan həkimlərimizdəndir.

Asəf Əliyev doğulduğu kənddə yeddillik məktəbi oxuduqdan sonra Dəstəyurdda orta məktəbini bitirib tam orta təhsil alır. 1964-cü ildə N.Nərmanov adına Azərbaycan Dövlət Tibb İnstitutuna qəbul olur və müalicə profilaktika fakultəsini müvəffəqiyyətlə başa vurur. Tələbə olduğu vaxtlarda Asəf Əliyev qrupda Komsomol Təşkilatının katibi olmuş, insitutun ictimai işlərində fəal iştirak etmişdir. İnstitutu bitirdikdən sonra təyinatı üzrə Naftalan sanatoriyasında ilk əmək fəaliyyətinə başlamış, təcrübəli həkim kimi öz uğurlu peşəsini davam etdirmişdir. İşlədiyi dövrlərdə daim mətbuat səhifələrində yazıları, məqalələri, tibbi məsləhətləri ilə çıxışlarına görə dəfələrlə həmkarlar şurasının mükafatlarını, fəxri diplomlarına layiq görülmüşdür. 1982-ci ildə yeni fəaliyyətə başlayan “Çinar“ sanatoriyasında şöbə müdiri, sonralar “Mil” sanatoriyasnda baş həkim, 2006-cı ildə isə “Şəfa” sanatoriyasında baş həkim işləmişdir.A.Əliyevin hələ gənc kadr olmasına baxmayaraq onun xüsusi bacarıqlı həkin olmasına görə bir çox məsuliyyətli işlərin öhdəsindən bacarıqla gəldiyinə görə, Şərəfli peşəsiylə daha daŞözünə hörmət

qazanmış və ona olan etimadlar yüksəlmişdir. Bu kimi nailiyyətlərinə görə Naftalan şəhər Sovetinin deputatı olmuşdur. 1992-ci illərdə doğma həmvətənlilərinə məcburi köçkünlük yaşayanlara dəstək olmuş, maddi-mənəvi köməklik göstərmişdir.

Asəf həkimlə görüşən hər bir kəs onu çox ciddi, zahirən tünd xasiyyətli görməklərinə baxmayaraq sonradan onunla nə söhbəti olanda onun xasiyyətinə bələd olanda bir insanın daxili aləmini kəşf etmiş olrlar. Asəf həkimlə söhbət zamanı o qeyd etdi ki, insanın gördüyü yox, bildiyi hiss etdiyi, bacarığı sahədə işləməsindən söz açaraq qeyd etdi ki insanın həyatının bir hissəsinə təhsil müddəti, sonrakı mərhələsinə də iş həyatı təsir edir.Çünki təhsil müddətini başa vurduqdan sonra insan iş həyatına atılır. Bu iş onun bacarığı sayəsində olmalıdır ki, o bu işin öhdəsindən bacarıqla gəlsin.Çünki yaşayırıq ki, gələcəyi yaradaq, yaşayırıq ki, yaşayanları yaşamağa sövq edək. Hamı adam alim, professor, müəllim, həkim, mühəndis olmaz ki.Sənət peşə seçimində diqqətli olmaq lazımdır ki, həyatımızı doğru düzgün, halal yaşayaq.

İnsanlar işləyərək öz həyatlarını qazanırlar, zirvələrə yüksəlirlər. Hər bir insanın öz məqsədlərini, ideyalarını, arzu və istəklərini həyata keçirmək üçün yaxşı bir işə ehtiyaçı var. Mən müəllim ailəsində anadan olmuşam. Biz belə görmüşük ki, oxumaq, savadlı olmaq üçün yox, bacardığın, qabiliyyətin olduğu peşəni seçməliyik.Bunu da ki, insan yalnız özü öz istiqamətini seçər, valideyin də ona təhsilində yardımçı olar.Orta təhsil zamanı müəllimlər şagirdlərdə bu bacarığı, istedadı tez hiss edirlər.

Söhbət əsnasında Həkim Asəf Əliyev onu da qeyd etdi ki, indi koryera da seçim əsas tələblərdən biridir.İş insanın özünü tanımasına yardımçı olur. Buna dörə də özünüzə peşə seçərkən çox diqqətli olmalısınız. Çünki insanın karyera, iş qurması üçün peşə (ixtisas) seçiminin böyük rolu var. Hər bir peşədən daha məsuliyyətli həkim peşəsidir. Burda saxtalıq, savadsızlıq insan həyatına məsuliyyət deməkdir. Heç kimi həyatı sığorta

etmir amma həkim bir insan ömrünü uzada, sağlam yaşada bilmək qabiliyyətinə malik olur.

Hər bir gənc seçim barədə qərar verməzdən əvvəl ixtisasın mahiyyətini dərk etməli, onu yaxşı-yaxşı təhlil etməli, bütün cəhətləri əvvəlcədən nəzərə almalıdır.Lakin təcrübə göstərir ki, ali təhsil müəssisələrinə qəbula hazırlaşanların heç də hamısı bakalavr ixtisaslarının mahiyyəti haqqında tam və aydın təsəvvürə malik olmur və təəssüf ki, bir çox hallarda kortəbii seçim edirlər.Bütün bunlara nail olmaq üçün səhiyyə işçilərinin nəzərinə böyük vəzifələr düşür Həkimlər, səhiyyə işçiləri, o cümlədən uşaq həkimləri çox şərəfli peşənin sahibləridir. Cəmiyyətdə həkim peşəsi ən möhtəbər, ən hörmətli peşədir. Özünü həkimlik, təbiblik peşəsinə həsr edən insanlar xoşbəxt insanlardır. Çünki cəmiyyətin onlara həmişə böyük ehtiyacı var. Eyni zamanda həkimlər hər yerdə mehribanlıq, sülh əmin-amanlıq yaradan insanlardır. Onlar insanların sağlamlığı yolunda çalışırlar. Həkimlər öz peşələrinə görə qan tökülməsini, hərbi münaqişə olmasını istəmirlər. Ona görə də həkimlərin, səhiyyə işçilərinin fəaliyyəti həm cəmiyyətimizin sağlamlığı, səhhəti naminə, həm də insanlar arasında sülh, əmin amanlıq yaradılması üçün çox əhəmiyyətli və dəyərlidir.

Həkimlik peşəsi öz xalqına, sənətinə yüksək sədaqət tələb edən bir işdir. Heç bir peşədə Hippokrat andı kimi and yoxdur. Hippokrat andı içən hər bir həkim o anda sona qədər sadiq olmalıdır. Mən ümid edirəm ki, Azərbaycanın səhiyyə işçiləri, həkimləri xüsusən indi, müstəqil Azərbaycanda öz peşələrinə sahib olaraq Hippokrat andını həmişə yadda saxlamalıdırlar, heç vaxt unutmamalıdırlar.

Şəfa mənbəyi kimi Naftalan sanatoriyasında müalicə üçün bir çox suallarımıza cavab olaraq həkimimiz onu da qeyd etdi ki, Naftalanda bir çox müalicə üsulları var. Bildiyimiz, bilmədiyimiz profilaktik müalicə üsulları, bir çox xəstəliklərin təbii yolla müalicəsi və bacarıqlı həkimlərimizin, tibb işçilərimizin qayğıları fəaliyyət göstərir. Naftalan nefti respublikamızın ən

qiymətli təbii sərvətlərindən biridir.

Ta qədimdən indiyə kimi saysız-hesabsız xəstə bu neftin şəfaverici keyfiyyətindən bəhrələnmişdir. Müalicəvi xəstələrə malik olan Naftalan nefti sümük-oynaq, dəri, qadın xəstəliklərindən və uroloji xəstəliklər, əsəb, genikoloji, uroloji və dəri xəstəliklərinin, eləcə də qara ciyər xəstəliklərinin, oynaqların və dayaq hərəkət aparatına aid olan oynaqdan kənar yumşaq toxumaların müalicəsi üçün müstəsna vasitə kimi bütün dünyada məşhurdur. Elə buna görə respublikamızın şəhər və rayonlarından hər il çoxlu sayda xəstə bura pənah gətirir. Həmçinin Naftalan nefti güclü iltihabəleyhi, ağrıkəsici, allergiyaəleyhi və hormona- bənzər təsirlərə malikdir. Trofik və mübadilə proseslərini stimulə edir, ovogenezi və spermatogenezi surətləndirir.Bu müalicəvi xususiyyətlərinə görə naftalan nefti ilə 70-dən artıq xəstəliyin müvəffəqiyyətli müalicəsi mümkündür.

Söhbətimiz əsnasında Asəf həkimlə onun ömür-gün yoldaşı gözəl xanım, səmimi, mehriban insan Sarıgül Paşaqızı maraqlı fikirlərilə həkimimizin xüsusi qabiliyyətlərindən söz açdı.Sargül xanım ömrünün çox illərini təhsilə həsr edib, bədii yaradıcılıqla məşğul olub, poetik fikirlərilə Asəf həkimə yardımçı olub. Təbiəti, insanlar, gözəllikləri, yaxşılıqları görüb, gözəllikləri duyub qələmə alan Sargül xanım həyat yoldaşına sözün əsl mənasında həyatda ən yaxın yoldaş, dost, həmfikir olub və bu gündə həyat yolunda birgə addımlayırlar.Yaxşılıqlar içində yaşayan bu səmimi, gözəl ailənin övladları da ali təhsili, bacarıqlı mütəxəsisdirlər. Sargül xanım onu da qeyd etdi ki, insanlar arasında müəyyən fikirlər eyni olmasa da, insanın şüur və şüuraltı fikirlərini dərk etmək hər insana nəsib olmur.Məhz Asəf həkim ilk növbədə güclü psixoloqdur. O xəstələrinin əvvəlcə düşüncəsini öyrənir, hətta səhətlərində ağır problemlər olmasına baxmayaraq, ona yeni həyat bəxş edir, elə əsası da həkimin ən başlıca bacarığı xəstənin psixologiyasını bilməkdir. Bu kimi xüsusiyyətlərinə görə daxilən, zahirən vurğunu olduğu insana, ömür yoldaşı Asəf həkimə həsr etdiyi şerləri də bizim üçün maraqla

oxudu.

Asəf Əliyev həm də müasir dövrümüzdə bir çox xəstəliklərin məhz qidalardan yaranmasını qeyd etdi ki, xəstəliklərin əmələ gəlməsində qidalanmanın böyük rolu var. Obrazlı desək, demək olar ki, bütün xəstəliklər ağızdan keçir. Vaxtlı-vaxtıda yemirik, sulu qidaları az qəbul edirik. Mən özüm ilk növbədə işlədiyim şəfa ocağında, "Şəfa" sanatoriyasında xəstələrimə iynə-dərmandan əvvəl düzgün qidalanmağı, xüsusən də sulu yeməklər yeməyi məsləhət görürəm.Yediyimiz yeməklərin miqdarını, yemək vaxtını nəzarətdə saxlamalıyıq.Gün ərzində az-az, ancaq tez-tez qida qəbul etməliyik.Qızarılmış, hisə verilmiş qidalardan uzaq olmalıyıq. Bol miqdarda meyvə-tərəvəz, süd məhsulları yeməyə üstünlük verməliyik. Ən əsas isə sağlam həyat ilk növbədə ailədəki, mikromühitdəki müsbət ab-hava ilə bağlıdır.Ailə üzvləri arasında mehribançılıq olduqda, bu insanların sağlamlığına da yaxşı təsir göstərir. İkincisi daim aktiv həyat tərzi sürmək lazımdır. Alkoqollu içkilərdən, siqaretdən və digər zərərli vərdişlərdən, çox yağlı çox şirin qidalardan uzaq olmaq lazımdır. Həyat tərzini yaxşılaşdırmaq üçün mütəmadi şəkildə piyada gəzməli, işlə məşğul olmalıyıq.

Əziz oxucular, bu hər zaman sağlamlığımızın keşiyində dayanan həkimlərimizə minnətdarıq. Onu da qeyd edim ki, belə bir deyim var ki, insan öz-özünün həkimi olmalıdır. Biz həyatımızı sağlam yaşamaq üçün bizi narahat edən problemlərə sağlam baxışla da qalib gələ bilərik. Əqidəmiz düz, qürurumuz şux, qəddimiz əyilməz olsun. Biz gərək bir-birimizi qoruyaq, çalışaq ki, yaxınlarımızla, dostlarımızla, ailə üzvlərimizlə daha çox ünsiyyətdə olaq.Çünki ünsiyyət stressi aradan qaldırır. Yaxşılıq etməyi bacarmalıyıq, kin saxlamamalıyıq. Bu da bizim ömrümüzü uzadar. Ümumiyyətlə, unutmamalıyıq ki, cavanlığımızı necə keçirməyimiz bizim gələcək sağlamlıq durumumuzdan xəbər verir. Təbiətin verdiyi nemətlərdən düzgün istifadə edək, təbii müalicələrimizə daha çox üstünlük verək, sağlam yaşamaq üçün sağlamlığımızın qayğısına qalaq.

# YAZIÇI PUBLİSİST ŞAİR GERMAN ƏLİ OĞLU HÜSEYNOV




Qarabağ dərdi hər bir Azərbaycanlının həyatının ayrılmaz bir hissəsidir. Hər birimizin qəlbimizdə Qarabağ qanı qurumayan bir yaradır və illərdir ki, qaysaq bağlamır. Mən də Qarabağlıyam, Qubadlı rayonunda doğulmuşam. Lakin ömrümün çox az hissəsini yaşamışam. Qubadlıda. Düzdür, doğma Qarabağın dilbər guşələrini gəzib, dolaşmışam, Şuşada, Laçında, Kəlbəcərdə, Ağdamda olmuşam, amma kifayət qədər yox. Vətənin gözəlliklərinə göz dolusu baxmamışam.1967-ci ildə Qubadlının Boynəkər kəndində orta məktəbi bitirdikdən sonra Bakıda Pedoqoji instituta daxil olmuşam. Tələbəlik illəri başa çatmamış Sisyandan olan Asəf adlı gənc bir həkimlə ailə qurmuşuq və təyinatla Naftalan şəhərinə işləməyə gəlmişik.Ailə qayğıları, bir-birinin ardınca dünyaya gələn üç körpəmiz, iş-güc başımızı elə qatdı ki, Sisiyana, Qubadlıya çox gec-gec gedə bilirdik. Bütün bunları ona görə deyirəm ki, oxucu bilsin ki, onsuz da ürəyimdəki Qarabağ həsrəti onun işğalından sonra dərdə, ağrıya, vulkan kimi od pükürən bir yanğıya çevrilib içimdə... Və bu alovun üstünə Germanın şerləri bir az da benzinmi tökdü deyim?Yoxsa sumu səpdi deyim?Bilmirəm, elə hər ikisindən var deyəsən.

Böyük qızım Arzu Naftalanda musiqi məktəbində müəllimə işləyir. Səyyarə xanım adlı bir rəfiqəsi var. Bir yerdə işləyirlər. Bir gün bir kitab gətirdi mənə.Germanın kitabı idi.”Sən mənim əbədi məhəbbətimsən”. Kitabın adı və tərtibatı çox xoşuma gəldi.Kitab xəstəsi olduğumdan dərhal açıb, oxumağa başladım. Elə ilk sətirlərdən düşdüm Germanın təsiri altına.Kitabı əlimdən yerə qoya bilmirdim, şerlər sanki qollarımdan yapışıb, məni buraxmırdı.

Ağaclar baş əyərək Tanrıya iman gətirir,
Bəni-adəmsə azıb, dininə güman gətirir.

Allahın hökmü ilə şər qarışır, axşam olur,
Gecə şeh düşsə əgər, sübh çağı duman gətirir...

Bu nədi, ay Allah? Belə də şer olar?Adamın ürəyinin özəyinə dəyir. Bütün mövzularda gözəl yazır German. Hələ bir bu şer parçasına baxın.

Bir gün bu dünyada olmayacağam,
Onda biləcəksən mənsizlik nədir.
Mən necə anladım, ay gülüm, sənə,
Bu sənli dünyada sənsizlik nədir?

Hər şeri oxuduqca havalanırdım sanki.Dönüb, Səyyarə xanımdan soruşdum:

– Sağdı bu adam?

O da cavabında gülümsəyib, dedi:

Hə, əlbəttə, sağdı.Uşaqlıq dostumdu, məndən də bir yaş kiçikdir, Bakıda yaşayır.

Səyyarənin: – Məndən kiçikdir, – sözləri mənə inandırıcı görünmədi. Çünki bu cürə kamil, müdrik şerləri yazan adamın ən azı yüz yaşı olmalıydı.

Ölüm gəlir qətrə-qətrə, gilə-gilə,
Ölüm gəli üzümüzə gülə-gülə,
Bu dünyanın faniliyin bilə-bilə,
Niyə axı unuduruq biz Allahı?!

Səyyarə xanım adına yazılmış bu kitabın içində avtoqrafın altında müəllifin telefon nömrəsi vardı.Zəng etdim, tanış olduq. Söhbətləşdik. Səsi adamın ruhuna bir sakitlik gətirirdi. Sonra onun kitabını oxuduqca yenə zənglər etdim və aramızda qiyabi olsa da səmimi bir dostluq yarandı....Və günlərin bir günü German Naftalana-bizə gəldi.Gözlərimə inanmırdım, özümə yer tapa bilmirdim. İnanın səmimiyyətimə, bu insan gözümdə o qədər böyük idi ki, onu belə yaxından görəcəyimə, üz-üzə, göz-gözə oturub, söhbət edəcəyimə inanmırdım. Amma o, bizim evimizə gəlmişdi. Əlim-ayağım yerə dəymirdi.Evdə nə varsa hamısını masanın üstünə yığırdım. German ayağa qalxıb, qabağıma keçdi, şirin Qarabağ ləhcəsiylə dedi:

– Ay bajı, bir dayan görək.Nədi, nooluf, ajdıxdan çıxan var? Gəl otu, görək.

Həmin gün xeyli söhbətləşdik.Sadəliyi, səmimiliyi ilə, icindəki sevgilərin böyüklüyü ilə ürəyimi fəth elədi, daha çox sevdim onu.Balam kimi, qardaşım kimi. Doğmalaşdı mənə. Elə bildim ki, bu insanı ağlım kəsəndən tanıyıram.Ailəmizin bir üzvü bildim onu.Təbiətən sakit adam olan həyat yoldaşım Asəfin də qəlbinə çox tez yol tapdı German. Bir neçə saat bir neçə dəqiqə kimi keçdi.Durub, getmək istəyəndə gözlərim gözlərim doldu. Elə bildim ən əziz adamımı uzaq səfərə yola salıram.Söz verdi ki, yenə gələcək.Sonra yenə görüşdük. Bizdə də, Bakıda-Germangildə də.Daha da doğmalaşdıq.Balalarım, nəvələrim də çox istədilər Germanı.

Bir dəfə Germanın öz ifasında şerlərini dinləyirdik. Adətən şerə laqeyd qulaq asan Asəf doktor (həyat yoldaşım) indi çox maraqla dinləyirdi. Şeir başa çatanda Asəf dönüb, maşın gedə-gedə Germanın alnından öpdü.Mən təəccübümdən donmuş-

dum. Düzü doktordan bu hərəkəti gözləmirdim.Sonra geriyə qanrılıb, tam ciddi tərzdə mənə dedi:

– Belə yazarlar ey şeri.

Doğrudan da belə yazarlar də şeri.

German növbəti kitabına mənim də haqqımda geniş bir yazı daxil etmişdi. Bir neçə şerimi də əlavə eləmişdi yazıya. Sevincimin həddi-hüdudu yox idi. Sonra mənim kitablarım çapa hazırlananda Germanın çöx köməyi dəydi mənə. Hətta “Bu mənim dünyamdır” adlı kitabımın redaktoru da German oldu. Çox əziyyət çəkdi. Üz qabığının nəfis tərtibatı da Germanın ideyaları əsasında oldu.

Germanın hər kəsin qəlbində özünəməxsus yeri var.Amma onu hamı üçün ümumiləşdirən ən böyük xüsusiyyətləri sadəliyi, səmimiliyi, vətənpərvərliyi və insanlara sevgisi, qayğıkeşliyidir. Həm də çox diqqətcildir.Hərdən adama elə gəlir ki, o səni dinləmir, öz aləmindədir. Bir azdan həmin söhbətlə bağlı öz münasibətini bildirir. Ya da hansısa bir işin həlli barədə söhbət gedirsə, heç bir münasibət bildirmir. Düşümürsən ki, bu mövzu ona maraqlı deyil.Aradan bir-iki saat və ya bir-iki gün keçəndən sonra bir də görürsən zəng edib, deyir ki, filan nömrəyə zəng elə, get işini gör. Bir də Germanın ən yaxşı xüsusiyyətlərindən biri də söz-söhbətdən, qeybətdən, dedi-qodudan uzaq olmasıdır. Heç sevmir belə şeyləri. Yanında da bir kimsə qeybət qıra bilməz.Bir iti baxışı bəs edir ki, söhbət kəsilsin.

Germanın dünyagörüşü, zəngin mütaliəsi, böyük söz ehtiyatı və istənilən məqamda söhbəti yumşalda bilmək bacarığı onu maraqlı həmsöhbət edir, sevdirir, arzulanan edir. Mən Germana-çoxsevdiyim bu insana can sağlığı, uzun ömür, ailəsi, uşaqları, nəvələri, dostları və sevdiyi insanlarla birgə sevincli günlər arzulayıram.

## Vətənə gedək

*(German Əli oğlu Hüseynov*
*Yazıçı publisist şair)*

Aldım məktubunu, Sarıgül xanım,
Donmuşdu damarda, qaynadı qanım,
Sənə qurban olsun bu qərib canım,
Gəl tutaq əl-ələ, Vətənə gedək,
Gedib, Qarabağı ziyarət edək.

Qarabağ deyəndə gözlərim dolur,
Könlümü səngiməz çən, duman alır,
Çəmənim saralır, çiçəyim solur,
Gəl tutaq əl-ələ, Vətənə gedək,
Gedib, Qarabağı ziyarət edək.

Qarabağ vüqarım, dinim, imanım,
Qarabağ beşiyim, məzarım, canım,
Qarabağ məhv olmuş şöhrətim, şanım,
Gəl tutaq əl-ələ, Vətənə gedək,
Gedib, Qarabağı ziyarət edək.

Qırxqızda, Murova ayaq izim var,
Laçında, Şuşada şerim, sözüm var,
Ağdam həsrətilə ağlar gözüm var,
Gəl tutaq əl-ələ, Vətənə gedək,
Gedib, Qarabağı ziyarət edək.

Bacım, o yerləri görməmisən sən,
Bir şehli çəmənə girməmisən sən,
“Xarı bülbül”ünü dərməmisən sən,
Gəl tutaq əl-ələ, Vətənə gedək,
Gedib, Qarabağı ziyarət edək.

Qubadlı, Zəngilan, Kəlbəcər, Şuşa,
Cəbrayıl, Füzuli dayanıb qoşa,
Ağdam nə müddətdir gəlməyir cuşa,
Gəl tutaq əl-ələ, Vətənə gedək,
Gedib, Qarabağı ziyarət edək.

Xankəndi, Ağdərə, qədim Əsgəran,
Nə vaxtdır əsirdir, aman, əlaman,
Xocavənd boğulur, deyir:-qana qan,
Gəl tutaq əl-ələ, Vətənə gedək,
Gedib, Qarabağı ziyarət edək.

Ot basıb yolları, gedib-gələn yox,
Qan-yaş ələyirəm, gözüm silən yox,
Dərdim dağ əridir, guya bilən yox,
Gəl tutaq əl-ələ, Vətənə gedək,
Gedib, Qarabağı ziyarət edək.

Bəsdir bu ah-nalə, ay German yetər,
Bir gün bu qəm-kədər, bu həsrət bitər,
Yurd yeri gül açar, bülbüllər ötər,
Gəl tutaq əl-ələ, Vətənə gedək,
Gedib, Qarabağı ziyarət edək.

# EL RUHUNDA YAZIB-YARADAN SƏNƏTKAR



*Əsgərov Pirqaz Teymur oğlu (Pirqaz Teymur) 1937-ci ildə Coranboy rayonunun Tapqaraqoyunlu kəndində anadan olmuşdur. El şairi Bisavad Teymurun ikinci oğludur.*

*1964-cü ildə Gəncə Dövlət Pedaqoji İnstitutunu bitirmişdir. Ömrünü bütünlüklə müəllimlik peşəsinə həsr etmişdir. Tapqaraqoyunlu kənd orta məktəbində əvvəlcə pioner baş dəstə rəhbəri, sonra işə təşkilat işləri üzrə direktor müavini vəzifəsində çalışmışdır.*

*Nəsildən, kökdən gələn ədəbi istedad Pirqaz müəllimin də həyatında sirayət etmiş, şeirə, sənətə həvəsləndirmişdir. O da gənc yaşlarından şeirlər yazmağa başlamışdır. Gənclik illərinin hiss-həyəcanını şeirin dili ilə ifadə etməyə çalışmışdır. Pirqaz Teymur belə desək şair olmağı xüsusi məqsəd kimi qarşısına qoymamışdır. Ancaq əgər dəhnə varsa və ondan su sızırsa onu harasa yönəltmək lazımdır. Bu mənada Pirqaz Teymur da əqlindən, ilhamından gələn bu poetik duyğuları şeirə çevirmişdir. Hazırda onun müxtəlif mövzulara həsr etdiyi yüzlərlə şeirləri vardır.*

**Şair Pirkaz Teymur oğlundan şairə Sarıgül Paşa qızına**

Bu dünyanın nazıynan çox oynadıq
İndi qocalırıq Sarıgül xanım
Həyatdan zövq aldıq, yenə doymadıq
Qədrini bilmədik o xoş zamanım
Yenə də şükr edək Sarıgül xanım.

Fitri istedadın anasısan sən,
Şeir aləminin dühasısan sən.
Həyat yoldaşının sonasısan sən.
Odur illər boyu halına yananın.
Yenə də şükr edək Sarıgül xanım.

Ömrünü keçirdin vəzifələrdə
Xalqa gərək oldun xeyirdə, şərdə
Təmiz ad qazandın kənddə, şəhərdə
Yayılar hər yana şöhrətin şanın Sarıgül xanım.

Şeirli, qəzəlli şirin sözlüsən,
Həm xoş təbəssümlü, gülər üzlüsən,
Qohuma, qonşuya çox dəyərlisən,
İnsana sevgisi budur insanın, Sarıgül xanım.

Gördüyümü yazıram, tərifləmirəm,
Dərin şairəsən yaxşı bilirəm,
Şerini oxuyub zövqə gəlirəm,
Vahid şairəsisən elin, obanın Sarıgül xanım.

Sən çəkmisən əziyyətin hər işin
Unutmusan ləzzətini keçmişin,
Dövrəsində fırlanırsan atmışın,
Uyma hiyləsinə fani dünyanın Sarıgül xanım.

Pirkaz Teymur dərk eyləyir həyatı,
Hey yazsa da şeir, qəzəl, bayatı,
Vaxt gələcək minəcəkdir dür atı,
Mərmər dama döyüləcək ünvanı Sarıgül xanım.

## Şair Pirkaz Teymur oğlundan şairə Sarıgül Paşa qızına

Gəncliyin maraqlı, qamətin bəstə
Uzun hörüklərlə coşqun həvəsdə
Adın Sarıgülsə, gül dər bir dəstə
Ağ gül, qırmızı gül, ya da Sarıgül.

Gözəl zəmanədə doğulmusan sən,
Sən təkcə indi yox, həmişə gözəlsən,
Ağarmayan saçın deyir ki, gəncsən,
Ad-sanın var el-obada Sarıgül.

Şairəsən söz sinəndə kök salıb,
Dəyərilə nəşriyyatda yer alıb,
Belə-belə söz xəzinən ucalıb,
Sən layiqsən bax bu ada Sarıgül.

Özündən uca tut Asəf həkimi,
Odur xəstələrin ümid həkimi,
Hər yerdə tanınır şəfakeş kimi,
Dar məqamda yetir dada Sarıgül.

Qoşa yaşa şirin arzularınla,
Feyziyab ol payızınla, yazınla,
Ömür yoldaşınla, oğul, qızınla,
Xoşbəxt yaşa bu dünyada Sarıgül.

Ağlı olan nadanlardan dərs almaz,
Mərd atını minən yolda yorulmaz,
Pirkaz Teymur dost-tanışı unutmaz,
Dünya yanıb gül olsa da Sarıgül.

# TƏRTƏR RAYONU ƏSKİPARA KƏNDİ SƏNƏTƏ DƏYƏR VERƏN SƏNƏT ADAMI, HƏVƏSKAR ŞAİR ŞAHİN KAZIMOV




Hörmətli xanım Sarıgül Yağmur, sizinlə təsadüf tanışlıq şərəfinə nail oldum, ikimiz də eyni ideallı insan olduğumuza görə çox sevinirəm və sevinirəm ki, sizin kimi şairə bir xanımın şeirlərini bir söz adamı kimi məclislərdə və hardasa deməyi özümə borc bilirəm.

Hörmətlə sizin oxucu fanatınız sənətkar, poeziya sevər Şahin Kazımov. Tərtər rayonu Əskipara kəndi.

## Gəlmişəm

Sizə salam olsun ey gözəl insan
Evinizə gülə-gülə gəlmişəm.
Şeir yazıb oxumağın canısan
Evinizə bilə-bilə gəlmişəm.

Məsləhətlər vermək yaraşır sizə
Məsləhətin bəhrə verməzmi bizə
Sarıgül Yağmurla durub üz-üzə
Xoş ətirli gızılgülə gəlmişəm.

Naftalan diyarın möcüzə odlu
Gəlmişəm yanına sinəsi dolu
Sevinə-sevinə bu uzun yolu
Keşmə-keşli neçə günə gəlmişəm.

Mən qiymət verirəm şeirə sənətə
Kim qiymət verməzsə çatmaz şöhrətə
Söz sahibin yadigarı sənətə
Şahin deyir bu duyğuyla gəlmişəm.

## Sairə Sarıgül xanıma həsr edirəm,
## Sarıgül Xanım

Həyatın ecazkar xanımın gördüm,
Ağılı kamalı başında gördüm,
Ali işlərində yaşında gördüm,
Sözlər xəzinəsi Sarıgül xanım.

Bu qoca dünyamız varaqlar səni,
İzinə düşənlər soraqlar səni,
Tale ulduzları daraqlar səni,
Yoluna nur saçar Sarıgül xanım.

Dostluqda qığılcım, sədaqətə bax,
Mərdlikdə qeyrətdə, ləyaqətə bax,
Asəf həkim kimi səadətə bax,
Bəxtəvər olasan Sarıgül xanım.

Qubadlı torpağı bəsləyib səni,
Naftalan diyarı səsləyib səni,
Tərtərli Şahin də dəstəkləyib səni,
Bu şerin öz gülü Sarıgül xanım.

***Tərtər Əskipara Kazımov Şahin***
***Yazdım 09.10.2016***



*Jurnalist Alim Nəbioğlu yaxın dostu, Azərbaycan estradasının ulduzu, İctimai televiziyanın «Bakı vaxtı ilə» verilişinin aparıcısı, «Sibir çiçəyi» bioqrafik romanın müəllifi, müğənni Roza Zərgərli ilə*

## Dəyərli insan

*(Jurnalist-publisist, «Xətai», «M.Araz», «Sənətinin fatehi», «İlin incəsənət yazarı», «M.İbrahimov», «Vətən torpaqlarının azadlığı uğrunda» mükafatların laureatı, 27 kitab müəllifi, «Oxu məni» qəzetinin mədəniyyət yazarı, «Dünya» TV-nin «Bu sabah» verilişinin prodüsseri Alim Nəbioğluya)*

Biz günləri sayırıq, günlər ömürdən gedir,
İlahi qismətidir, nə edirsə o edir.
Belə bir qismət yazdı bizə Ulu Yaradan,
Mətbəədə rastlaşdıq o çıxanda qapıdan,
Söylədiyim şeirimi bəyənmişdi o insan,
Deməli, bu qisməti yazdı Ulu Yaradan.

Hər bir şəxsin qavramı, öz daxili dəngi var,
Hər bir insan səsinin də qəlb oxşayan rəngi var.
Alim Nəbioğlunun çox doğma ahəngi var,
Ona qulaq asanda ruhlar rahatlıq tapır.
Səsinin bu sehri də qəlbə su kimi axır.

Qləbində ilahi eşq insan qəlbi alandı,
Qarşımda onu gördüm, sandım doğma balamdı.
Yaratdığı xoş aura, inan, yadda qalandı,
Verilişləri maraqlı, həm də könül alandı.
Alim Nəbioğlu fenomeni tarixlərə calandı.

Dünya gözəlləşdi gözümdə mənim,
Mənalı söhbətin, sözün də mənim,
Ay Alim, ucaldın gözümdə mənim,
Allahım qorusun səni nəzərdən,
Sən də elə, günə nəzər sal hərdən.

Tarixi yaddaşa nəzər salırsan,
Yaddan çıxanları yada salırsan.
Sən bu xidmətinlə yadda qalırsan,
Allahım qorusun səni nəzərdən,
Sən də unudulmuşları yada sal hərdən.

Başın üstün alsın nəvə kölgəsi,
Məhəbbətlə gəlsin daim gur səsin.
Sən bu şairənin eşit tövsiyəsin,
Alim bəy, qoru özünü həmişə,
Çünki insanlığı seçmisən peşə.

Zəhmət çəkib daim əmək verirsən,
İnsanların qəlb evini görürsən.
Diqqət və qayğıdan çələng hörürsən,
Qoy Tanrım qorusun xətadan səni,
Sən də əməlinlə bəzə Vətəni.

Ay Alim, uzaqdan əsən yeləm mən,
Gözəllik aşiqi bir bülbüləm mən,
Səninlə fəxr edən Sarıgüləm mən,
İstədim bu şeiri də kitabıma salam,
Özüm də bu işimdən razı qalam,
Ay əziz balam, alınmaz qalam,
Ay Alim balam!

*11.11.2016*



*Şairənin müəllim kimi ilk fəaliyyətə başladığı il*



*Şairənin Təhsil şöbəsi müdiri təyin olunduğu il.*
*Şəhərin rəhbərləri və tarixləşən şəxsiyyətlərlə xatirə anı*




*Şəhər tədbirində*



*Zəngi liseyi. Nəvəm Abduləzizin «Son zəng» tədbirində. Litseyin direktoru Hacı Bayram müəllim və direktor müavini Rəfiyyə xanım Sarıgül xanımla birlikdə*



Xalqımızın dəyərli oğlu Germanla tədbirdə




*Doğmalarım, əzizilərim*



*Nigar xanım, Reyhan xanım, Orxan və Xanım şairə ilə birlikdə*




*Nəvəm Abduləzizin ad günündə. Göygöldə.*




*Qardaş balası əziz Nicatla*




*Doğmalarla xeyir işdə*



Əzizim Ramoş



Hörmətli Nadir bəy və Rahilə xanım doğmaları ilə birlikdə



*Fazilǝm, Tahirim*



*Sǝn mǝnim döyünǝn ürǝyimsǝn*



*Doğma Azərbaycanın dəyərli sənət adamları*



*Çingiz Mehdipur, Eldar bəy, Dilarə xanım və Mehran şairənin dəyər verdiyi Təbriz şəhərinin fəxri sənət adamları*

# MÜNDƏRİCAT

*Vətən müqəddəsdir*



*Duyğu pıçıltıları, könül səsləri*

***Özümü axtarıram, dünya pəncərəsindən***

***Siz mənə dəyər verən dəyərli insanlarsınız***

**Sarıgül Paşaqızı Yağmur**

**«Duyğu kahkəşanı»**

**Bakı, «MBM», 2016, 336 səh.**

Naşir: Afər Fəttahova
Bədii redaktor: Vüqar Sadayev
Fotoqraf: Sabit Tağıyev
Dizaynerlər: İradə Əhmədova, Mirabdulla Babayev
Operator: Tərlan Quliyeva

---

Yığılmağa verilib: 01.10.2016
Çapa imzalanıb: 22.11.2016
Ofset çap üsulu ilə
Tiraj 200, şərti çap vərəqi 21
Kitab "MBM" nəşriyyat-poliqrafiya
mətbəəsində çap olunmuşdur.
Bakı, Mətbuat pr., 529
Tel.: (99412) 539-75-06